**ZƏLİMXAN YAQUB**

# HÜSEYN SARAÇLI DASTANI

*(dastan-roman)*




**BAKI – 2007**

Kitabın nəşrinə göstərdiyi dəstəyə görə "Qaraqaya" assosiasiyasının prezidenti **Sədrəddin Daşdəmirova** təşəkkürümüzü bildiririk.

Redaktoru: *Rövşən Nəsiboğlu*

Zəlimxan Yaqub. **Hüseyn Saraçlı dastanı** (*dastan-roman*). Bakı: Pedaqogika, 2007. - 227 səh.

Bu orijinal əsər yalnız Borçalı aşıq məktəbinin deyil, ümumiyyətlə, Azərbaycan aşıq sənətinin ən böyük simalarından biri – Aşıq Hüseyn Saraçlının maraqlı həyatından, zəngin yaradıcılığından, sahib olduğu yüksək dəyərlərdən və digər sənətkarlarımızla səmimi əlaqələrindən bəhs edir.

Z $\frac{4700000000 — 087}{057 — 07}$ Qrifli nəşr

## Xalq yazıçısı Elçinin Zəlimxan Yaquba açıq məktubu

(*ön söz əvəzi*)

***Əzizim Zəlimxan!***

*"Hüseyn Saraçlı dastanı"nın mənə göndərdiyin əlyazmasını get-gedə artan bir maraq və həvəslə oxudum və səni ciddi (həm də prinsipial!) yaradıcılıq uğuru münasibətilə ürəkdən təbrik edirəm!*

*Mən nə üçün bu əsəri ciddi (və prinsipial!) yaradıcılıq uğuru hesab edirəm?*

*Çox qısaca, ona görə ki:*

*1. Azərbaycan ədəbiyyatından şairlərin də, nasirlərin də, hətta sovet dönəmi "oçerk ustaları"nın da bəzən "dastan" adlandırdıqları bir çox nümunələr olmasına baxmayaraq, "dastan" yalnız folklorumuzun janrı olaraq qalırdı. Yazılı ədəbiyyatımızdakı həmin nümunələrin janrının müəlliflər tərəfindən "dastan" kimi müəyyənləşdirilməsi tamam şərti səciyyə daşıyırdı, bəzən də yalançı "xəlqiliyin" ifadəsi olurdu.*

*Sənin bu əsərin isə, mənə görə, yazılı ədəbiyyatımızda "milli janr"ın yaranmasına səbəb olacaqdır. "Milli janr" ifadəsi, bəlkə də, bir az qəribə səslənir, ancaq bizim mədəniyyətimizin digər sahələrində, misal üçün, musiqimizdə yaranmış "muğam-opera", "qəzəl-romans", "muğam-simfoniya" kimi məhz "milli janr"lar, elə bilirəm ki, bu termini tam mənada əsaslandırır.*

*Bu baxımdan mən sənin dastanını ədəbiyyatımızda ciddi hadisə hesab edirəm və şübhə etmirəm ki, sənin açdığın bu cığır ədəbiyyatımızın güclü (və məxsusi!) qollarından birinə, milli faktoruna çevriləcəkdir.*

*2. "Hüseyn Saraçlı dastanı" bir daha sübut edir ki, milli ədəbiyyatın zənginliyi onun müxtəlifliyindədir və Azərbaycan ədəbiyyatı bu baxımdan çox əlamətdardır.*

*Uzağa getməyək, XX əsrin əvvəlləri və Sabir–Hadi–Cavid. Yalnız elə bu adları eşitmək kifayətdir ki, gözümüzün qarşısında tamam müxtəlif, bir-birindən seçilən, rəngarəng, eyni zamanda böyük sənətdən xəbər verən poetik mənzərə yaransın.*

*Yaxud əsrin ikinci yarısı və misal üçün, Əli Kərim–Hüseyn Arif–Məmməd Araz kimi tamam fərqli bədii-estetik özünüifadə sahibləri. Onların hər birinin bizim poeziyamızda öz fərdi siması vardır, ancaq onlar və onların digər istedadlı həmkarları yalnız bir yerdə, bir bədii-estetik küll halında Azərbaycan poeziyasının simasını müəyyənləşdirir.*

*Yaxud elə sənin mənsub olduğun ədəbi nəslin nümayəndələrini götürək: bir tərəfdə sənin poetik özünüifadən, o biri tərəfdə isə, yenə də misal üçün, Ramiz Rövşənin poeziyası, bir başqa tərəfdə Vaqif Bayatlı Odər, o birində Vaqif Bəhmənli, bir başqasında da Adil Mirseyid...*

*Bu "tərəflər" mənim üçün qətiyyən bir-birinə qarşı deyillər, əksinə, onlar bir-birini tamamlayır və biz müasir poeziyada nə əldə etmişiksə, onu da ortaya qoyur.*

*3. "Hüseyn Saraçlı dastanı"nın dili – həm nəsrində, həm də şerində – mənim içimə həqiqətən bir fəxarət gətirdi: nə gözəl, nə incə, nə zəngin dilimiz var!*

*Bu cəhəti mən xüsusi qeyd edirəm, çünki bu gün ana dilimiz mətbuatda da, televiziya kanallarında da, "bədii ədəbiyyat" adı ilə oxucuya təqdim edilən çoxsaylı makula-*

*turada da elə biabırçı vəziyyətə salınıb ki, bəzən, özündən asılı olmayaraq, əməlli-başlı səksəkəyə düşürsən, elə həmin biabırçı vəziyyət səbəbkarlarının təbiri ilə desək, "şok stress" keçirirsən: dil əldən gedir!..*

*Ancaq "Hüseyn Saraçlı dastanı" kimi əsərləri oxuyandan sonra təskinlik tapırsan: bizim elə bir dilimiz var ki, heç zaman "əldən gedə" bilməz, heç bir qüvvə, heç bir naşı qələmi və kəlməsi onu sarsıda bilməz.*

*Sənin sənətkar qələmin dilimizin qadirliyini yalnız əyani şəkildə göstərmir, həm də bu qadirliyi sübut edir və içimizdəki həmin ağır "səksəkə" hissiyyatını dağıdır. Əsərin dilindəki zəngin lüğət tərkibi, sintaksisin təbiiliyi, sözlərin hər bir çalarlarından yerində və dəqiq istifadə etmək bacarığı, onların obrazlaşdırılması və bütün bunlarla bərabər, bədii təsvir vasitələrinin estetik siqlət sanbalı "Hüseyn Saraçlı dastanı"nın və ümumiyyətlə, müasir ədəbiyyatımızın çox ciddi nailiyyətidir.*

*4. "Hüseyn Saraçlı dastanı"nda folklordan birbaşa sitatlar yoxdur, ancaq mən bu əsərdə həqiqi mənada folklorla nəfəs almaq hadisəsi müşahidə etdim.*

*Folklorla nəfəs almaq – mənim aləmimdə xalqın güzəranına, məişətinə, etnoqrafiyasına dərindən bələd olmaq və bunları öz içində yaşatmaq, həmin xalqın dilini, psixologiyasını ən incə məqamlarına, ən zərif çalarlarınacan mənimsəmək, hiss etmək deməkdir.*

*Bu, "Hüseyn Saraçlı dastanı"nın elə bir xüsusiyyətidir ki, onu kitab, elm, nəzəriyyə vasitəsilə əldə etmək mümkün deyil, o, necə deyərlər, qanla gəlməlidir, çünki yalnız bu zaman fərdi istedadın təbii tərkib hissəsinə, üzvi bir atributuna (genetik atributuna!) çevrilə bilər.*

*Eyni zamanda, bu dastan folklorumuzun yaradıcılıq axtarışları üçün nə qədər münbit bir zəmin yaratdığını da bir daha açıq-aşkar göstərməkdədir və bu cəhət də, elə bi-*

*lirəm ki, sənin "Dastan"ının (tədqiqat əsərinin yox, bədii əsərin!) yaratdığı əhəmiyyətli qənaətlərdən biridir.*

*Qısaca, bu qədər.*

*Səni, əziz qələm dostum Zəlimxan, yeni yaradıcılıq qələbəsinə qədəm qoymağın münasibətilə bir daha ürəkdən təbrik edirəm.*

***Hörmətlə, ELÇİN,***
*6 yanvar 2007,*
*Bakı*

"525-ci qəzet",
20 yanvar 2007-ci il

# HÜSEYN SARAÇLI DASTANI

*(Dastan-roman)*

*USTADNAMƏ*

Körpə vaxtı bir beşiyə sığarsan,
Cavan vaxtı dünya sənə dar gələr.
Bivəfadı, bel bağlama ömrə sən,
Aylar keçər, qış yetirər, qar gələr.

Əyilməyə qoymayasan işini,
Sındırasan ehtiyacın dişini,
Nizam olmaq tez ucaldar kişini,
Hardan gəlsə əllərində var gələr.

Qılınc ensə, qalxan olmaz hər sinə,
Oğulsansa çətin günə gər sinə,
Ay Zəlimxan, iş dönəndə tərsinə,
Nə dost çatar, nə imdada yar gələr.

Atınız yüyrək, baxtınız yeyrək olsun!

Nə vaxta arxalan, nə baxta aldan,
Nə dövran, nə də bir çağ vəfalıymış.
Min bir daşürəkli dostdan, tanışdan
Bir daşlı, qayalı dağ vəfalıymış.

Nə toxa bel bağla, nə aca söykən,
Nə ada, şöhrətə, nə taca söykən,
Özün böyütdüyün ağaca söykən,
Bağbandan min dəfə bağ vəfalıymış.

Zəlimxan dilində min dürlü dastan,
Gah toydan söz açır, gah da ki yasdan.
Bahalı köynəkdən, əlvan libasdan,
Kəfən etibarlı, ağ vəfalıymış.

Ustadlar ustadnaməni iki deməz, üç deyər, biz də deyək üç olsun, dərdləriniz puç olsun, qurbanınız qoç olsun!

Dostum, gileylənmə yaddan, yaxından,
Əzəldən belədir: hamı bir olmur.
Hər kəsin evinin öz qibləsi var,
Çırağı bir olmur, şamı bir olmur.

Həyat dövr eləyir hər axşam, səhər,
Bir günü bal olur, bir günü zəhər,
Birində sevinc var, birində qəhər,
Hər günün ləzzəti, tamı bir olmur.

Zəlimxan söyləsin, bil yavaş-yavaş,
Bir yerdə olarmı ayaq ilə baş?
Birində toz-torpaq, birində daş-qaş,
Həyatın sarayı, damı bir olmur.

Bəli, sizə hardan xəbər verim, kimdən deyim, qarapapaqların at oynatdığı, ozanların oxuduğu, qopuzların, toppuzların dindiyi, telli sazın dil-dil ötdüyü qədim Borçalı mahalından, Saraçlı kəndindən. Saraçlı kəndində kimdən? Aşıq Hüseyn Saraçlıdan.

Günlərin bir günündə qara başımı qara sazın sinəsinə söykəyib, zilini zil, bəmini bəm, sinəmə müstəcəm eləyib Hüseyn Saraçlının çaldığı qədim saz havalarını şirin-şirin, asta-asta çalıb-oxumağa başladım. "Məmmədbağırı", "Sultanı", "Mixəyi", "Quba Kərəmi", "Dol hicranı", "Kərəmköçdü" havaları bir-birini əvəz edirdi.

Başımın üstündə Allahım, ruhumda, yaddaşımda yalnız Aşıq Hüseynin özü və sözü, ruhu və səsi varıydı. Onun xəyalıyla o qədər çaldım, oxudum ki, əlimi saz apardı, dilimi söz. Sərin bir yorğunluq çökdü canıma. Nə vaxt yuxuya getdiyimi bilmədim. Deyəsən bu yuxu o yuxudan deyildi. Ləlıni Kərəmə qovuşduran Tanrının Hüseyn Saraçlını da Zəlimxana qovuşduran gecəsiydi.

Yuxuya gedən kimi Hüseyn Saraçlını başımın üstündə gördüm. Həmişəki kimi ulu ozan görkəmində, sinəsində sədəfli saz, əlində qara yelənli ağ yaylıq, bığlarını eşə-eşə, alnının və üzünün tərini silə-silə:

– Ayə, qardaşoğlu, görürəm neçə gündü mənnən əlləşirsən, eşitmişəm mənim dastanımı yaratmaq istəyirsən. Gəlmişəm sözünə söykək olum. Bilirsən ki, xalq dəmnən tapanda, mən qəmnən tapmışam aşıqlığı. Bilirəm, məndən ötrü, mənim köhnə havalarımdan ötrü çox darıxmısan. İstəyirəm "Mansırı" havasına şair Ağacandan oxuyum:

Yığılın başıma dost olanlarım,
Oxudun üstümdə Quran, gedirəm.
Fitnəkar olmadım, evlər yıxmadım,
Aparıb əxrətə iman, gedirəm.

Ayrılıq sinəmi yandırdı-yaxdı,
Fələk məni tərki-vətən buraxdı,
Deyillər cənnətlə cəhənnəm haqdı,
Görmədim ədalət, divan, gedirəm.

Canım qurban mərd iyidin mərdinə,
Yaralar sinəmdə sızıldar yenə,
Ağacanın pünhan olan dərdinə
Olmadı fələkdən dərman, gedirəm.

Bu qəmli hava, bu ağrılı söz məni elə tutdu ki, bilmədim yatmışam, ya oyağam.

Qəmi çəkib çıxarırdı canından,
Elə bil ki, qılınc qından çıxırdı.
Qan gölüydü sağı, solu, arxası,
Təpə-dırnaq aşıq qandan çıxırdı.

Od vurulub külə dönmüş zəmiydi,
Gözündəki buludların nəmiydi,
Qəlbindəki min illərin qəmiydi,
Dil-dil olub ağrı candan çıxırdı.

Zaman-zaman necə çəkib bu dərdi,
Danışdıqca köz-köz oldu, közərdi,
Bir tərəfdən gələn olsa dözərdi,
Ağrı-azar dörd bir yandan çıxırdı.

Qoca aşıq bir dumanlı dağıydı,
Bu da bir cür dövranıydı, çağıydı,
Bəxti qara, üstü-başı ağıydı,
Dərd üyüdüb dəyirmandan çıxırdı.

Ürəyimin qapılarını taybatay açıb, üzümü aşığa tutub elə həmin hava üstündə oxumağa başladım:

Yenə, a Saraçlı, nə yandırırsan,
Dərdin hər üzündən xəbərinmi var?
Göylərə sovrulan torpağın, daşın,
Dağlara tən gələn kədərinmi var?

Havalar hamısı göz yaşı tökən,
Kimdi damar-damar bağrını sökən?
Sarayı yıxılan, qalası çökən,
Xaraba kökündə şəhərinmi var?

Öldürür adamı səsin, avazın,
Niyə qəm üstündə köklənib sazın?

Tərsəmi yazılıb taleyin, yazın,
Canda qiyamətin, məhşərinmi var?

Yağılar od vurdu xəstəyə, sağa,
Dağ çəkdi arana, dağ çəkdi dağa,
Torpaq qorumağa, yurd qaytarmağa,
Əmrinə müntəzir ləşkərinmi var?

Kədər qismətindi, həsrət yazındı,
Haqqın haqsızlığa etirazındı,
Göydə Allahındı, yerdə sazındı,
Sənin sazdan özgə səngərinmi var?

Aşıq "Bərəkallah, oğul, ustadına bərəkallah!" deyib, razılıq elədi.

Sazla dediyim kimi, sözlə də ustadı sorğu-suala tutdum:

– Ustad, toxunduğun iki mətləbin açmasını sənin öz dilindən istəyirəm. Birincisi, niyə dedin ki, xalq dəmdən tapanda, mən qəmdən tapmışam? İkincisi də, niyə söhbətə şair Ağacanın o qəmli sözləriylə başladın? Bu dərd nə olan şeydi, ay ustad?

– Oğul, dərdlə lap köhnədən, dədə-babadan qan qohumluğum var. Məni ilk dəfə dərdlə qan tanış eləyib. Qohumlarım çox olsa da, məni dərddən çox istəyən yoxdu, ay bala. Nə qədər ki, uşaq idim, bizə az-az gələrdi. İldə bir-iki dəfə gələr, üzünü bozardar, gözünü ağardar, dişini qıcıyar, yavaş-yavaş xəlvətə çəkilib gedərdi. Mən böyüdükcə o da böyüdü, sonralar məndən əl çəkmədi. "Qardaşınam", dedi, "dostunam" dedi. "Səninlə ömürlük sirdaş olacağam" – dedi.

Dərdə mərdim...
Düşməsin dərdə mərdim.
Yazıq canım neyləsin,
Tifilkən dərd əmərdim.

Elə bil çərxi-fələk bu dərdi mənim boynuma biçmişdi. Dərdin mənə quşu qonmuşdu. Məni yaman çox istəyirdi. Mən ondan qaçmaq istəyirdim, o isə məndən bir addım da kənara çəkilmək istəmirdi.

– Ay ustad, dərd adama neyləyir ki, sən ondan belə hour-zour eləyirsən, niyə belə yanıqlısan?

– Dərd adama neyləyəsidi, a bala! Böyümək istəyirsən – başından basır, yerimək istəyirsən – ayağından dartır, uçmaq istəyirsən – qollarını bağlayır. Dilini titrədir, yerişini büdrədir, dişini laxladır, saçını vaxtsız ağardır, ciyərini pencər kimi sıxır, gözünə duzlu su, ürəyinə dərd, beyninə duman doldurur. Gözün görə-görə səni öldürür, sonra da üzünə gülə-gülə deyir, get yaşa! Nəfəs candan, ruh bədəndən çıxmamış səni bircə an da olsun gözdən qoymur. Elə ki, nəfəs getdi, canın çıxdı, o da çıxıb gedir, daha sənlə yoldaşlıq eləmir. Bax dərd budu, bala, qəmnən tapmaq budu!!!

Suallarım elə bil aşığın yarasının üstünə köz basmışdı:

– Oof, ay bala, mənim köhnə dərdlərimi niyə təzələdin, yaralarımın üstünü niyə açdın? O ki belədi, məndən demək, səndən eşitmək, "Yüz gün yaraq, bir gün gərək" deyəllər. Lazımın olar, inşallah:

Niyə dedim, necə dedim, nə dedim,
Yaxşı dinlə, yaxşı anla, yaxşı qan.
Hər nə varsa məndən sənə əmanət,
Yaxşı dinlə, yaxşı anla, yaxşı qan.

Dərdim çoxdu, açma mənim falımı,
Zalım dövran zəhər etdi balımı,
Yaxşı öyrən mənim ərzi-halımı,
Yaxşı dinlə, yaxşı anla, yaxşı qan.

Qan üstündə bir məmləkət quruldu,
Al-qanımız neştər ilə soruldu,

Ağlar gözüm ağlamaqdan yoruldu,
Yaxşı dinlə, yaxşı anla, yaxşı qan.

Mən Hüseynəm, şərbət mənə ağıdı,
Şeytan feli ömrümüzə yağıdı,
Niyə belə dərd sinəmi dağıdır?!
Yaxşı dinlə, yaxşı anla, yaxşı qan.

Oğul, sazla dediyim kimi, sözlə də deyirəm: "Dərdlini dindirməyin, dərd onsuz da dindirir" deyiblər. Ona görə "mən aşıqlığı qəmnən tapmışam" dedim ki, Saraçlı kəndinin üstündə atam Qurban kişini – on uşaq atasını gözlərimin qabağında şura hökuməti güllələdi.

"Güllələdi" sözü dilinnən çıxdığınnan, aşığın rənginin qapqara qaralmağı bir oldu. Elə bil ki, palıd ağacını qəfildən ildırım vurdu. Dili tutar-tutmaz "mənə su verin" dedi. Mən tez aşığa bir dolça su verdim. Dodaqları cadar-cadar olmuş torpaq suyu ciyərinə necə çəkərsə, aşıq da dolçanı o cür başına çəkdi.

Qırx il sinədə qövr eləyən yaranı, ürəkdən girib, kürəkdən çıxan güllənin yanğısını bir dolça su ilə söndürməkmi olardı?

Qurban kişini Saraçlının yuxarı başında, Qaraqayanın döşündə, Qalxama arxının üstündə güllələdilər. Bir neçə dil bilən Qurban kişinin onda əlli yaşı var idi. O zaman atılan güllə qırx il sonra aşığın sinəsindən dəyib, kürəyini açım-açım eləmişdi. O zaman atayaağsaqqala dəyən güllələr bu gün oğula, aşığa, sənətə, sənətkara, sazın tellərinə dəymişdi.

O qanlı səhnə birdən-birə aşığı həmin dəhşətli və amansız günlərə aparmışdı...

– Hökumətin əmri, qəzanın hökmü beləydi: Qurban ağa güllələnməliydi. Düzdü, ona rəsmi şəkildə dövlət tərəfindən ağalıq verilməmişdi. Amma şəxsiyyəti, oturuşu, duruşu, savadı ona ağa nüfuzu qazandırmışdı.

Əlaltından satqınlar vasitəsilə öyrənmişdilər ki, bu kənddə sözü keçən, irəlidə olan Qurban kişidi. Hökumətin qara dəftərinə düşmüşdü.

Güllə rus beşaçılanından açılır. Güdaza verən özümüzünkülər, tətiyi çəkən rus barmağı olur. Qəbiristanlıqda dəfninə icazə verilmir. Ölümündən sonra qarışıqlıq olmasın deyə üç gün əsgərlər qəbri qorumağa məcbur olur. Harda güllələnibsə, orda da onu torpağa tapşırırlar.

Güllələnmədən 5-10 dəqiqə qabaq son söz demək istəyir. Çuğullar hökumət adamlarına qandırır ki, ona söz verməyin. Onda elə dil var ki, əgər ağzını açdısa, bəraət qazana bilər. Şeytan fitvası işini görür, hökm yerinə yetirilir. Qurban kişinin ölümündən üç gün sonra hökumətdən kağız gəlir ki, onu güllələmək olmaz, bağışlamaq lazımdır. Artıq gec idi. Daldan atılan daş topuğa dəymişdi...

Aşıq yavaş-yavaş özünə gəlib söhbəti davam etdirir:

– Mən ailənin ikinci uşağı olduğum üçün bütün ağırlıq mənim çiynimə düşdü. Qanlar, qırğınlar, qaçaqlar, qoçaqlar, güllələnmələr, sürgünlər gördüm. Anam Yetər qarı dilinin bayatısı, gözünün yaşı ilə böyütdü bizi. Ağılar, laylalar, oxşamalar, eydirmələr anamın səsində, sözündə iliyimə, qanıma hopdu, damarlarıma yeridi. Anamın bayatı-ağı kökündə dodaqaltı zümzümələri, qımqımaları, duaları, Allaha ərzi-halları havalandırırdı məni. Dedilər Qurban kişinin oğlu havalanıb. Oxlovdan, odundan, yarmaçadan, maşadan, süpürgədən əlimə nə keçirdisə, saz kimi sinəmə basıb oxuyurdum. Niyə oxuyurdum, kimdən oxuyurdum – bilmirəm, bircə onu bilirdim ki, oxuyurdum.

Dədə Ozan əlini yenə qara sazına apardı, söylədi, görək nə söylədi:

Ulu Tanrı bölgüləri böləndə,
Kimə çoxu, kimə azı verdilər.

Bölüşdürüb fəsilləri, ayları,
Kimə qışı, kimə yazı verdilər.

Püşkümüzə ulduz düşər, Ay düşər,
Bəxtimizə çeşmə düşər, çay düşər,
Yaradandan hər kəsə bir pay düşər,
Mənə buta telli sazı verdilər.

Sevişənlər naz-qəmzələr satanda,
Bir-birinin ürəyinə yatanda,
Növbə gəlib Saraçlıya çatanda,
Şirin səsi, xoş avazı verdilər.

İbtida olaraq şair Ağacandan oxumağım da boşuna deyil, oğul:

Dər dəymişi,
Budaqdan dər dəymişi.
Mən özüm dərd əhliyəm,
Tanıram dərd əymişi.

Onun başına açılan müsibət mənimkindən də betər olub. Ağacan Gümrü mahalında dünyaya gəlib, ordan Borçalıya, Quşçu kəndinə köçüb. Savadlı olduğuna, dini gözəl bildiyinə, şairliyinə görə Sibirə sürgün eləyiblər. Vəfalı ömür-gün yoldaşı Zəhra xanım şairin ölümündən iki il sonra ərinin sümüklərini Sibirdən gətirib, Qaçağan qəbiristanlığında torpağa tapşırıb. Zəhra xanım öləndə onu şair Ağacanın sümükləri basdırılan yerdə dəfn ediblər. Sümükləri Sibirdə sızlayanlarımız birdimi, beşdimi, ondumu, yüzdümü, hansını deyəsən, oğul? Gör aradan neçə illər keçib. Sibir deyiləndə indinin özündə də adamın sümükləri göynəyir.

Güllələnmiş sıramızdı,
Uzaq düşən aramızdı,

Sağalmayan yaramızdı
Sibirdə qalan sümüklər.

Qanlı taxt-taca nifrətdi,
Kindi, qəzəbdi, hiddətdi,
Dəhşət içində dəhşətdi
Sibirdə qalan sümüklər.

Yediyini yedi qürbət,
Dediyini dedi qürbət,
Soruş, desin nədi qürbət
Sibirdə qalan sümüklər.

İşığımız, nurumuzdu,
Odumuzdu, qorumuzdu,
Yer dəyişən gorumuzdu
Sibirdən gələn sümüklər.

Vətənə dönmüş qürbətdi,
Heyrətə dönmüş qeyrətdi,
Bir əbədi ziyarətdi
Sibirdən gələn sümüklər.

– Bax, budu cənazəsi Sibirdə, sümükləri Qaçağanda dəfn olunan şair Ağacanın faciəsi. İndi tale oxşarlığına fikir verdinmi, verdiyin sualın cavabını aldınmı, oğul?

– Bəli, – dedim, bağır basdım, baş endirdim ustada. Gördüm aşığın taleyi ilə mənim taleyimdə də bir qəribə, maraqlı oxşayış var. Mən də öz növbəmdə öz taleyimdən danışdım ulu ozanımıza:

– Mənim ana babam Sərdəroğlu Qurban yaraşıqlı, boylu-buxunlu, sazı gözəl çalan, şirin avazlı, eşq əhli bir insan olub. 1937-ci ildə şura hökuməti onu da Sibirə sürgün eləyib. Nabat nənəm ondan sonra beş-

altı il yaşaya bilib. Bu həsrətə dözməyib, dünyasını dəyişib. Yetim qalan üç sahibsiz qızın biri mənim anam, ömrü boyu gözü yollara baxan, kirpiyiylə odlar götürən Güllü xanım olub. Gözümüzü açandan anamı dili bayatılı, gözü yaşlı gördük. Ürəyi qardaş istəyəndə deyərdi:

Qar daşı,
Qarlı dağdan qar daşı,
Xəstə könlü nar istər,
Mənim könlüm qardaşı.

Bir at mindim – başı yox,
Bir çay keçdim – daşı yox.
Yetim bir qız ağlayır,
Qohumu-qardaşı yox.

Muraza çatan yetim-yesiri görəndə gümüldənə-gümüldənə deyərdi:

Mən də yetim,
Sən yetim, mən də yetim,
Sən yetdin mətləbinə,
Dua qıl, mən də yetim.

Atalının atası varsa, yetimin də Allahı var. Allah məni anama təkcə oğul kimi yox, həm də şair kimi bəxş elədi ki, onun ağlı-qaralı günlərini, bir gözü gülüb, bir gözü ağlayan dəmlərini bayatının, qoşmanın, təcnisin diliylə ipə-sapa düzüm, ellərdə, dillərdə səsləndirim. Bəlkə Allah məni saza ona görə bu qədər möhkəm bağladı ki, sazı köynəkdə, qəlbi göynəkdə qalan, səsi alınan babamın yarımçıq arzularını davam elətdirim. Bu talelərin dastanını yazmaq üçün mən də qoşuldum saz çalıb, söz deyənlərin cərgəsinə.

Ustad aşıqların nəvəsiyəm mən,
Könlüm çalmasınmı saz havasını?
Meylini verməzmi bağlara bülbül,
Tərlan istəməzmi yaz havasını?

Düşəndə gözlərin dodağı qəndə,
Günahdı salasan ürəyi bəndə.
Sallama yerişli bir qız görəndə,
Dinləmək istərəm naz havasını.

Zəlimxan, sevgiyə tapşıranda can
Uca dağlar kimi ucalar insan.
Aşıq, layla deyən dilinə qurban,
Çal mənim anamın öz havasını.

Hüseyn Saraçlının bu söhbətdən ürəyi qubar elədi, onsuz da kövrək olan aşıq bir az da kövrəldi. Ala gözlərindən bir neçə damla yaş düşdü, o yaş sazın sinəsinə və mənim nisgilli ürəyimə süzüldü. Dedi:

– Oğul, mənim atam Qurbanın güllələnməsi də, sənin baban Qurbanın sürgünü də qara gəlmiş 30-cu illərin işi, yerdə özünə Allah deyənlərin fitnə-fəsadı, şəri-böhtanıydı, o şərə, böhtana da bizim ata-babalarımız düşdü. Hələ də azarını çəkirik. Nə azar qurtarır, nə dərd-bəla. Nəysə... Söhbətin axarını dəyişək. İndi de görüm, oğul, mən aşıqlığı qəmnən tapdım, sən şairliyi hardan tapdın, nədən mayalandın?

– Ustad, hardan tapasıydım? Borçalının aranı-yaylağı, dağı-binəsi, çayı-çeşməsi, bulaqların zümzüməsi, yarpaqların pıçıltısı, çayların şırıltısı məni şair elədi.

Ustad bu sözümü yumşaq bir gülüş və təbəssümlə qarşıladı. Adəti üzrə yenə bığlarını eşə-eşə dedi:

– Ayə, rəhmətliyin oğlu, kimin ağlına soğan doğruyursan? Yarpaqların pıçıltısınnan, bulaqların şırıltısınnan şairlik olsaydı, şairləri dağ-dərə tutmazdı, çomaq

götürənin hamısı – məmə deyəndən pəpə yeyənə şair olardı.

Ustad sözü yerində demiş, hədəfə vurmuşdu. İşarə verirdi ki, şairlik Allahın işidi, bəndəlik deyil. Özü o yolları keçib gəldiyinə görə belə şeyləri yaxşı bilirdi. Atası gözünün qabağında güllələnəndə də, atasının üstündə iki dəfə həbsə düşəndə də, Dağ Borçalıda Cücəkəndində gözəllər gözəli Şahsənəm xanıma vurulanda da, yuxularda saz çalıb, bülbül kimi oxuyanda da:

Dəmə gəl,
Söhbətə gəl, dəmə gəl.
Dərd bilənin özü gələr,
Dərd bilməzə demə gəl.

– deyib, öz ömrünü-gününü laylaya tutanda da aşıq nədi, Haqq vergisi nədi, buta verilmək nədi, dərviş alması nədi, ələst aləmi, ərənlər piri nədi, çox gözəl bilirdi. Zaman-zaman mənə bu həqiqətlərdən danışmışdı.

Amma di gəl ki, bu mətləbləri dərindən bilsə də, həmişə deyərdi:

– Qırx ildi bu sənətə qulluq edirəm, qırx ilin aşığıyam, amma hələ də bilmirəm aşıqlıq nədi. Çünki nə qədər əlləşdim, vuruşdumsa da bu mətləblərin sonunu bir yana çıxardammadım.

– Mən də bu dünyanı belə gördüm ki, ancaq bilənlər dedi “mən heç nə bilmirəm”. Bilməyənlər “hər şeyi bilirəm” dedi.

Ustad yenə meydanı saza verdi. “Mixəyi” havası üstündə dedi, görək nə dedi:

Qədəm basıb bu sənətə gələndən,
Hünər tapdım, qorxu nədi, bilmədim.
Qırxlar piri sığal çəkdi başıma,
Ərənlərin qırxı nədi, bilmədim.

Havaların sanbalı nə, sayı nə,
Qəm yükünün mənə düşən payı nə,
Bu sənətin çeşməsi nə, çayı nə,
Seli nədi, arxı nədi, bilmədim.

Una döndüm, ömrüm keçdi ələkdən,
Dərdə-qəmə bələnmişəm bələkdən.
Saraçlıyam, dad elədim fələkdən,
Fələk nədi, çarxı nədi, bilmədim.

– Ustad, bu sirləri sən də bilmirsənsə, onda biz kimin yanına gedək?

– Dərgahımız, pirimiz, ocağımız, murad alıb, murad verənimiz el içində, xalq arasındadı, oğul. İşıq gələn tərəf oradı, üzünü həmişə o tərəfə tut, elin "bərəkallah"ını qazanana zaval yoxdu, mənim balam.

Hər oğulun hünəri deyil ki, elin "bərəkallah"ını qazansın. Kim bu sərvəti qazana bilsə, Tanrının dostu, elin anası, xalqın sirdaşıdır. Əgər sən, doğrudan da, haqq aşığı, el şairisənsə, bil ki, qiblə də, qara daş da, Kəbə də, Məkkə də ordadı.

Şair qardaş, elə yaz ki,
söhbətinə, sözünə,
Sənətkarın sazındakı
tel "Bərəkallah!" desin.
Xalq ucaldar sənətkarı,
xalq üçün yanmaq gərək,
Elə yan ki, atəşinə
kül "Bərəkallah!" desin.

"Mən şairəm" deyən kəsin
ürəyi közdən gərək,
Ağır olsun, inciməsin,
hər quru sözdən gərək.

Qiymətini el içində
salmasın gözdən gərək,
Yeriyəndə arxasınca
el "Bərəkallah!" desin.

Dərya olsan, havalanma,
de, damladan azam mən,
Gəl özündən dəm vurma ki,
yayam, qışam, yazam mən.
Tel olmamış söyləmə ki,
bir sədəfli sazam mən,
Bu gedişə dodaq gülsün,
dil "Bərəkallah!" desin.

Elin yanına getdinsə, elin içində əridinsə, elin dilində danışdınsa, el sənin dilinlə dilləndisə, dünya sənin, sən də dünyanın olacaqsan, oğul!

Sənsiz səni coşduracaq Yaradan,
Bülbülsənsə, gül yanına get, oğlum!
Qovuşarsan ümmanların qoynuna,
Damlasansa, sel yanına get, oğlum.

İşığı gör dumanda sən, sisdə sən,
Yaxşını tap yamanda sən, pisdə sən,
Şirin üçün Fərhad olmaq istəsən,
Külüng götür, bel yanına get, oğlum!

Elin dili durna telli, cığalı,
El içində yaraların sağalı,
Ruhumuzun yaraşığı, sığalı,
Elə çevril, el yanına get, oğlum!

El deyəndə mən bunu gəlişigözəl söz kimi işlətmirəm. Elin qaçağı-qoçağı, mərdi-namərdi, dəlisi-do-

lusu, qarısı-qocası, keçəli-lotusu, dərvişi-dəlləyi var. Hər birinin də öz dünyası, öz aləmi, öz gözəlliyi. Hər birinin öz nağılı, öz dastanı, öz qaravəllisi, öz atmacası. Naxırçıdan, sağıcıdan, ilxıçıdan, çobandan, dəlləkdən elə söz eşidərsən ki, ömrün boyu oxusan da onu heç bir kitabda tapmazsan, oğul!

**Sözə qüvvət.** Bir gün çoban sürüsünü sulamaq üçün qoyunları suya sürmüşdü. Qoyun-quzu sudan içir, çoban da "qürreyhə-qürrey" fışqırığına ara vermirdi. Kənardan biri bu mənzərəyə tamaşa edirdi. Dedi:

– Ayə, ay çoban, doğrudan da, elə çobansan ki, çobansan. Ayə, qoyundu, sudu, içsə içər, içməsə içməz, sən nə fışqırığa dəm verirsən?

Çoban heç təhər-tövrünü pozmadan:

– Qardaş, məni bağışla, içində o qədər səni kimi qanmayanı var ki, fışqırıqlamasam içmir, – cavabını verir. Məclis adamı məclisnən, el adamı elnən, yol adamı yolnan, söz adamı söznən olmalıdır. Hər yerin öz adamı, hər adamın öz yeri var. Hər sözün öz yeri-yatağı, dağı-binəsi var, oğul. Sözü deyənlə dedirdən, danışanla danışdıran yarıbayarıdı. Sözün cavabı söz olar, bezin cavabı bez. Sözü vaxtında və yerində deməsən, heç kəs eşitməyəcək. Sözü sahibinə çatdıra bilməsən, özündən küs, özgədən yox.

Bu bayatını eşitməmiş olmazsan:

Qoy qala,
Odun gətir, qoy, qala.
Sözün keçməyən yerdə
Ürəyində qoy qala.

Ustad davam elədi:

– Ömrümün oğlan çağlarında başıma gələn bir söhbəti qulluğunuza yetirirəm. Yayın qızmar çağlarıydı. Qaşqa kəhəri minib arandan yaylağa – Saraçlıdan Qaraxaça yol gedirdim. Ayaq üzəngidə, diz qabırğada,

əl qamçıda. Sazı da çiynimə çal-keçir eləmişdim. Uzaqdan baxanda Osmanlı beşaçılanına oxşayırdı. Saraçlıdan çıxdım, Qoçulu körpüsünü adladım, Kəpənəkçini, İncəoğlunu, Şəmşoyu keçdim, Çatağın körpüsünün üstündə fikirləşdim ki, yol məni darıxdıracaq, Allah eləyə bir yol yoldaşı ola, yaylaq yollarına nərdivan qoyaq, körpü salaq. Söhbət başımızı elə qata ki, ayılanda görək Lök Candarını keçmişik. Yolun sonuna çataçatıq.

Elə bil Allah səsimi eşitdi. Çatağın körpüsünü təzəcə keçmişdim ki, arxadan qamçı şaqqıltısı eşitdim. Gördüm bir atlı gəlir, atın cilovunu çəkib onun gəlişini gözlədim. Salamlaşdıq. Cilov vura-vura atlarımız qoşalaşdı. Bir az getmişdik ki, dedim: "Qardaş, gəlsən yola bir nərdivan qoyaq, bir söhbət başlayaq, bəlkə, o hesaba yolu qısalda bildik". Dedi: "Sən bilən yaxşıdı. Nəyi bilirsən başla". Fikirləşdim ki, hansı dastanı Çataqdan başlasam Lökün altı Candarda söhbətin əl-ayağını yığa bilərəm. "Alı xan və Pəri" dastanını başladım. Yaylaq yolu ola, dağ cığırları ola, köhlən atla səfər ola, ömrün oğlan çağları ola, aşığın nağıllı-dastanlı-atmacalı dünyası ola, qulaq asanın da xoş halına, danışanın da.

Bəli, söhbəti başladım. Dastanın ustadnaməsi, vücudnaməsi, deyişməsi, qıfılbəndi, hərbə-zorbası, duvaqqapması – hamısı yerli-yerində. Söz sözü çəkir, söhbət söhbəti. Boğazım yumşalır, arada bir tərlan kimi qıy vururam, sinəm dəmirçi kürəsinə dönür. Doğrudan da, dediyim yerə – Lökün altı Candara çatanda dastanı tamamladım. Lök dağı Ləlvərlə, Ağlağanla adı qoşa çəkilən, Borçalının aran-yaylaq yolları arasında ən hündür dağın adıdı. Lökə qar düşəndə babalarımız deyərdi ki, hazırlıq görün, qış gəlir. Lök dağı ilə bağlı bir bayatımız da var:

Yekə dərdi,
Yetimin yekə dərdi.

El çəkməz, oba çəkməz,
Söylədim Lökə dərdi.

Nəysə... gələk mətləb üstünə. Dastanın duvaqqapmasını deyib, söhbəti tamamladım və yol yoldaşımın üzünə baxdım. "Sağ ol"unu, "bərəkallah"ını gözləyirdim. Birdən-birə gözlədiyimin tərsini gördüm. Sifətində saza, söhbətə heç bir maraq oxumadım. Elə bil beş saatlıq yaylaq yolunda olan söhbət heç onun yel olub yanından da keçməmişdi.

Dedim: "Qardaş, söhbət xoşuna gəldimi?" Sualımdan kişi yuxudan ayılan kimi oldu. Var səsiylə bircə söz işlətdi: "Hayy?" Dedim: "Allah evini yıxsın, səhərdən qızıl xırdalayıram, "hayy" nədi? Yolboyu bir Quranlıq söz danışmışam, deməli, bu sözlərin sənə təsiri olmuyub?"

Dedi:

– Ay aşıq, sən Allah məni bağışla. Dağ kəndlərinə kartofa dəyişməyə qarğıdalı aparıram. Bütün yolboyu fikrim alverin yanında olub. Alı xan kimdi? Pəri xanım kimdi? Sənin nə danışdığından qəti xəbərim olmayıb.

O gündən mənə dərs oldu ki, sözün müştərisi olmasa, bazarını bağlı, xəzinəni örtülü, sandığını qıfıllı saxla. Özümü ələ almaq üçün yenə bir zarafata əl atdım:

– Ay eloğlu, daha mənə olan olub, izin ver sənin bu ərzi-halına bir misal çəkim.

"Buyur!" dedi. Yenə sağ olsun ki, "buyur" kəlməsini işlətdi.

– Bir gün bir tacirin qızıl yüklü dəvəsi karvandan ayrılıb, qatardan üzülüb, itkin düşmüşdü. Tacir başıalovlu düşür dəvəni axtarmağa. Orda dəvə, burda dəvə, axtara-axtara, soruşa-soruşa gəlib bir kəndə çıxır. Təzəcə kəndə giribmiş ki, görür bir gözəl qız çiynində durnaboğazlı səhəng bulağa sarı gedir. "Ay qızım, bir dayan, sənə sözüm var" deyir. Qız ədəblə dillənir: "Əmi, buyurun görüm nə deyirsiniz?"

Tacir:

– Ay qızım, iki min manat muştuluq verirəm, bəlkə dəvə görəsən?

Qız:

– Əmi, uşaqlıqdan məni əmimoğluna beşikkərtməsi eləyibləр, bu gün-sabah toyumuz olasıdı.

Tacir:

– Ay qızım, onu demirəm, muştuluq verirəm, bəlkə dəvə görəsən?

Qız:

– Əmi, qonşumuzda qoldan yoğun, ağıldan az bir oğlan var, məni o götürüb qaçmaq istəyir.

Tacir:

– Ay qızım, iki min manat muştuluq verirəm, bəlkə dəvə görəsən?

Qız:

– Əmi, əslinə qalsa, mənim qəlbim nə əmim oğlundadır, nə də qonşumuzun oğlunda. Mənim ürəyim xalam oğlundadır. Mən ancaq onunla xoşbəxt ola bilərəm.

Hə... Tacir barmağını dişləyir ki, ey dili-qafil, mən nə hayda, bu nə hayda? Deməli, hər kəs öz dəvəsini axtarır. Beləcə mən başıdaşlı da o tacirin gününə düşüb, “Alı xan və Pəri” dastanını kartofla qarğıdalının güdazına verdim.

Gücüm yenə dərdimin dərmanı telli saza çatdı, ürəyimi boşaltdım:

Hərənin öz dəni, öz dəyirmanı,
Hər kəs öz işində, öz hayındadı.
Əzrayıl can atır can bazarına,
İnsan od eşqində, köz hayındadır.

Canını ağrıdan azara baxmır,
Ucuz satıldığı bazara baxmır.

Ölünü yuyanlar məzara baxmır,
Kəfən alverində, bez hayındadır.

Qara ləkə düşür yaşıl xalıya,
Sönən ocaqları kimlər qalıya?
Dastan qurban gedib qarğıdalıya,
Aşıq Saraçlı da saz hayındadır.

Bəli, bu yaylaq yolları o yollardı ki, məni dönə-dönə dağlarla, binələrlə, çaylar-çeşmələrlə, el ağsaqqalları ilə, sinədəftər qocalarla görüşdürüb.

Bu o yaylaqlardı ki, məni həmişə özünə çəkib. Şıdırğı dolusu, leysan yağışı, qəzəblənmiş seli, havalanmış çayı, oxuyan bulağı gecə yuxularımda, gündüz xəyallarımda qərar tutub.

Bu o yaylaqlardı ki, qırx incəbelli qızla seyrə çıxan Gülzar xanım ceyran şəklinə girib Şah İsmayılın ağlını başından almışdı. Dalınca gəlsin deyə, əl-ayağını yığışdırıb, sona kəklik kimi Şah İsmayılın başının üstündən sıçramış, gedib öz çadırına girmişdi.

Bu o yaylaqdı ki, Gülzar xanımdan ötrü Şah İsmayıl kimi bir sərkərdəni bir qarıya minnətçi salmışdı.

Mən ovçuyam, öz ovumu ovlaram,
Alacağam, nənə, ceyran mənimdi.
Yeddi bələn aşırıban ovlaram,
Alacağam, nənə, ceyran mənimdi.

– deyən şairə göy yaylağın başında kənizlərin başçısı qarı belə cavab vermişdi:

Mən ceyranı yeddi ildi saxlaram,
Kərəm eylə, oğlan, ceyran mənimdi.
Gündə üç yol nəzər salıb yoxlaram,
Kərəm eylə, oğlan, ceyran mənimdi.

Bu o yaylaqlardı ki, "Çərşənbə günündə, çeşmə başında" incəbelli, durnaboğazlı gözəl qızlar çox oğulları havalandırmış, Abbas Tufarqanlı demiş: "Ağlını başından, ruhunu bədənindən almışdı".

Günlərin bir günündə təzə-təzə sinəm saza, əlim pərdəyə yatdığı bir vaxtda Cücəkəndinə gedəsi oldum. Atamın dağ kəndlərində dostları çox olduğu üçün yaylaqlara, dağlara tez-tez gedib-gələrdim. Cücəkəndində Tomarrı Qurban kişi var idi. Atamın ürək dostu idi. Məni görən kimi öz doğma balası kimi bağrına basdı:

– Hüseyn bala, sən mənim əziz dostumun oğlusan, neçə gün ürəyin istəyir bizim evdə qalacaqsan.

Bura gələndə anam Yetər xanıma demişdim, evimizdən nigarançılığım yox idi, ona görə də əmin-arxayın burda qalası oldum. Üçüncü günün axşamında Qurban əmi mənə müraciətlə:

– Qardaşoğlu, qonşuda toy var, gəl səni də o toya aparım, dağlarda çalınan toyları öz gözlərinlə gör, – dedi. Üzünü evdən bayıra sarı çevirib: – Ay Şahsənəm, qızım, hazırlaş, səni də toya aparacağam, – dedi.

Qız bu sözü eşidən kimi tovuz quşuna döndü, bəzənib çardağa çıxdı. Qız məni hardasa görmüşdü, ancaq mən qızı heç vaxt görməmişdim. Mən Qurban əmi ilə evdən çıxanda gözlərimə inanmadım. İlahi, bu nə gözəl, bu nə gözəllik idi? Çardağın altında bir dünya gözəli yerdə çiçəklərə, göydə ulduzlara meydan oxuyurdu. Özözümə fikirləşdim ki, üç gündü mən burdayam, bu qızı harda saxlayıblar ki, görməmişəm? Bəlkə gözlərim tutulub, bəlkə fil qulağında yatmışam? Nəysə... getdik toy məclisinə. Qara zurnanın səsi, dəfin gumbultusu adam nədi, daşı da yerindən oynadırdı. Gözəllər kəklik kimi səkirdi. Qızlar Şahsənəmi də oynamağa dəvət etdilər. Şahsənəm oynamağa çıxdı, nə çıxdı, bulud altından çıxan gün kimi gözəlliyi də, gözəl oynamağı da cavanların ürəyinə od saldı. Ürəyimə dammışdı ki, Allah bu

el gözəlini mənim bəxtimə yazmasaydı, ilin-günün bu vaxtında mənim burda nə işim vardı? Şahsənəm oynadıqca ürəyim atlanır, könlümdə söz qaynayırdı. Nə vaxt dillənib şeir oxumağımdan özümün də xəbərim olmadı. Hamının eşidəcəyi bir səslə oxumağa başladım:

Bir dünya gözəli çıxdı meydana,
Bağrımın başında buz oynatdılar.
Əridim, töküldüm, əsdim, titrədim,
Elə bil sinəmdə köz oynatdılar.

Qəfil bir baxışla gəldik üz-üzə,
Kimdi bu ceyranı buraxan düzə?
Biri mələk dedi, biri möcüzə,
Şairlər ortada söz oynatdılar.

Ürəyə od axdı, damara işıq,
Dəydi bir-birinə xanəndə, aşıq,
Bu nə tamaşaydı, bu nə yaraşıq,
Gözlər baxa-baxa göz oynatdılar.

Can çiçək olanda nəfəs tər olar,
Dodaq bal olanda yanaq zər olar,
Dedilər məclisdə bədnəzər olar,
Çevirib başına duz, oynatdılar.

Bir sərgi yaradıb qızdan, qadından,
Allah, danışırdı eşqin adından.
Bu toy görənlərin çıxmaz yadından,
Bu toyda bir gözəl qız oynatdılar.

Alqış sədaları göylərə ucaldı. Mənim oxuduğum şeir məclis əhlini daha da coşdurdu. Məclis qurtaran kimi Qurban kişi şad-xürrəm bizi də götürüb evinə gəldi. Elə bil təzə anadan olmuşdum. Yerə-göyə

sığmırdım. Göylərin neçənci qatında uçurdum, Allah bilirdi. Ürəyimin tıppıltısı, döyüntüsü sinəmi yarıb eşiyə çıxmaq istəyirdi. Fürsət gəzir, məqam axtarırdım ki, Şahsənəmə ürəyimin sözünü yetirəm. Nəhayət, mən deyən saat gəlib çatdı. Gün bir çatı boyu qalxmışdı ki, Qurban kişinin qapısında beş-altı atlı göründü. Qurban kişini də İlməzli kəndinə toya aparmaq üçün Cücəkəndinin adamları bir yerə cəm olmuşdular. Qurban əmi atını minib atlılara qoşuldu. “Arvad, evdən-eşikdən, oğul-uşaqdan muğayat ol, axşama qayıdaram” – dedi. Mənə də belə bir tale fürsəti lazım idi, Allah verdi. Sən demə, Şahsənəm xanım da məndən xəbərsiz belə bir anı səbirsizliklə gözləyirmiş.

Görüşdük. Dillə dodaq, közlə ocaq, odla torpaq görüşən kimi. Görüşdük. Qızla bulaq, şehlə yarpaq, güllə yanaq görüşən kimi. Görüşdük. Bu görüşdə elə bir çətinliyimiz olmadı. Elə bil bizi görüşdürmək üçün Allah özü hər şeyi əvvəlcədən hazırlamış, yerbəyer eləmişdi. İlk görüş baxışların payına düşdü. Baxışların ürəyə düşən körpüsündən arzular, diləklər, fikirlər, xəyallar keçdi. Kövrək düşüncələr gələcəyə doğru qanadlandı. Əl əldən, göz gözdən, nəfəs nəfəsdən od aldı. İlk görüş haqda tarixlər boyu dahilər bir-birindən maraqlı fikirlər söyləyib. Ancaq heç kəs bu vaxta qədər ilk görüşün dadını, tamını, ləzzətini, gözəlliyini, unudulmazlığını tam açıq göstərə bilməyib. Qələmə gəlmir, dəftərə sığmır, kitaba yerləşmir ilk görüşün yaratdığı duyğular.

Ürəyin sinəni yumruq kimi döyməsi, qəlbin tellərinin dil-dil ötməsi, damarda qanın coşması, qaynaması, gözdə odun-alovun alışıb yanması, dodaqların titrəməsi, yanaqların allanması, əllərin titrəyişi, dilin dolaşması, ağlın çaşması ilk görüşün, ilk sevginin heç vaxt yaddan çıxmayan, həmişə kövrək hisslərlə xatırlanan əlamətləridi.

Hüseyn Saraçlı da ilk görüşün, ilk sevginin odunda beləcə yandı, beləcə qovruldu.

Kənardan baxan nə bilsin ki, gənc Hüseyn fikrində, xəyalında haralara getdi, haralardan qayıtdı...

Harda barış, harda savaş vaxtıdı,
Qılınc bilər, qalxan bilər, qan bilər.
İnsan oğlu cəsarəti özünə
Şöhrət bilər, şərəf bilər, şan bilər.

Haqqa doğru addım atan yolları,
Addımbaşı nura batan yolları,
Yaradana gedib çatan yolları
Ərən bilər, sultan bilər, xan bilər.

Bağban bilər dəymiş nədi, kal nədi,
Sevən bilər yanaqdakı xal nədi,
Gül-çiçəkdən mayalanmış bal nədi,
Çiçək bilər, arı bilər, şan bilər.

Bir qız ilə bir oğlanın xətrinə,
Yer-göy batır çəmənlərin ətrinə.
Cavanlığın qiyməti nə, qədri nə,
Ürək bilər, nəfəs bilər, can bilər.

Asta-asta dil tərpənər, səs eylər,
Dil tərpəndi, görüş üçün bəs eylər.
Qız dodağı, qız yanağı nə söylər,
Axşam bilər, gecə bilər, dan bilər.

Hüseyn ürəyini yandıran sözü yana-yana Şahsənəmin qulluğuna yetirdi. Şahsənəm isə qəlbindən keçənləri birbaşa demədi, xeyli özünü naza çəkdi, dilini sürüdü ki, aşiqin ürəyini bir az da alovlandırsın.

İlk görüşdən, bir baxışdan dağlar gözəlinə vurulan Hüseyn bu yerdə özünü saxlaya bilmədi, sinəsini saz

elədi, barmağını təzənə, aldı görək sevdiyi gözələ nə dedi, dağ çiçəyi ona nə cavab verdi:

Hüseyn:

Bir dolça su çilə yanan qəlbimə,
Qəlbi də, canı da al, əmim qızı!
Sənin gözəlliyin dilə gətirər,
Qara daş olsa da lal, əmim qızı!

Şahsənəm:

Mən dağlar gözəli, sən aran əhli,
Uzaqdı arada yol, əmim oğlu!
Körpülər xatalı, keçidlər dərin,
Gəl qoyma bu işə qol, əmim oğlu!

Hüseyn:

Məhəbbət aşiqin qəlbi, canıdı,
Sevən sevdiyini seçdi, tanıdı,
Alma yanaqların can dərmanıdı,
Qönçə dodaqların bal, əmim qızı!

Şahsənəm:

Bu bağdan pay olmaz hər gələn kəsə,
Gəl salma bu sirri hələlik səsə,
Anam istəməsə, atam verməsə,
Boylana-boylana qal, əmim oğlu!

Hüseyn:

Kim eşqin barını başacan dərib,
Özünü heç yerdə saymayıb qərib,
Səni Hüseyn üçün Allah göndərib,
Salma ürəyimə xal, əmim qızı!

Şahsənəm:

Şahsənəm qıyarmı həsrət görəsən,
Qoymaram qəribtək qürbət görəsən,
Gərək bu sevdadan cənnət görəsən,
Çeşmə ol, qəlbimə dol, əmim oğlu!

Bəli, əzizlərim, söhbət elə şirin oldu ki, heç bilmədilər Ay hardan gəldi, Gün hardan getdi, hansı ildi, hansı gündü, hansı saatdı. Bir də gözlərini açdılar ki, şər qarışıb, şamlar yanıb, hər kəs öz evinə-ocağına çəkilib. Söz kəsib, ilqar alıb, ilqar verdilər, əhdi-peyman bağladılar. Yerlə göy kimi bir-birini bağrına basıb qucaqlaşdılar.

Ayrılıq vədəsiydi, getmək vaxtı gəlib çatmışdı. Hüseyn qızdan ayrılmaq istəyəndə gördü nə ayaq yeriyir, nə ürək getmək istəyir. Addım atmaq istədi, ayaqları sözünə baxmadı. Gül bülbüldən, arı çiçəkdən, kəklik qayadan, çəmən çeşmədən ayrıla bilirmi ki, Hüseyn də dağlar gözəlindən ayrıla bilsin. Hüseynin ürəyi cuşa gəldi, qəlbinə təsəlli vermək, ürəyini saz üstündə dindirmək üçün aldı görək sevgilisi ilə necə halal-hümmət elədi:

Hüseyn:

Gözəllərin zər gözəli,
Nigaran qoymaram səni.
Yaylaqların tər gözəli,
Nigaran qoymaram səni.

Şahsənəm:

Sözlərinə canım qurban,
Get, oğlan, gözlərəm səni.

Sənə din-imanım qurban,
Get, oğlan, gözlərəm səni.

Hüseyn:

Haqqa qulaq asa-asa,
Uzaq yollar basa-basa,
Dönərəm Xızır İlyasa,
Nigaran qoymaram səni.

Şahsənəm:

Şahsənəməm, süslənərəm,
Nəğmə kimi səslənərəm,
Bir can kimi bəslənərəm,
Get, oğlan, gözlərəm səni.

Hüseyn:

Sənə verib dağ-binəmi,
Meydan edərəm sinəmi,
Ay Hüseynin Şahsənəmi,
Nigaran qoymaram səni.

Bəli, əzizlərim! Hüseyn bu gecəni Cücəkəndində gecələdi. Amma bu gecə o gecələrdən olmadı, Hüseyn üçün hər dəqiqə bir il qədər uzun çəkdi. Üstümüzə xeyirli sabahlar açılsın. Elə ki səhər açıldı, Hüseyn Qurban kişiyə minnətdarlıq edib yola düşmək istəyəndə Qurban kişi dedi:

– Oğul, dünən toyda camaatla qaynayıb-qarışmağın çox xoşuma gəldi. Sənə bir at bağışlayıram. Halalın olsun, min çap, bu saat sənin köhlən yoran çağlarındı.

Hüseyn Qurban əmiyə razılıq edib atı mindi. Halal-hümmət edib yol başladı dağdan arana doğru. Öz-özünə

fikirləşdi ki, bu nə uğurlu səfər oldu. Hələ kişinin xəbəri yoxdu ki, mən onun qızına, qızı da mənə aşiq olub. At muraz deməkdi. Yəqin ki, mindiyim bu at məni murazıma çatdırmaq üçün çox yollardan keçməli olacaq.

Bəli, at, doğrudan da, yerimirdi, uçurdu, elə bil yeldən qanad taxmışdı, elə bil Saraçlıda balası qalmışdı. Könlü havalı, başıalovlu özünü yetirdi Saraçlıya. Kəndə çatanda yadına düşdü ki, atı yolda bircə dəfə sulayıb. Ata qarşı qəddarlığına görə özünü danladı ki, sən necə qıydın bu boyda yolu birnəfəsə sürüb gəldin? Axı o sənin murazındı, innən belə gərək onu göz bəbəyi kimi qoruyasan. "At igidin qardaşıdı" sözünü Koroğlu elə-belə deməyib. Atın ürəyini almaq üçün yalmanına sarılıb, gözlərindən öpdü.

Anası onu görən kimi özünü saldı üstünə:

– Ay bala, Allah mənə ölüm versin. Yuxumu yaman qarışdırmışdım. Neçə gündü səndən nigaran qalmışam. Hardasan, gəlib çıxmırsan? Hüseyn göylərdə süzən qartala dönmüşdü. Bir bəhanə gəzirdi çalıb-oxumaq üçün. Sazı sinəsinə basıb dedi:

– Ay ana, gördüklərimi dilnən desəm, dilim od tutub yanar, icazə ver, mətləbimi saznan deyim, hara getmişdim, niyə getmişdim, kimin yanına getmişdim.

Ər kişilər meydanından gəlirəm,
O məclisdə yaxşı dəmi görmüşəm.
Ürəyimdə eşq adlanan dərya var,
O dəryada üzən gəmi görmüşəm.

Çiçək olub baharında, yazında,
Ərimişəm baxışların nazında,
Sevənlərin könül adlı sazında,
Enib-qalxan zili-bəmi görmüşəm.

Çəkəmmərəm ayrılığın yasını,
Silməliyəm ürəyimin pasını,

Sevib-seçib gözəllərin xasını,
Cücəkənddə Şahsənəmi görmüşəm.

Hüseynin ürəyi dolmuşdu. Aldı görək anasına daha nə dedi:

Ruhum havalandı, qəlbim qaynadı,
Söz düşdü, dodaqdan-dodağa gəldi.
Hələ bu sərhədi keçmə, dedilər,
Sevgiyə bu yerdə qadağa gəldi.

Bar verdi, sinədə nar qoşalaşdı,
Zirvə qoşalaşdı, qar qoşalaşdı,
Tale fürsət verdi, yar qoşalaşdı,
Mən dağa qalxanda, o, dağa gəldi.

Eşqimin sərdarı, sultanı mənəm,
Dillərin ən şirin dastanı mənəm,
Töksələr qanımı qurbanı mənəm,
Canım yar yolunda sadağa gəldi.

Anası Yetər xanım dedi:

– Ay oğul, bir əməlli-başlı başa sal görüm gördüyün qız kimin qızıdı, hardan aldın onun sorağını, adını hardan eşitdin ki, gedib onu tapdın?

Hüseyn:

– Ana, mənim sevdiyim qız atamın dostu Cücəkənddi Tomarrı Qurban kişinin qızıdı.

Söz Hüseynin ağzından çıxdığınnan Yetər xanımın özündən getməyi bir oldu. Bu ilmi ölübsən, bildirmi? Birtəhər üzünə su səpib arvadı ayıltdılar. Ayılan Yetər ananı elə bir ağlamaq, elə bir hönkürtü tutdu ki, gəl görəsən. Səsini el-oba eşitməsin deyə arxa otağa çəkildi. Az qaldı bu mənzərədən Hüseynin başına hava gəlsin. Gözlədi ki, qoy anası sakitləşsin, sonra bu işdən agah

olsun. Bir az keçəndən sonra Hüseyn ehtiyatla, qorxa-qorxa soruşdu ki, ana, ağzımı açmamış məni niyə peşman elədin? Xeyir-dua vermək əvəzinə göz yaşı tökürsən. Oğlunun sözünə cavab verməyən ana dərin bir xəyala daldı. Fikri-xəyalı bir neçə il əvvələ getdi...

Onda hələ Qurban kişi güllələnməmişdi. Ailə, oğul-uşaq, dağ-binə, el-oba hamısı yerli-yerində idi. Hələ 37-nin qanı heç kəsin üstünə sıçramamışdı. Saraçlı Qurbanın köçü yaylaqdan təzəcə arana enmişdi. Günlərin bir günü Qurban kişi evdə aranı xəlvət görüb ömürgün yoldaşı Yetər xanımı yanına çağırdı:

– Arvad, sənə bir sirr açmaq istəyirəm. Amma gərək bu arzumuz yerinə yetənə qədər söhbət ikimizin arasında qalsın.

Sözlü adama oxşayan Qurban kişinin gözlərindən xoşbəxtlik yağırdı.

Yetər xanım:

– Buyur, – dedi, – ay kişi, Allah xeyir eləsin.

– Ay Yetər, yadındadımı, Cücəkənddə Tomarrı Qurbanın dağda oğullu-uşaqlı bizim alaçığa qonaq gəlməyi?

Yetər qarı:

– Bəli, yadımdadı, ay kişi, xeyir olsun?

– Xeyir olmamış nə olasıdı, Allahdan danmadım, səndən nə danım, Qurban kişinin beş-altı yaşlı Şahsənəm adlı bir qızı var idi. Mən ona çox diqqətlə fikir verirdim. O, gələcəyin ən gözəl gəlini olacaq. Kimin evinə düşsə, dirəyi qızıldandı. Onu indidən Hüseyn üçün gözaltı eləmişəm. Qız ağacı, qoz ağacı, hər gələn bir daş atar. Göz-qulaq ol, vaxtı çatar-çatmaz o qıza elçi gedəcəyəm. Nə deyirsən?

– Boy, ay kişi, o günə qurban kəsərəm, niyyət orucu tutaram, yetimlər sevindirərəm. Sənin adın da Qurbandı, o qızın atasının adı da. Allah yazmayıbsa, iki Qurbanı bir-birinə qohum, dost, arxa yazsın.

O gündən Saraçlı Qurban Şahsənəmi evinə gəlin gətirmək üçün illəri, ayları, saatları sanayır, hərdənbir

bu söhbəti Yetər xanıma xatırladırdı. Ancaq bizim bilmədiyimiz işlər var. O, yalnız Allahın əlindədi:

Nə saydı,
Nə nəs gündü, nəs aydı,
Mən nə saymaq istədim,
Gör bir fələk nə saydı.

İndi Allahın işinə baxın ki, özü həyatda olmayan Qurbanın arzuları həyata keçirdi. Yetər ananı ağladan, kövrəldən Hüseynin özündən xəbərsiz atasının ən gözəl arzusunu yerinə yetirməsiydi.

Yetər xanım xəyaldan ayrılıb oğlunun boynunu qucaqladı. Hüseyn yerində donub qalmışdı. Bayaqkı göz yaşı, hönkürtü nəydi, indiki sevinc nəydi... Ana fikrindən keçənləri oğluna danışanda ana-balanı yenidən ağlamaq tutdu. Gözlərinin yaşı bir-birinə qarışdı. Yetər xanım oğlunu sakitləşdirib dedi:

– Oğul, bu gün bu xəbərdən Qurbanın ruhu şad olacaq. Gərək molla çağıraq, ruhuna Allah kəlamı oxudaq.

Elə də elədilər. Qəbir üstə Quran oxundu, Allah kəlamı səsləndi. Hüseyn dedi:

– Ay ana, Allaha da qurban, onun kəlamına da, izin-icazə ver, atamın məzarı başında sinəmə bir neçə kəlmə söz gəlib, mən də bir övlad sözü, bəndə kəlamı oxuyum.

– Buyur, oğlum, atan güllələnəndə sənin on üç yaşın vardı. Ürəyində nə varsa, qızırqalanma, de gəlsin. Qoy ömrü vaxtsız qırılan kişinin qolları-budaqları, oğul-uşağının arzuları, ümidləri qırılmasın.

Hüseyn atasının məzarı başında dolan buluda, yağan yağışa, axan selə dönmüşdü. Sevinclə kədər, ölümlə həyat gənc Hüseynin ürəyində qoşa dağlar kimi baş-başa vermişdi. Atasız keçən günlərini gözünün önündən keçirib, asta-asta, qəmli-qəmli "Zarıncı" havası üstündə oxumağa başladı:

Ata, ayrılığın yaman ağırmış,
Ağladım, gözümü yaşlar apardı.
Sənsiz talan olmuş xırman yeriyəm,
Daşıdı dənimi quşlar apardı.

Qaçsam da dünyanın qəm-kədərindən,
Bağrım dağ-dağ oldu min bir yerindən,
Dərd öz kotanını çəkdi dərindən,
Şumladı sinəmi xışlar apardı.

Yağdı saçlarıma həsrətin qarı,
Heç oldu gözümdə dünyanın varı,
Yeriyə bilmədim qəbrinə sarı,
Süründüm, dizimi daşlar apardı.

Nisgilli bir ürəyin ata haqqında söz-söhbəti qurtarmadığı üçün Hüseyn rədifi dəyişib ikinci qoşmaya keçdi. Görək öz sevgisi üçün atasından necə xeyir-dua istədi:

Sən deyən gözələ aşiq olmuşam,
İzin ver sözümü deyim, ay lələ!
Günah tutmuşamsa keç günahımdan,
Görəndə qalmadı heyim, ay lələ!

Göydən bəla gəlsə, məndən ötürməz,
Atım yüyrək olub, bəxtim gətirməz,
Sənsiz toy e ləsəm, Allah götürməz,
Sızıldar kamanım, neyim, ay lələ!

Qıvrılır ürəyim, doğranır içim,
Əmrinə hazırdı karvanım, köçüm,
Rəva görürsənmi qəm seli içim,
Dərdi çörək kimi yeyim, ay lələ!?

Sənsiz alagözlü pərim ah çəkər,
Basılar meydanda nərim, ah çəkər,
Göylərin altında yerim ah çəkər,
Qan ağlar, yaş tökər göyüm, ay lələ!

Sən mənim dünyamsan, mənə dünya ver,
Mən damla istəsəm, sən bir dərya ver,
Gəlmişəm, bu işə xeyir-dua ver,
Sultanım, əfəndim, bəyim, ay lələ!

Ana-bala gözlərinin yaşını, ürəyinin sözünü boşaldıb, bir az yüngülləşib, soluqlarını alıb qəbirdən ayrıldılar.

Evin darvazasından içəri girəndə arxadan bir səs gəldi. Geriyə boylandılar, heç kəsi görmədilər. Addım atmaq istəyəndə o səs bir də eşidildi. Hüseynin tükləri biz-biz oldu. Yerindəcə quruyub qaldı. Səs Qurban kişinin səsiydi. Bu səs yerdənmi çıxdı, buludların arasındanmı endi, daşı-qayanımı tərpətdi, qəbrin sinə daşındanmı qalxdı? Səsi Yetər xanım da, Hüseyn də çox aydınca eşitdilər. Bu həmin səs idi ki, neçə il qabaq Qurban kişi Yetər xanıma Şahsənəmin söhbətini eləmişdi. Bu gün həmin səs də murazına çatmışdı. Bu xəbərə görə arvadına da, oğluna da gözaydınlığı verirdi. Hüseyn evdə anasından ayrılıb bu səsin dalınca səssiz-səmirsiz birbaşa düz Qaraqayanın döşünə qayıtdı. Atasının məzarına diqqətlə baxdı. Gördüyündən heyrətə gəldi. Başdaşı bir az qəbrə sarı əyilmişdi. Qəbrin üstündəki torpaq bir neçə yerindən çat vermiş, xırda yarıqlar əmələ gəlmişdi. Bu mənzərə heç vaxt Hüseynin gözlərinin önündən getmədi, ömrü boyu da bu sirri heç kəsə açmadı. Nəydisə özüylə o dünyaya apardı.

Nəysə... Aşıq dili yüyrək, aşıq könlü köyrək olar. Günlər, aylar gəldi-keçdi. Hüseynin dostu Qara Osmanın iştirakı ilə Saraçlıdan Cücəkəndinə elçilər getdi. Razılıq çayı içildi, üzük taxıldı. Elçilikdən qayıdan

kişilər elə bil ki o yaylaqların nə ki gülü-çiçəyi, ətri-təravəti var, hamısını Dağ Borçalıdan Bağ Borçalıya, Saraçlıya gətirmişdilər. Öz sevgisinə qovuşmağa can atan Hüseyn bu xəbərdən göydə uçan quşa döndü. Anasının əllərini öpüb gözlərinin üstünə qoydu. Bağrına basdı. Bu yerdə görək ana-bala bir-birini necə saza-sözə tutdular, nə dedilər:

Anası:

Sənə də qurbanam, Şahsənəmə də,
Hər arzun açılan gül olsun, oğul!
Əlin daş görməsin, ayağın tikan,
Yolların ipəkdən tül olsun, oğul!

Hüseyn:

Könül sevindirib, ürək açmağa,
Dualar dilində bol olsun, ana!
Sevincdən, sevgidən, nurdan, işıqdan,
Bütün ürəklərə yol olsun, ana!

Anası:

Qoyma qəlbi küsə, ürəyi sına,
Yarın barmağına xına yax, xına,
Qoy səni çatdırsın öz murazına,
Canım Yaradana qul olsun, oğul!

Hüseyn:

Sevmişəm əsili, sevmişəm soyu,
Minadan ucadı yarımın boyu,
Ocaqda bayramdı oğulun toyu,
Dinən ürəyində tel olsun, ana!

Anası:

Nisgilim, həsrətim getdi aradan,
Mən Yetər xanımam, çıxdım qaradan,
Versin qismətini ulu Yaradan,
Dayağın həmişə el olsun, oğul!

Hüseyn:

Dəyməsin Hüseynə dilin yarası,
Sevgidi gözümün ağı-qarası,
Sevinsin hamının ciyərparası,
Sevinci qaynasın, sel olsun, ana!

Sözün möhürbəndini vurub, tapşırmasını tapşırıb, ana-bala fikrini tamam elədi.

“Xəstə tələssə də, armud vaxtında yetişər” – deyiblər. Toyu tez eləmək istəsələr də, araya hadisələr düşdü. 37-nin xofu, qarabasması çox toyları, nişanları ləngitdi, çox arzuları qırdı, çox ümidləri yarıyolda qoydu. Bu minvalla Hüseynlə Şahsənəm iki il nişanlı qaldılar. Nəhayət, iki ilin tamamında toy tədarükü görüldü. Faytonlar bəzəndi, arabalar qoşuldu, atlar yəhərləndi, qızlar darandı, gəlinlər sığallandı, oğullar döşünü qabağa verdi, ağsaqqallar, ağbirçəklər yerbəyer oldu. Aşığın dostu Qara Osman, Yetər xanım, Saraçlı Gülxanım, əmisi Səməd kişi, kəndin üzdə olan say-seçmə adamları “Ya Allah, səndən mədəd!” deyib yola çıxdılar. Yazın elə vaxtıydı ki... Yolda bir neçə yerdə öküzlər arabadan, atlar faytondan açıldı. Göy çəmənlərin sinəsi, qaynar bulaqların gözü ola, aşıqların söhbəti-sözü ola. Dincələn dincəldi, oynayan oynadı, güləşən güləşdi, hay-haray dağları başına götürdü. Nəhayət, gəlib Cücəkəndinə çatdılar. Kəndin başbilənləri toya gələnləri el qaydası ilə, urvatnan qarşıladılar. Qərara gəldilər ki,

toyu Cücəkəndindən yuxarı, Soyuqbulaqdan aşağı Halay bulağının başında keçirsinlər. Hamı razılaşdı. Halay bulağının başına toplaşdılar. Zurnaçı zurnasını nizamladı, aşıq sazını köklədi, dəfçi dəfini sambadı, at minən yəhəri bərkitdi, güləşçi kəmərini bağladı, aşpaz qazanları asdı, saqilər şərbət süzdü, cıdıra çıxanlar, nəmər alanlar, qamçı şaqqıldadanlar, qılınc oynadanlar düzü-dünyanı başına götürdü. Üç gün, üç gecə toy vuruldu. Hamıdan çox sevinən, sevincindən gözünün yaşını saxlaya bilməyən, hamıdan sanballı və gözəl oynayan var idisə, o da Yetər xanım idi. Yetər xanım oynamırdı, uçurdu, qanadlanırdı.

Qurban kişinin əvəzinə də oynamaq, onun ruhunu şad eləmək istəyirdi. Oynadı Yetər xanım, amma yaman oynadı. Elə oynadı ki:

Ana qalxıb oynayanda
Elə bil dağ-daş oynadı,
Sevincindən yağış kimi
Gözlərində yaş oynadı.

Öpüşdü dillər, dodaqlar,
Çağladı qaynar bulaqlar,
Quş oldu əllər, ayaqlar,
Göz süzüldü, qaş oynadı.

Bilinmədi cavan, yaşdı,
Arzuları aşdı, daşdı,
Qocalar da cavanlaşdı,
Olsa da yüz yaş, oynadı.

Dizlərini həsrət bükür,
Sevinc qalxır, kədər çökür,
Şükür, bu günlərə şükür,
Dost güldü, qardaş oynadı.

Çal-çağırın, toy-düyünün şirin yerində toyxanada səslər ucaldı ki, bəylə gəlin oynasın: “Bəy öz toyunda oynayanda bolluq olar”, – deyiblər. Eşitmişik, – dedilər, – bəyin yaxşı oxumağı da var. Oxusun görək nə oxuyacaq”.

Murazına çatan aşiq Hüseyn bu gün aşıq Hüseynə dönmüşdü. Onsuz da səhərdən ürəyində oxuyurdu, indi aşkara oxumaq çətin idi. Ağsaqqallardan çəkinirdi.

Ancaq elin-obanın ağsaqqalları təzə bəyin sözünü eşitmək, sazını dinləmək marağına düşmüşdülər. Ona görə də cavanların dalbadal “Bəy oxusun! ” sədaları ərşə bülənd oldu. Hüseyn yenə yerindən tərpənmədi. Axır ki, bir el ağsaqqalı ədəb-ərkanla ayağa qalxıb üzünü Hüseyn Saraçlıya tutub dedi:

– Oxu, oğlum, oxu, bu yerlərdən Kərəm keçib Ərzuruma doğru, Lələsi də yanında, burda Koroğlular nərə çəkib, Aşıq Qərib Tiflisə gedəndə bu yerlərdə namaz qılıb, burda elədiyi dualar onu murazına çatdırıb. Çox igidlər, çox aşiqlər bu yerlərə səs salıb, qoy sənin səsin də bu yerlərin yaddaşında qalsın, dağa-daşa hopsun, gələcəkdə ot yerinə saz göyərsin, su yerinə səs qaynasın.

Daha bu yerdə Hüseyn Saraçlı oxumaya bilərdimi? Elə bil bu an dünyanın ən gözəl qızını da, ən şirin sazını da, ən coşqun avazını da, ən zil səsini də uca Tanrı ona vergi kimi vermişdi.

Aşıq oxuyurdu. Saçından dırnağına qədər bütün varlığı, ruhu, canı-qanı, nəfəsi, ürəyi oxuyurdu. Zəngulələr dağ şəlaləsinə dönüb şırhaşır dağlardan dərələrə, qayalardan daşlara, yoxuşlardan enişlərə doğru axıb gedir, bu gözəl toy məclisinin səsini-sədasını yaylaqdan arana, Cücəkəndindən Saraçlıya çatdırmağa can atırdı. Bu səsə-sədaya nə ki arana enən, yaylağa çıxan arvad-kişi, oğul-uşaq, qız-gəlin vardısa, hamısı ayaq saxlayıb yolların sağında-solunda daşlardan, qayalardan salxım kimi sallanırdı.

Aşıq oxuyurdu...

Bura yüz yaşında bir qoca gəlsə,
Göz işığa gələr, diz qüvvət tapar.
Baxar gözəllərin şux yerişinə,
Hər bulaq başında bir cənnət tapar.

Baxmaz baharına, qışına baxmaz,
Saçlar qar olsa da, başına baxmaz,
Təbiət insanın yaşına baxmaz,
Könül doxsanında məhəbbət tapar.

Xoşdu bu yerlərdə duman da, sis də,
Meylin nə çəkirsə, dağlardan istə,
Hər çay kənarında, hər bulaq üstə,
Ömür bir əbədi təravət tapar.

“Qaytarma” üstündə dillənəydi saz,
Qayıda biləydim qoynuna hər yaz,
Burda aşıq olsa, şirin bir avaz,
Burda şair olsa, şeiriyyət tapar.

Hüseyn, yaşama torpaqdan ayrı,
Közün nə ömrü var ocaqdan ayrı?
Sözün bu arandan, yaylaqdan ayrı,
Nə dildə səslənər, nə şöhrət tapar.

Bəli, doğrudan da, Hüseynin ömrünün-gününün arxası-dayağı, yaraşığı göy yaylaqlar, uca dağlar oldu.

Aşığın qismətinə baxın ki, onun sevgilisi dağlar gözəli olduğuna görə toyu da dağlara, yaylaqlara qismət oldu. Bəlkə də elə buna görə təbiətin ildırımı-şimşəyi, çəni-çiskini, qarı-qırovu, ayazı-şaxtası, istisi-bürküsü, otu-suyu, yarpağı-torpağı onu qorudu, yaşatdı, ucaltdı, qocaltdı. Gənc Hüseyni Aşıq Hüseyn Saraçlı kimi dünyaya tanıtdı, aləmdə məşhur elədi. Bəlkə, hamıdan xəbərsiz bircə Allaha, bir də təbiətə bəlli idi ki, bu gün

onun toyuna təkcə ağsaqqallar, ağbirçəklər xeyir-dua vermirdi. Lilpar da, əvəlik də, yarpız da, kəkotu da, qırxbuğum da, dəvədabanı da, asırqal da, qantəpər də, çobanyastığı da, quzuqulağı da, qazayağı da ona xeyir-dua verib, canlarında nə ki Tanrının verdiyi ətir-təravət var, hamısını aşığa və onun sevgilisinə bağışlamaq istəyirdi.

Beləliklə, yaylaqda başlanan toy aranda bir həftə davam elədi. Gələn-gedən, atlanan-düşən, gözaydınlığı verən, muştuluq aparan, şirni paylayan, nəmər bağışlayan bir-birinə qarışmışdı. Toy toylardan, boy boylardan, soy soylardan seçiləndə onun barı, bəhrəsi nağıl olur, dastan olur, tarix olur, yaddaşlara köçür. Aşıq Hüseyn Saraçlının toyu kimi. Leyli-Məcnun, Əsli-Kərəm, Fərhad-Şirin kimi cəfa çəkən olmadı, Aşıq Hüseyn Saraçlı kimi də səfa sürən, murazına çatan olmadı. Oğullu-uşaqlı, nəvəli-nəticəli, şanlı-şöhrətli bir taleyə sahib oldu Aşıq Hüseyn Saraçlı. Allah ona altı övlad verdi: üç oğlan – İsfəndiyar, Abbas, Əli; üç qız – Şəhriyar, Zərnigar, Mehriban.

* * *

Bəli, bütün bu əhvalatlar, bu hadisələr olmuşdu. Bu tarixlər, bu söhbətlər az qala yüz ildir mənə sarı yol gəlirmiş. Bu yüz ildə bu yolların yolçuları dəyişib, gözəllərə elçi gedən elçiləri dəyişib, o zamandan bu zamana zəmanənin ölçüləri dəyişib.

Aman qalar,
Ah qalar, aman qalar.
Yıxılar uca dağlar,
Tozu bir zaman qalar.

Bu yüz ildə neçə-neçə dağlar yıxılıb, neçə-neçə çaylar məcrasını dəyişib, batan sular, ölən dənizlər olub.

Düşmənlərimiz dost, dostlarımız düşmən olub. Tapdanmışıq, qırılmışıq, güllələnmişik, asılmışıq, bölünmüşük, parçalanmışıq, ancaq məhv olmamışıq. Tapdalayıblar, parçalayıblar, ancaq yenə cücərmişik, bitmişik, yaşıllaşmışıq, böyümüşük, boy atmışıq, şaxələnmişik, çoxalmışıq, dilimizi, dinimizi, ruhumuzu qorumuşuq.

Bütün bunlar öz yerində. Bir neçə sual var ki, nə zamandı sinəmi deşir, məni düşündürür. Müəmmalı suallar, qayğılı düşüncələr, niyələr, neyçünlər içində çırpınmağa başladım. Aşıq Hüseyn Saraçlı Borçalıda, Saraçlı qəbiristanlığında uyuyur. Mən onun məzarı başında göz yaşları içində vida sözü söyləmiş, həm ağlamış, həm də xalqı ağlatmışdım. O gün-bu gün bir dəfə də olsun aşıq mənim yuxuma girməmişdi. Bu nə yuxuydu? Aşıq mənim yuxuma niyə girmişdi? Məndən narazı olmamalıydı. Onu bütün məclislərdə dilimin duasına çevirmişəm. Hansı qüvvə onu çəkib mənim yanıma gətirmişdi? Nədən nigaran idi? Köç-köç olub dünyaya səpələnmiş Borçalı oğullarının taleyiydimi, nigaran qəbirlər və qəbiristanlıqlar idimi, Dədə Ələsgərin, Dədə Şəmşirin kafər tapdağında inləyən ruhlarıydımı, Laçında, Güləbirddə Sarı Aşığın sızıldayan sümükləriydimi? Qarabağın şan-şan olmuş bağrıydımı, Borçalıdan, Göyçədən, Dərələyəzdən, Zəngəzurdan, Dərəçiçəkdən, Zəngibasardan qalxan ahlar-amanlar idimi, köhnə yarasının üstə təzədən duz basılmış, talan olan, dili kəsilən Kərkük ellərinə hər tərəfdən enən zərbələriydimi?

Nə zaman ki Kərkük gəlir ağlıma,
Boğazlanmış bir türk gəlir ağlıma,

– deyən bir şairin nəfəsiydimi, hər gün üstümüzə qanlı xəbərləri gələn, neçə dəfə güllələnmiş, küçələri qan gölünə dönmüş, Səttarxanın, Xiyabaninin, Pişəvərinin döyünən ürəyi, görən gözü Təbrizin sağalmayan yarala-

rıydımı, anası ölmüş Azərbaycanın böyük düşmənlər əlində tapdanan haqqıydımı? Naşı dərzilər əlində bahalı parçalar kimi iti qayçılarnan doğram-doğram olan Azərbaycan torpaqlarıydımı? Nəydi, bilmirəm. Bildiyim odur ki, Aşıq Hüseyn Saraçlı mənim yuxuma girmişdi. Həmişə oxuyanda bayatı çəkən aşıq bu dəfə də bir bayatı çəkdi:

Yara yeri,
Sızıldar yara yeri.
Nə səndən ox tükəndi,
Nə məndən yara yeri.

Aşıq doğru deyirdi. Nə məndən ox tükənirdi, nə ondan yara yeri. O mənə Zəlimxan yox, Zelimxan deyə müraciət edərdi. Yenə də mənim düşüncəmdən keçən suallar sona çataçatda onun ittihamı, qınaq dolu sualları başladı:

– Zəlimxan, Borçalıda nə var, nə yox? Camaatın toyu-yası, xeyri-şəri, günü-güzəranı necə keçir? Gözüm bu gedişatdan su içmir, ay bala. Bu köçəköçün, qaçaqaçın sonu nəylə qurtaracaq?

Dağlar boyda dərdi olan aşığın dərdini təzələmək istəmirdim. Ancaq verdiyi suallar məni deşik-deşik, şan-şan elədi.

Aşıq sözün arxasını gətirməmiş mən ustadın cavabını vermək üçün telli saza əl atdım, “Qaraçı” havası üstündə oxumağa yox, ağlamağa başladım:

Yıxılan ağacdı köklü-budaqlı,
Çürüyə-çürüyə gedir Borçalı.
Axır zirvələrdən qar suyu kimi,
Əriyə-əriyə gedir Borçalı.

Kim var aşağıda, yuxarda, bilmir,
Nə var bu bulanlıq axarda, bilmir,

Çulunu sulardan çıxarda bilmir,
Sürüyə-sürüyə gedir Borçalı.

Əlləri soyuyub əkin-biçindən,
Qorxur karvanından, qaçır köçündən,
Qırıla-qırıla qalıb içindən,
Kiriyə-kiriyə gedir Borçalı.

Ağlayır kimsəsiz uşaqlar kimi,
Tökülür budaqdan dəymiş bar kimi,
Öz qara baxtını qalın qar kimi,
Kürüyə-kürüyə gedir Borçalı.

Düşmənin sözü cod, xisləti çopur,
Dərdi canımızda əriyir, hopur.
Möhtəşəm bir dağdı, yerindən qopur,
Yeriyə-yeriyə gedir Borçalı.

Aşığın rəngi qar kimi ağappaq ağardı. Son illərin olayları aşığın ruhuna dammışdı. Ürək açmayan, könül oxşamayan işlərdən hali idi. Ancaq dövranın belə dəyişdiyini, havaların belə tutulduğunu unamamışdı. Mənim bu qəfil xəbərim onu yaman kövrəltdi.

Baxışlarından gördüm aşığın ürəyi suallarla doludu, hər şeyi bilmək istəyir. Dedim, tale fürsətidi, qoy ürəyini boşaltsın. Aşığın sualları davam elədi:

– De görüm, mən dünyadan köçəndən sonra bizim evdə neçə dəfə olub, məni xatırlamısan? Aşıq Əmrahın, Kamandarın, Xındı Məmmədin, Aşıq Sadığın, şair Nəbinin, air Ağacanın, Quşçu İrvahamın, Qarayazılı Aşıq Alxanın, Əhməd Sadaxlının məzarlarını ziyarət edə bilmisənmi? Qaraxaç yaylağına, Oy dərəsinə, Ağçalıya, Novçalı bulağa, Cücəkəndinə, İlməzliyə, Yırğançağa, Soyuqbulağa, Başkeçidə, Əyriqara qalxa bilmisənmi? Get, oğul, get! Doğulduğun torpaqları, gəzdiyin oylaq-

ları heç vaxt unutma! Unutma ki, qapılar var açılmağa, süfrələr var sərilməyə, ocaqlar var qalanmağa, qurbanlar var kəsilməyə, köhlənlər var minilməyə həsrət qalıb, oğul. Qorxuram, narahatam, nigaranam. Saraçlı qəbiristanlığında qəbirdə rahat yata bilmirəm. Məni öz əllərinlə gora sallamışdın. Gorum od tutub yanır, oğul. Qəbrim yolun lap qırağında qazıldığından yoldan keçənlərin hamısının səsini eşidirəm, oğul. Saza qayıdın, məclisləri şenləndirin, oğullar öyləndirin, qızlar köçürün, bulaqları öpün, torpağı sürmə kimi gözünüzə çəkin, anaların gözünü yolda qoymayın, mənim nigaran ruhuma bir rahatlıq gətirin, bayatı çəkin, söz qoşun, saz çalın, ağac basdırın, körpü salın, ev tikin, yurdu-yuvanı abad eləyin, oğul. Axı Borçalı oğullarına düz əlli il "Misri", "Cəngi" üstündə Koroğludan oxumuşam. Onlar qoçaq olar, qaçaq olmaz, oğul. Aşıq Şenlikdən, Sarvan Bayramdan, Dollu Abuzərdən, Şair Nəbidən, neçə-neçə kamil ustaddan öyrəndiyim qəhrəmanlıq dastanları üstündə böyütdüyüm, iliyinə, damarına, qanına, canına, çöhrəsinə saz havalarını bal kimi süzdüyüm, şərbət kimi içirtdiyim insanlar yurdu-yuvanı tərk edə bilməz, oğul.

Bir gün çox dərdlərə, sitəmlərə sinə gərmiş bir ağsaqqaldan soruşdum ki: "Ey qoca, dədələrin yadigarı, adınız nədir?" Dedi: "Oğul, mənim adım yoxdur". Dedim: "Əmi, bu nə cür cavabdır?" Dedi: "Oğul, mənim adım Ağakişi idi. 30-cu illərdə ağaların axırına çıxdılar, 50-ci illərdə kişilərin. İndi nə ağam qalıb, nə kişim, adsız yaşayıram". Ağalığın da, ağaların da axırına çatdılar. Heç olmasa kişiliyi və kişiləri qoruyun, oğul. Satqınları öldürməklə iş qurtarmır, satqınlığın kökünü kəsin, mənim balam.

Ayıq olun, yatmayın, düşünün, daşının, papağınızı qabağınıza qoyub fikirləşin. Tapın, tanıyın düşməninizi. İçinizdə xainlər, satqınlar var, oğul! Düşmənlərimizə dost olanları el-obanın gözü qabağında niyə rüsvayi-

cahan eləmirsiniz? Satqına, xainə niyə aman verirsiniz? Niyə div yuxusuna gedibsiniz? Əgər deyilənlərə vaxtında əməl eləməsəniz, yuxunuza ağsaqqallar, ozanlar, övliyalar, şairlər yox, ilanlar, çayanlar, bayquşlar, əjdahalar, kaftar-küsdülər girəcək, oğul.

Lal olmuşdum. Başıma haranın daşını salım, nə deyim, nə cavab verim? Suallar dolu kimi başımdan elə yağırdı ki, elə bil yaylağın tüpüsünə, tufanına rast gəlmişdim. Aşıq sazı sərt bir tövrlə yenə bağrına basdı. Görək nə dedi, necə dedi:

Oğulsansa, bu sözlərdən od alma,
Bacarırsan uyu indi, yat indi,
Ürək dözsün bu dözülməz işlərə,
Yeddi yerdən qoy verməsin çat indi.

Söylə görüm, aranlısan, dağlısan,
Azad quşsan, yoxsa qolu bağlısan?
Bilirsənmi kimsən, kimin oğlusan,
Harda qalıb əsil indi, zat indi?

Sınan könlü saat kimi qurmadın,
Səngərində əsgər kimi durmadın,
Qaçan ovu bərəsində vurmadın,
Güllələri boş-boşuna at indi.

İman küfrün, din ahların içində,
Bir canın var min ahların içində,
Yaşadığın günahların içində,
Çalxan indi, boğul indi, bat indi.

Tor bağlamış bacalara tüstü ver,
Ürəklərə hünəri ver, şəsti ver,
Yaş oduna nəfəsindən isti ver,
Sönüb gedən ocaqları çat indi.

Qan-yaş kimi candan süzül, qandan ax,
Öz gününə, öz halına yaxşı bax,
Oğulsansa ildırımdan qanad tax,
Bu dərdlərin arxasından çat indi.

Aşıq məni dəhşətə gətirmişdi, illərlə üst-üstə qalanan ağrılı-acılı bu söhbətləri qəzəblənmiş dağ çayı kimi hirslə-hikkəylə üstümə axıdırdı. Ürəyimin yaralı sahilləri bu çayı qucaqlaya bilmir, dəli sular güllə kimi bədənimin yeddi qatından keçirdi. Bu yuxudan xilas olmağa can atırdım, ancaq suallar dəyirman daşı kimi başımdan basır, ayağımda qandala, qollarımda zəncirə dönürdü. Allaha yalvarırdım ki, məni yuxudan ayıltsın, heyif ki, o da məni eşitmək istəmirdi. Bilirdim ki, “Allah da çox sevir şeirin səsini”. Şairliyimi işə salıb, ulu Tanrıya yalvarmağa başladım:

Bu nə yuxu, bu nə qorxu, bu nə səs,
Ayılt məni bu yuxudan, Allahım!
Yuxu deyil, bəlkə qarabasmadı?
Ayılt məni bu yuxudan, Allahım!

Duman çökür, fikir çatır qaşımı,
Divar uçur, sel aparır daşımı,
Qılınc alıb cəllad kəsir başımı,
Ayılt məni bu yuxudan, Allahım!

Dil haçalı, böhtan dilli, şər xain,
Bu oyunda çıxdı mənə zər xain.
Dönük dostlar məni saldı arxayın,
Ayılt məni bu yuxudan, Allahım!

Yollarımız ayrı düşdü, kəc oldu,
Mən yumşaldım, düşmən mənlə öc oldu,
Ağır yatdım, ayılmağım gec oldu,
Ayılt məni bu yuxudan, Allahım!

Sözüm yoxdu dilə gəlib dinəsi,
Dərd-qəm ilə dolub-daşır sinəsi,
Ağır olur ustadların tənəsi,
Ayılt məni bu yuxudan, Allahım!

Yuxulara ilan-çayan girməsin,
Əl tulası ərənlərə hürməsin,
Heç gözlülər belə yuxu görməsin,
Ayılt məni bu yuxudan, Allahım!

Doğrudan da, Allah şairin səsini eşidirmiş. Yuxudan ayıldım. Elə bil məni koruş-kəsməz balta ilə doğram-doğram eləmişdilər. Özümə gələ bilmirdim. Rəngim dümağ avazımışdı. Elə bil yenə yuxudaydım. Həyata qayıda bilmirdim. Mənim yerimə dağ olsa əriyər, qaya olsa quma çevrilərdi. Hələ ürəyim partlamamışdı, bu, böyük şey idi. Bir neçə gün fikirli gəzdim, ağır addımladım, oturanda qalxmaq bilmirdim. Günü keçmiş, ölümünü gözləyən qocalar kimi dirsəyim dizimdən, əlim çənəmdən ayrılmırdı, qarnımda atlar təpişirdi. İçim özümü yandırırdı, çölüm özgəni.

Neyçün ağlar,
Gözlərin neyçün ağlar?!
Batan karvan mənimdi,
Kiradər neyçün ağlar?!

Kiradər də mən idim, karvanı batan da. Dünyanın bütün dağları mənim çiynimdə, bütün dumanları mənim başımda idi. Palıd közü kimi ağır-ağır yanır, korun-korun tüstülənirdim. Nə yerdə yerimi tapırdım, nə göydə göyümü. İşə baxın ki, bir neçə gün əvvəl yuxudan ayılmaq üçün Allaha yalvarırdımsa, indi yatmaq üçün ona üz tutmuşdum. O yuxudan sonra yuxumu da itirmişdim. Amma yatmağa da qorxurdum. Aşıq mənim yorğanıma

qor doldurub, yarama duz basmışdı. Qorxurdum ki, yuxuda yenə həmin divan-məhkəmə başlaya. Həyatla ölüm, yuxuyla yuxusuzluq – hərəsi məni bir tərəfə çəkirdi. Bilsəydim yuxuda başıma nə gələcək, heç yatmazdım. Nəysə... yuxu məni apardı. Möhkəm yatdım, Allah kəssin elə yatmağı. Bu, birinci yuxudan da ağır oldu. Təzəcə yuxuya getmişdim ki, qulaqlarımın dibində kişnərti səsi gəldi. Başımı qaldırdım ki, başımın üstündə ifçin nallı, qızıl yallı, qızıl üzəngili, gümüş yəhərli, "alma gözlı, qız birçəkli" bir qaşqa kəhər dayanıb. Atı görən kimi tanıdım. Bu, Aşıq Hüseyn Saraçlının məşhur yorğa kəhəriydi. Məni fikir götürdü. At gəlib, bəs sahibi hanı? Bəlkə sözümdən, söhbətimdən incimişdi? Bəlkə haradasa cavanlıq eləyib sözümün yerini bilməmiş, ustadın qəlbinə toxunmuşdum? At mənim qəlbimdən keçənləri insan kimi baxışlarımdan oxudu, gözləriylə işarə verdi ki, dur, məni Aşıq Hüseyn göndərib, səni onun gəzdiyi oylaqlara qaldırmalıyam. At elə bil adam kimi danışır, mən də qulaq asırdım.

– Özü gəlmədi, məni göndərdi ki, get Zelimxanı gətir. Çoxdandı Qaraxaça, Əyriqara, Ləlvərə, Başkeçidə, Ağlağana, Çubuqluya, Şamdüyəyə çıxmır. Qoy gəlsin buraların gününü görsün.

At qabaq dizlərini yerə qoyub mənə minmək işarəsini verdi. Atı mindim. Atı minən kimi yadıma Aşıq Qəribin Hələbdən Tiflisə gələndə mindiyi at düşdü. Bəlkə elə həmin atdı, məni murazıma çatdırmaq üçün göndərən göndərib. Gözlərimi yumub açmağa macal tapmamış özümü Qaraxaçda – Faxralının, Kəpənəkçinin, Saraçlının, Arıxlının, Darvazın, Dəmirrinin, Qarayazının, Qaraçöpün, Dəllərin, Saralların, Bavayışların, Gülöyürün, Qoçulunun binə yerlərində gördüm.

İçərimdən gələn səs dəyəsiz, alaçıqsız, binəsiz, məhləsiz, səssiz-səmirsiz dağlara, sürüsüz, ilxısız, naxırsız, çobansız, mehtərsiz, naxırçısız yallara-yamaclara,

gözəlsiz-igidsiz, oğulsuz-qızsız, toysuz-tamaşasız çeşmələrə, tüstüsüz bacalara, sönən ocaqlara, köçən kəndlərə, ot basan cığırlara, solan arzulara, qəribsəyən yollara baxdıqca bax deyirdi. Bu ölü sükutu kim yaratmışdı? Dağları yiyəsiz, binələri sahibsiz qoyan kimlər oldu? Çilingağac, ənzəli, eşşəkbeli, dirədöymə oyunları niyə yoxa çıxdı? Dəyəni, qarımı, nəmini, çətəni, çadırı, keçəni, kilimi, gəvəni, farmaşı, xurcunu, heybəni, çuvalı, kəndiri, örkəni, sicimi, irəşməni, çüyü, külü, kömürü, közü niyə unutdurdular? Qarını, motalı, cılğını, sərnici, sacı, sacayağını, ocaq daşını, təhnəni, ərsini neylədilər?

Yağı-balı, ayranı-şoru, südü-qaymağı, bulaması, pendiri, dələməsi, qurudu olan süfrələr harda qaldı? Göyəmi çəkildi, yermi uddu bu ilahi nemətləri? Necoldu o dəmlər, o dəsgahlar? Necoldu o toylar-nişanlar? Harda qaldı sevənlərin, sevilənlərin dünyası?

Cığırlar-çəhlimlər, yollar-izlər, yallar-yamaclar, enişlər-yoxuşlar, zirvələr-ətəklər, talalar-yastanalar, aşırımlar-bələnlər, körpülər-keçidlər, yurdlar, arxaclar, duzdaqlar birdən-birə niyə yetim qaldı?

At ağızlı, köhlən yerişli, qurd ürəkli, şir biləkli, pələng pəncəli, aslan nərəli oğulların hanı? İsti ocağın, dolu bucağın, eyvan otağın, ağır yığnağın, gələn qonağın hanı?

Bulaqlar niyə qurudu, ağaclar niyə kəsildi, niyə qeybə çəkildi, aşıqlar niyə lal oldu?

Dağa çıxdım, dəyə qurdum,
Xana qurdum, bəyə qurdum,
Belə ki, tez köçəsiydim,
Heç bilmədim nəyə qurdum?

Aşığın köhlən atı məni bu dağlara kef üçün gətirməmişdi. Ağlamağa, ağlatmağa gətirmişdi. Düşünməyə,

düşündürməyə gətirmişdi. Ölməyə, öldürməyə, məni özümə göstərməyə, özümü mənə tanıtmağa gətirmişdi. Kağızı-qələmi yandıran dərdlərimizi yazmağa, yaratmağa gətirmişdi.

Mənim də əlimdən ancaq yazmaq, bu dərdləri dünyaya car çəkmək gəlirdi ki, onu da aşığın, sazın, sözün diliylə deməyə çalışıram. Tez-tez gəlib bu dağları gəz deyillər, bu dağlara bir doyunca bax deyillər.

Bax deyillər, baxmağımın nə mənası,
Soruşan yox, dindirən yox, dinən yoxdu.
İgid ölüb, nal sökülüb, yəhər düşüb,
Köhlən ata sığal çəkib minən yoxdu.

Həsrət qalıb igidlərin nərəsinə,
Sükut çöküb dağların yan-yörəsinə,
Ov olsa da, ovçu yatmır bərəsinə,
Silahının arxasında sinən yoxdu.

Arzuları, ümidləri puç elədi,
Yadlar gəldi, doğmalarım köç elədi,
Namərd mərdi qova-qova heç elədi,
Gedən getdi, bu yerlərə dönən yoxdu.

İndi mən aşığa hansı ürəkaçan mətləbdən söhbət açım? O elə bilirdi ki, mən ona evlərdən, qurulan saraylardan, çəkilən bulaqlardan, salınan yollardan, açılan məktəblərdən, ləngərli məclislərdən, qarapapaq kişilərdən söhbət açacağam. Aşıq hardan bilsin ki, sevgilisi Şahsənəmi dünyaya gətirən kənd əriyib, yox olub, qeybə çəkilib, daha yoxdu. Daşlarına qədim türk əlifbası həkk olunan bu kənd yağı düşmən əlində inildəyir.

Görəsən, niyə bu kəndin adına Cücəkəndi deyiblər? Hansı əsrin, tarixin yadigarıdı bu kənd? Görəsən, burda ilk dəfə kim yer qazıb, daş töküb, ev tikib, ocaq qalayıb.

Onu ancaq Allah bilər. Allahdan aşağıda da ancaq daşlar bilər. Günəş öpən, yağış sığallayan, dolu döyən, sel oyan, mamır bağlayan daşlar. Onlar da ki dilinin qədəyini açıb bir kəlmə də olsa heç vaxt heç kəsə sirr vermir, söz demir, ürək açmır. Bu daşların gözü çox şey görüb, qulağı çox şey eşidib. Nə danışsalar, ancaq öz dillərində, öz aralarında danışırlar. Hələ daşla danışan adama bu dünyanın heç yerində rast gələn olmayıb.

Bəlkə belə yaxşıdı. Bəlkə də daşlar danışsaydı, insan oğlu daha böyük faciələrlə qarşılaşardı. Allah bilir kimə dil vermək, kimi dilsiz eləmək lazımdı. Daşlar danışsaydı, bəlkə müharibələr, savaşlar, ehtiraslar yenidən qızışar, dünya qana çalxanardı.

Bəlkə də, əksinə, Cücəkəndinin daşları, qayaları danışsaydı, dörd məhləsi, iyirmiyə yaxın ocağı, tayfası, üç dəyirmanı, Böyüktəpə, Kiçiktəpə, Dəvə qılıcı, Qızlar dərəsi, Damqaya, Əyriçay adlı əbədi ünvanı, yeri-yurdu, Sərçələr, Qaydəvələr, Bocalöyü, Motallar, Qara Abdulla, Bəyləröyü, Əlləzli, Qaraqurbanlılar, Bəkiröyü, Qara Kəllələr, Caqqarlar, Gillikli adı ilə tanınan tayfaları olan bir kəndin daşları dilə gəlsəydi, sirrini açsaydı, kim bilir, bəlkə əbədi xoşbəxt ola bilərdik.

Bəlkə daşlar bizə uğurun, qələbənin, əyilməzliyin, millətin gücünün, türkün ruhunun əbədi və dəyişməz ünvanını göstərə bilərdi. Hansı nəslin, hansı tayfanın adına baxırsan, ordan bir Tanrı ucalığı, qədimlik və möhtəşəmlik, müqəddəslik və əbədilik boylanır.

Balaca bir dağ kəndinin adı ilə bağlı bu qədər yer-yurd, tayfa-nəsil, çay-çeşmə, dağ-dərə adları varsa, indi görün tarix gedib haralara söykənir.

Aşıq Hüseyn Saraçlını bura çəkən qüvvənin adı nə idi ki, boylanmaqla ucu-bucağı görünməyən, əli-ətəyi sürülərə, ilxılara meydan olan yaylaqları qoyub gəlib Cücəkəndində, Böyüktəpənin üstündə hər yay dəyə qururdu. Hansı ruh idi, hansı qüvvə idi onu bu yerlərə bağlayan?

Belə bir məşhur, ulu ozanın gəlib buranı özünə yaylaq yeri seçməsi elə-belə məsələ deyil, bu, bizə çox mətləblərdən xəbər verir, çox mətləblərdən soraq gətirir.

Aşıq hardan bilsin ki, qış gəlib soyuqlar düşəndə hər evin darvazasından paslı qıfıllar asılır. Odun yarılmır, soba yanmır, qazan qaynamır, xörək bişmir. Hamı özünə isti yer axtarır. Düz yaza qədər kəndləri ölü sükutu basır. Əgər atı kişnəmirsə, iti hürmürsə, quzusu mələmirsə, xoruzu banlamırsa, kəndə kənd, elə el demək olarmı?!

Aranı-yaylağı, dağı-binəsi, kolu-meşəsi, örüşü, örənəsi, ormanı, otluğu-biçənəyi, tarlası-zəmisi özgələrin yeminə dönürsə, zorla özgə dildə danışmağa məcbur edilirsə, uca boylarına yuxarıdan aşağı baxılırsa, halal haqqını tələb edəndə adı vayqanlı olursa, ağız-ağıza dayanan ac canavarların, boz ayıların, sarı tülkülərin qarşısında quzu vəziyyətinə gətirilirsə, dil və din davasının qurbanına çevrilirsə, heç kəs hayına hay vermirsə, onda borçalılıları yerli-yersiz qınamaq olarmı? Bu vəziyyətdə Borçalıya Borçalı, mahala mahal demək olarmı? Yüz illərlə adı-sanı, şanı-şöhrəti, tarixi şəxsiyyətləri dünyaya səs salan ulu və müqəddəs bir torpaqda kənd adları qəsdən qondarma adlarla əvəz olunursa, sazı köklənmirsə, tarı ötmürsə, nağarası dağları yerindən oynatmırsa, zurnası havalanmırsa, neyi-balabanı sümükləri göynətmirsə, aşıqları deyişmirsə, xanəndələri cəh-cəh vurmursa, alimləri yetişmirsə, şairləri xalqın danışan dilinə dönmürsə, eldə ellik, gündə günlük qalarmı?!

Mənim bu ağrılı-acılı söhbətimdən Aşıq Hüseyn Saraçlı yerində quruyub daşa dönmüşdü. Onu heç vaxt belə yazıq, kimsəsiz, köməksiz görməmişdim. Özümü qınadım ki, nahaq aşığa ağzımın ağısını tökdüm. Sonra da fikirləşdim ki, bəlkə belə yaxşıdı. Dərdimi uşaq-muşağa danışmamışdım ki, ozanlar ozanına, 50 il ulu bir sənətə könül bağlamış ustada, hamının sevimlisi

Aşıq Hüseyn Saraçlıya danışmışdım. Dədə Qurbani demiş:

Söylə dərdin bilənlərə,
Dərd başına gələnlərə.
Hər üzünə gülənlərə
Etibar eyləmək olmaz.

1979-cu il idi. Qarayazı aşıqları Bakıya, filarmoniyaya konsert verməyə gəlmişdilər. Aşıq Alxan, Aşıq Asdan, Aşıq Bilal, Aşıq İsmayıl, Aşıq Vəli məclis aparmalıydılar. Məclisə ağsaqqallığı, gecəni idarə etməyi mənə tapşırmışdılar. Aşıq Hüseyn Saraçlının rəhbərlik elədiyi aşıqlar Bakıya konsertə gələndə daxili narahatlıq keçirmirdik, bilirdik ki, Hüseyn Saraçlı olan yerdə hər şey öz qaydasında olacaq, bir də ona görə ki, onlar Qarayazı aşıqlarına nisbətən Bakıda tez-tez məclislər keçirirdilər. Qarayazı aşıqları isə bu tərkibdə ilk dəfəydi filarmoniyada məclis aparırdı. Mən məclisin aparıcısı kimi aşıqların məşqinə çox ciddi yanaşırdım. Səhnəyə gəlmək, səhnədən getmək, harda başlamaq, harda qurtarmaq, səhnə mədəniyyəti, nizam-intizam məsələlərini, havaları, sözləri müzakirə edirdik. Rəhmətlik ustad aşıq Alxan Qarayazılıdan başqa hamısına tapşırıqlarımı, tövsiyələrimi verirdim. İnsafən, onlar da çox böyük mədəniyyətlə deyilənlərə əməl edirdi. Aşıq Alxan Qarayazılı ağsaqqal olmasına baxmayaraq çox cəld, çılğın, zarafatcıl, eyni zamanda sərt bir kişi idi. Onun sözü hər bir aşıq üçün qanun idi. Onunla ərkyana ancaq aşıqların içində ən cavanı və ərkəsöyünü olan Aşıq İsmayıl zarafat edirdi. O da ədəb-ərkan daxilində. Bu həmin Aşıq Alxan Qarayazılı idi ki, Tiflisin düz ortasında 50-ci illərdə Leninin heykəlinə tapançadan 15 güllə atmışdı. Bu işin üstündə nə az, nə çox – məhkəmə hər gülləyə 1 il iş kəsmişdi. Yəni Aşıq Alxan 15 il zin-

danda yatıb çıxmış adam idi. Mən dili xuruşdu aşıqlarla işimi qurtarandan sonra Aşıq Alxana "ustad, burdan belə gələrsən, ordan sağa dönərsən" deyib göstəriş verəndə aşıq bomba kimi açıldı. Bir yağlı söyüş söyəndən sonra qəzəblə dedi:

– Ay qardaşoğlu, ayə, Stalin məni sağa-sola döndərə bilmədi, indi sən burda mənə ağıl öyrədirsən?!

Aşıqların gülüşü, şaqqanağı dünyanı başına götürsə də, bu güllə atan aşığın sözü mənə güllə kimi dəydi. Ustad düz eləyirdi, mən böyük səhvə yol vermişdim. Ustadı bağrıma basıb, ondan üzr istədim. O da gülə-gülə, "narahat olma, sən bizim öz balamızsan" deyib məni öpdü. Aradan 27 il keçib, mən niyə bu xatirəyə qayıtdım? Qayıtdım ona görə ki, köhnə kişilərin kişi xarakteri var idi. Onlar öz şəxsiyyətlərini həmişə uca tutar, özlərini həmişə urvatda saxlayardılar. O qeyrət, o ucalıq da yurdu-yuvanı, dili, torpağı, adət-ənənəni qorumaq üçün kifayət edərdi. Böyük sənətkarımız, ustad aşığımız, laylası-havacatı yaddaşlara möhür vuran Aşıq Kamandar Bakıda evimin əziz qonağı idi. Ustadın adına layiq adamlar dəvət eləmişdim məclisə. Xalq şairi Osman Sarıvəlli, böyük filosof alimimiz Camal Mustafayev də buradaydılar. Aşıq, əstəğfürullah, llahlıq eləyirdi. Məclisin şirin yerində aşıq Kamandardan xahiş elədim ki, bir "Mina gəraylı" oxusun. "Baş üstə" deyib, ustad ilahi bir ləngərlə üzulişünas şair Sabir Borçalının "Qalacaq" rədifli gəraylısını oxumağa başladı:

Kərəm yandı, külü qaldı,
Şairdən də söz qalacaq.
Sabirin də balası var,
İz üstündən iz qalacaq.

Şeirin tapşırmasını oxuyanda sonuncu beytdə "bala" sözünü işlətmədi, tamam ayrı bir ifadə işlətdi. Mən

o saat aşığın üzünə baxdım, işarə vurdum ki, niyə səhv oxudun? Aşıq mənə işarə verdi ki, üstünü vurma. Məclis tamama yetib, camaat dağılandan sonra, ikimiz başbaşa qalanda dedim:

– Ay ustad, səni heç vaxt şeiri səhv oxuyan görməmişəm. Bəs orada niyə səhv oxudun?

Böyük ustadın böyük sözü məni daxilən elə gözəlləşdirdi ki, elə bil mələk mərtəbəsinə ucaldım. Aşıq mətləbi xırdaladı ki, məclisimizdə neçə illərdi uşağı olmayan, sonsuz filankəs var idi: “Mən “bala” sözünü işlətsəydim, onun yarasına toxunardım”. Bu böyük mədəniyyət qarşısında ustada baş əydim. Bu da sənətkar şəxsiyyətinin bir gözəl nümunəsi. Bu yerdə böyük Kamandarın ruhu yəqin məndən bir şeir istəyəcək, mən də onun bu arzusunu yerinə yetirirəm:

Əkdiyin gülləri, gəzdiyin bağı,
Bağban ol, doyunca qoxla, Kamandar!
Vaxtsız ayrılığı, vədəsiz köçü,
Sazın ovsunuyla oxla, Kamandar!

Zaman yağdırsa da saça qarını,
Vermisən ellərə eşqin barını,
Tərlan duruşunu, şah vüqarını,
Hər zaman beləcə saxla, Kamandar!

Dil ver avazınla lal qayalara,
Dilindən süzülsün bal, qayalara,
Taleyin bənzəsin sal qayalara,
Nə əyil, nə də ki laxla, Kamandar!

Ruhunla Qorqudtək qocalardasan,
Ahınla tüstülü bacalardasan,
Bəndə dərgahından ucalardasan,
Tanrı dərgahını haxla, Kamandar!

Əsən küləklərlə yarışmağı var,
Sellərə, sulara qarışmağı var,
Şairdi, küsməyi, barışmağı var,
Hərdən Zəlimxanı yoxla, Kamandar!

Günlərin bir günü telli sazı Tanrı dərgahına qaldıran Aşıq Əmraha sual verdim: "Ustad, çox gənc vaxtlarımda siz məclislərdə mənim şeirlərimi oxuyurdunuz. Onda məni çox az adam tanıyırdı. Mən kim idim ki, siz o şeirləri o qədər şövqlə oxuyurdunuz?" Ustad öz şəxsiyyətinə və sənətkarlığına layiq cavab verdi:

– Sənin kim olduğunu dərindən bilməsəm də, özümün Aşıq Əmrah olduğumu yaxşı bilirdim. Ürəyimə yatmayan sözü dilimə gətirmərəm, oğul! Burda başqa bir mətləb də var. Bir də baxdın məclisdə sifariş verdilər ki, Zəlimxandan bir söz oxu, mən desəm ki, "bilmirəm", onda sənin Zəlimxanlığın bir şey itirməsə də, mənim Əmrahlığım itirər. El ağzı – fal ağzı. Orda-burda danışacaqlar ki, Aşıq Əmrah filan şeiri bilmədi, heç ndan gözləməzdik. Aşığın dilindən gərək "bilmirəm" kəlməsi çıxmasın. Özündən əvvəlki xəzinəni də, öz dövründə o xəzinəyə əlavə edənləri də xalqa çatdırmaq onun borcu və vəzifəsidir, oğul!

Bərəkallah, ustad!

Məclislərin birində aşıqlardan biri sazda havacatı dolaşdıranda mən bu şeiri təsadüfən yazmamışdım ki:

Yandırsın canımı çaldığın hava,
Kərəmin ağzından çıxan ah kimi.
Əlli il taxtaya, simə döyüncə,
Bircə gün sazını çal Əmrah kimi.

Ustadlar xalqın bərəkəti, ruhunun və qəlbinin əkssədası, duyğularının əvəzolunmaz tərcümanıdır. Aşıq Əmrah saz haqqında yazdığı məşhur divanisində saza münasibətini çox gözəl açıqlamışdı:

Abad məclis arasında dövran quran bu sazdı,
Arif kəslər qiymət verən, başda duran bu sazdı.
Anlamaza söz verməyən, qanana nökər olan,
Yaxşı gündə dost köyünə uçub varan bu sazdı.

Mənasını bilməyənə bu sənət sənət deyil,
Avazını dadmayanın məkanı cənnət deyil,
Abadlığı çox sevəndi, həm də müxənnət deyil,
Öz elminə sadiq olan, uzaq görən bu sazdı.

İmran dilli telli sazım cəm edib on bir simi,
Harda ondan söhbət düşsə, dostum çəkər bəhsimi,
Əlli ildi sinəm üstə şən edən məclisimi,
Aşıq Əmrahın əlində xallar vuran bu sazdı.

Qışın oğlan çağlarıydı. Yenə Aşıq Əmrah bizim evdə qonaq idi. Özünə yaraşan kişilər onun sazının, söhbətinin sehrinə düşmüşdülər. Məclisə gələnlərin içərisində tarı yaxşı bilən və yaxşı çalan bir alim də gəlmişdi. Açığını deyim ki, onun Aşıq Əmrahın hüzuruna tarla gəlməyi ürəyimizdən olmamışdı. Ona görə də məclisin şirin yerində ustaddan xahiş elədim ki, Əmrah dayı, bir "Şur" muğamını çal, zəhmət olmasın. Sazı "Şur" muğamı üstündə kök lədi, elə çaldı ki, məclisdəkilərin heyrəti, heyranlığı ilahi bir tamaşa yaratdı. Onların çoxu bilmirdi ki, Aşıq Əmrah muğamları sazda bu qədər gözəl çalır. Ustad "Şur"u tamamladı, "Kəsmə şikəstə"yə bir ayaq verib, sonuncu təzənəni elə çəkdi ki, bütün ürəklərin sarı simi titrədi. Buydu böyük sənətkarın böyüklüyü. Mən bu yerdə özümü saxlaya bilməyib Aşıq Əmrahın şərəfinə elə oradaca bədahətən gələn bu qoşmanı oxudum:

Qışın oğlan vaxtı bir hava çaldın,
Açıldı qəlbimdə yaz, Əmrah dayı!
Bulaqlar qaynadı, gözlər süzüldü,
Gözəllər eylədi naz, Əmrah dayı!

Min ömür uzadıb, ömür üzməyib,
Yersiz oynamayıb, yersiz süzməyib,
Usta bağlamayıb, zərgər düzməyib,
Sənə Haqdan gəlib saz, Əmrah dayı!

Adın bir şöhrətdi obaya, elə,
Zəlimxan adına nə yazıb hələ?
Min il yaşasan da sən innən belə,
Az olar, yenə də az, Əmrah dayı!

Sözümü qurtarıb üzümü tarla gələn dostumuza tutub, indi söz sizindir, götürün o mübarək tarı, bir az da muğama qulaq asaq deyəndə, qonaq ayağa durub ustada baş endirdi ki, məni bağışlayın, bilsəydim Aşıq Əmrah muğamı da belə gözəl çalır, mən bura tarla gəlməzdim. Ustadı bağrına basıb üzr istədi ki, mən bu kişinin yanında ömrümdə tar çalmaram.

Bəli, böyük sənətkarlar yüz il də yaşasa, yenə azdı. Çünki onların ömrü-günü, varlığı birbaşa xalqın var olmağı deməkdir. Onların zarafatı da, atmacası da, xalları-gülləri də sağlam toxuma dönür, elin ürəyində bərəkət kimi, məhəbbət kimi göyərir.

Borçalı mahalının bəxtəvərli günləri, qazan kimi qaynayan vaxtlarıydı. Ağır ellərimizdən biri olan Sadaxlı kəndində böyük bəstəkarımız Niyazinin 70 illiyi keçirilirdi. Söz Aşıq Əmraha verilmişdi. Ustad "Ruhani" havasını çalırdı. Aşıq Əmrah bu havanı o qədər şövqlə, coşqun, havalı bir vəziyyətdə çaldı ki, bütün məclis ayağa qalxdı. Alqışdan yer-göy titrəyirdi. Xalq sakitləşəndə Niyazi böyük heyranlıqla dedi: "Əmrah kişi, eşq olsun səni yetirən xalqa, elə-obaya! Əgər mənim imkanım olsaydı, sənin barmaqlarını qızıla bələyərdim". Bəstəkarın bu sözü yenə coşqun alqışlarla qarşılandı. Bu yerdə Aşıq Hüseyn Saraçlı üzünü böyük bəstəkara tutub dedi: "Niyazi müəllim, eşitmişəm Amerikadan

gələndə sənə bir qızıl çubuq veriblər. Onu əridə bilsən, Əmrahın da, mənim də barmaqlarıma çatar, indi mənim barmaqlarım qızılsızmı qalsın?" Məclisdə alqışla gülüş bir-birinə qarışdı. Niyazi hər iki aşığı bağrına basıb, "ən qiymətli qızılımız sizsiniz, siz qızıl yox, qızıl külçəsisiniz" – dedi. İki böyük el sənətkarı haqqında bu sözləri bütün dünyanın salonlarını titrədən, ecazkar musiqisi ilə dünyanı heyrətə salan Maestro Niyazi deyirdi.

...Bir mötəbər məclisdə iki aşıq üz-üzə çalıb-oxuyurdu. Mötəbər məclisin də mötəbər aşıqları olmalıydı. Nəysə... qismətdən bu dəfə vəziyyət başqa cür alınmışdı. Məclisdə ariflər, asğaqqallar, əhli-hallar, "sarı yağdan tük çəkənlər" əyləşmişdilər. Aşıqların təhər-töhrünə, barmağına, boğazına fikir verdilər ki, nə barmaq yerindədi, nə də boğaz. Aşığın biri də yerli-yersiz "ölürəm, ölürəm" deyib baş qatmaqla məşğuldu. Ağsaqqallar təmkinini pozmur. Dəli-dolu bir cavan özünü saxlaya bilmir, ayağa durub aşığa söz atır ki: "Aşıq, sən niyə ölürsən, səni gətirib bura çıxardan ölsün". Məcbur olub mən də üzümü sözü-söhbəti dolaşdıran aşığa tutdum:

Aşıq, oxuyursan, yaxşı söz oxu,
Deməyə mənalı söz qəhətdimi?
Yoxsa kəramətin, çıxma meydana,
Başına bükməyə bez qəhətdimi?

Ustad meydanına girməsin çağa,
Aşığın dilindən gərək dürr yağa,
Çıxmağı bilmirsən, dırmaşma dağa,
Yeriş yeriməyə düz qəhətdimi?

Sənətkar sevəndir kamil ustadı,
Kamil ki deyilsən, batırma adı.
Yoxsa sözlərinin ləzzəti, dadı,
Gözünə qatmağa duz qəhətdimi?

Aşıq sənətini urvatdan, dəyərdən, gözdən salanlar olsa da, bu sənətə başucalığı, ölməzlik, əbədilik gətirən ustadlarımız bu vaxta qədər olub, bundan sonra da olacaq.

El arasında söz var: "Payız gəlib, toylar başlanıb". Hamı istəyir ki, toy məclisi şərəfli keçmək üçün məşhur sənətkarları, ustad aşıqları gətirsinlər öz məclislərinə. Deyirlər, gedin Aşıq Əmrahı gətirin, cavab gəlir ki, həmin günə Əmrah filan kənddə filankəslə behləşib, gələ bilməyəcək. Deyirlər, gedin Aşıq Kamandarı dəvət edin. Ordan da buna bənzər bir cavab gəlir.

Deyirlər, gedin Aşıq Hüseyn Saraçlını çağırın. Ordan da xəbər gəlir ki, filan ağanın oğlunun toyudu, aşığı ora aparıblar. Toy yiyəsi pərt olur. Naçar qalıb əldə ölən, divdə qalan bir aşıq adı çəkir ki, cəhənnəmə, gedin filan aşığı gətirin. O zamandan xalq arasında "cəhənnəm aşığı" adlı bir söz formalaşıb. Bəli, cəhənnəm aşığı nə qədər olur olsun, dəxli yoxdur. Xalqın könül dünyasını cənnətə döndərən kamil ustadlar Dədə Qorquddan, Qurbanidən, Yunis Əmrədən, Dadaloğlundan, Aşıq Veysəldən, Xəstə Qasımdan, Abbas Tufarqanlıdan, Alıdan, Ələsgərdən, Bozalqanlı Hüseyndən, Dədə Şəmşirdən, Əmrahdan, Kamandardan, Hüseyn Saraçlıdan, Cəlildən, Qəhrəmandan, Əsəddən, Mirzədən, İmrandan, Əkbərdən, Mikayıl Azaflıdan, Xanlardan, Bilaldan, Pənahdan, Şakirdən, Aşıq Ədalət başda olmaqla bu gün yaşayan sənətkarlara qədər Tanrı vergisi, ilahi sovqatı olan böyük sənətkarlar İsrafil surunu çalana qədər xalqımızla yol gedəcəklər. Cəhənnəm aşıqlarından fərqli olaraq cənnətməkan aşıqlar o aşıqlardı ki, bizim ruhumuzu zaman-zaman cənnət kimi ətirli və təravətli saxlayıblar.

Dədə Qorqud, Xəstə Qasım, Qul Abbas,
Torpağımda ustad da var, el də var.
Saza dədə, sözə xəstə, eşqə qul,
Ömür də var, könül də var, dil də var.

Bilən bilir zildə nə var, pəs nədir,
Zərif xallar aləm deyil, bəs nədir?
Kim bilməsə hava nədir, səs nədir,
Qandırmağa mizrab da var, tel də var.

Əziz tutdum babaların xətrini,
Dünya bildim kəlməsini, sətrini,
Qış günü də bilən bilir ətrini,
Söz bağında çiçək də var, gül də var.

Günlərin bir günü yenə bizim evdə şirin-şirin söhbət edirdik. Yurddan-yuvadan, eldən-obadan, dostdan-tanışdan, yardan-yoldaşdan danışa-danışa ustad yaddaşının kitabını vərəqləyirdi. Dost söhbəti gələndə dedim:

– Ustad, əlli il içində insanlığa, yoldaşlığa ən çox layiq olan, yadda qalan kim oldu səndən ötrü?

Fikirləşmədən Xındı Məmmədin adını çəkdi. Dedi:

– Oğul, "Mən qocaman bir aşığam, meydanda mərdi-mərdana" deyən kişi mərdana aşığıydı. Çox şirin aşıq və gözəl insan idi. Balaca boylu, eşmə bığlı bir kişiydi.

Amma di gəl ki, Koroğludan oxuyanda boyu Çənlibeldən uca görünürdü. Allah onu Koroğlu havaları üçün yaratmışdı.

Otuzluq lampanı keçirdiyini öz gözlərimlə görmüşəm. Ay qardaşoğlu, o ki adını çəkdin, qoy onun bir pambıq məsələsi olub, onu danışım, Xındı Məmmədin ruhu şad, sənin də canın sağ olsun.

Aşıq Əmrahın ustadı Aşıq Məsim Yadigarovla Xındı Məmməd möhkəm dost olublar. Bir gün Aşıq Məsim deyir: "Məmməd, neçə illərdi deyirik, sözümüzə əməl edə bilmirik. Gəl bu yay işi-gücü ataq, iki ay sərbəsər yaylaqda dincələk". Razılaşırlar. Vədə gəlib çatanda Aşıq Məsim yaylağa çıxır, Xındı Məmməd çıxa bilmir. Səbəb də bu olur ki, o ili Xındı Məmməd çoxlu pambıq əkir, işin-gücün çoxluğundan yaylağa çıxa bilmir.

Allahdan olan kimi, möhkəm yağarlıq olur, alaq pambığı basır. Aşıq alağın öhdəsindən gələ bilmir. Bu məsələni eşidən Aşıq Məsim dağdan arana, dostu Xındı Məmmədə görək nə yazır, Xındı Məmməd nə eşidir?

Məndən salam olsun Xındı Məmmədə,
Niyə əkdin başa bəla pambığı.
Gedəndən, gələndən xəbər alıram,
Deyillər basıbdı ala pambığı.

Aşıq ruzusunu istəyər Haqdan,
Pambıq edəcəkdi səni var-yoxdan.
Beş-altı adam tap, getsin qabaqdan,
Bəlkə köməkləşib yola pambığı.

Aşıq Məsim dəryalara dalarsa,
Şirin canı eşq oduna salarsa,
Beş gün bundan sonra yağar olarsa,
Keçirə bilməzsən pula pambığı.

İllərlə məclislərdə bu şeiri bəzəyə-bəzəyə o qədər könüllər açıb, ruhlar oxşamışıq ki...

Xətrini əziz bildiyim ustad babalarım yetişdirdi Aşıq Hüseyn Saraçlını. Ululardan gələn yollar onun özünü də ululara qovuşdurdu. Bu yol sevgi yolu, məhəbbət yoluydu. Qarşıdan sənət yolu gəlirdi. Kimlər imtahan vermədi, kimlər sınağa çəkilmədi, kimlər zəhər quyusuna salınmadı, kimlərə tilsim düyməsi tikilmədi, kimlər itilənmiş qılınclara tuş gəlmədi, kimlər səhralara, çöllərə düşmədi, kimlər dara çəkilmədi, kimlər külüngü öz başına çalmadı eşqin, sevginin, məhəbbətin enişli-yoxuşlu yollarında? Bu tale yollarında muraza çatan da çox oldu, murazı gözündə qalan da. Qovan da Allahı çağırdı, qaçan da. Bu yolun yolçularından biri də Aşıq Hüseyn Saraçlı oldu.

Dedilər: “Ay aşıq, bu nə yoldu sən tutub gedirsən, məhəbbətdə muradına çatdın, biz də “şükürlər” dedik. Ancaq sənətdə muraza çatmaq olmur, gəl bu yoldan qayıt. Bu yolun dar keçidi, sərt uçurumu, dərin yarğanı, qıl körpüsü, qır qazanı, sorğu-sualı var. Bu yolun qıfılbəndi, müəmması, hərbə-zorbası, deyişi-döyüşü, sehri, ovsunu, bağlaması, tapmacası, təpməcəsi var, Allaha bax, gəl bu yoldan qayıt”.

Aşıq dedi: “Xeyr, elə şey yoxdu, məni öz sevgimə, məhəbbətimə yetirən kişi, öz sazıma, sözümə, elimə – yoluma da yetirəcək”.

Aşıq sözlə dediyi kimi, sazla da mətləbi mənzilə çatdırdı, görək necə çatdırdı:

Aman lələ, tanıyıram yolları,
Bu yol mənə ərən yolu, ər yolu.
Biri xeyrə, biri şərə çağırar,
Allah yolu, iblis yolu, şər yolu.

Nəyə lazım sandıq dolu xəzinə?
Qızıl üstə qızıl ilan gəzinə.
Mən düşmüşəm həqiqətin izinə,
Gərək deyil sərvət yolu, zər yolu.

Hər bir kəsin əməli var, işi var,
İştahı var, tamahı var, dişi var,
Aşiqlərə meydan verən kişi var,
O göstərər bəndəsinə hər yolu.

Saraçlıyam, yaralarım bitişər,
Can bağında şux bülbüllər ötüşər.
Bir gün gedib Yaradana yetişər,
Sənət yolu, zəhmət yolu, tər yolu.

“Kişi gərək zəhmət çəksin, tər salsın” deyib sözümüzün dədəsi Aşıq Ələsgər. O kişi sənət yolunda gör bir

nə qədər zəhmət çəkib, başına nə müsibətlər gəlib, yenə sazından-sözündən dönməyib. Bir gün Ələsgərə dedilər ki, ay ustad, yerin-göyün yeddi qatından xəbər verirsən, de görək səni kimi oğulları analar bir də doğacaqmı?

Ustad cavabında demişdi:

Aşıq Ələsgərəm, azdı kamalım,
Vacibdi ki, bir ustaddan dərs alım,
Oxudum, öyrəndim, oldu öz malım,
Bizdən ustadlara nəfi – rəhmətdi.

Əgər o kişi belə deyirsə, mən o dənizin heç bir damlası da deyiləm. Elə Ələsgər kimi kişilərə güvəndiyimə görə heç bir çətinlikdən qorxmuram.

Su girdi qaba, oldu içməli. Sevgilisi Şahsənəmə vurulanda anasından xeyir-dua istəyən oğul, aşıqlığa başlayanda Allahından xeyir-dua istədi:

Gözüm göydə, əlim Haqda,
dizim torpağındadı,
İmkan vermə bu yollarda
azım, ey Pərvərdigar!
Ürəyinə toxunmasın,
xatirinə dəyməsin,
Dar günümdə olsa sənə
nazım, ey Pərvərdigar!

Sənsiz əlim tərpədəmməz
nə pərdəni, nə simi,
Yola döndər cığırımı,
zilə döndər pəsimi.
Bəri başdan aydın elə,
eşitməsən səsimi,
Öz əlimlə öz qəbrimi
qazım, ey Pərvərdigar!

Hara getsəm əsirgəmə
tamaşamı, seyrimi,
Hər nə varsa səninkidir,
gəzmirəm öz xeyrimi.
Kəlmə-kəlmə özün göndər
dastanımı, şeirimi,
Mən də bir-bir qələm tutum,
yazım, ey Pərvərdigar!

Özün bəzə söz adlanan
gövhərimi, ləlimi,
Özün gözlə məclislərdə
ağıllımı, dəlimi.
Bircə dəfə ətəyindən
üzmüş olsam əlimi,
Bircə anda qışa dönsün
yazım, ey Pərvərdigar!

Doğan Günəş, əsən külək,
yağan qar Allah desin,
Qoy səsimi ənginlərə
çəksin car, Allah desin.
Əlim, dilim, şeirim, sözüm,
hər nə var, Allah desin,
Eşqin ilə qoy dillənsin
sazım, ey Pərvərdigar!

Qadir Allah elə bil ki, Aşıq Hüseyn Saraçlını bu dünyaya hazır aşıq libasında gətirmişdi. Uca boyu, düz qəddi, incə beli, enli kürəyi, şəvə, qara eşmə bığları, səliqəli, gümüşü saçları, çopura çalan qara sifəti, açıq alnı, qonur gözləri, incə yerişi, ağayana duruşu, turşməzə, baldan şirin danışığı, buxara papağı, sallama, gümüş kəməri, par-par parıldayan qara, xrom çəkməsi, Trabzon tütünündən dolu tənbəki qutusu – hamısı bir

yerdə ona xüsusi yaraşıq və gözəllik verirdi. Özü demişkən, ilahinin əlinin boş, meylinin xoş vaxtına düşüb kişilərin gözəli kimi onu qüdrət qələminnən çəkmişdi. Allahın əziz bəndəsiydi. Tanrı onu xoş gündə, xoş saatda dünyaya gətirmişdi.

Ona görə də ozanların, ustadların getdiyi yolun yolçusuna çevriləndə Allaha doğru əl açdı, sözünü dedi. Allah da ondan bir sənətkar kimi heç nəyi əsirgəmədi.

* * *

Bir gün qeybdən səda gəldi ki, ey mənim əziz bəndəm, sənə uzunömürlü bir sənət verirəm, dünya durduqca səni yaşadan bir məhəbbət verirəm, sağlam ömür, uca boy, uca qamət verirəm. Qılınc qədər kəsərli iti yaddaş verirəm. Səni torpağa oğul, yurda qardaş verirəm. Zaman-zaman susmayan sədəfli saz verirəm, yeri-göyü titrədən nərə, avaz verirəm. Yollara çıx, hərəkət elə, hara getsən, o yeri xeyir-bərəkət elə. İşini haqnan tut, sənə olan arzumu döndər həqiqət elə. Artıq bu iş hamıya əyandı, mələkləri göndərib tapşırığımı vermişəm. Yaz açılıb, gül gülü, çiçək çiçəyi çağıranda, ellər-obalar, məclislər, səfərlər də səni çağıracaq. Ellərin elçisinə, yolların yolçusuna dön. Çal-oxu, ağlat-güldür, qayna-qarış, yaşa-yarat. Ömrü də, bəxti də, qisməti də verən mənəm. Alın yazısını yazan mənəm. Mən sənə uğurlu və uzunömürlü bir sənətkar, ozan-aşıq taleyi yazmışam. Yaşa bu taleyi axıra qədər. Hərəkət səndən, bərəkət məndən. Bir halda ki, bu mətləblər sənə əyan oldu, əsas bir tövsiyəmi, nəsihətimi də ömrün boyu qulaqlarında sırğa elə, as. Əgər bu dediklərimə əməl eləsən, həmişə hər yerdə bütün sınaqlardan qalib çıxacaqsan. İndi deyəcəyim tapşırıqlara əməl eləməsən, heç mən də sənə kömək edə bilmərəm.

Elə ki saz götürdün, meydana çıxdın, şanın-şöhrətin getdikcə çoxaldı, varın-dövlətin, sənətin-şəxsiyyətin,

adın-sanın ellərə yayıldı – müsibətli günlərin bundan sonra başlanacaq. Əsas dözüm, səbir, təmkin, iradə bundan sonra sənə lazım olacaq. Sənin ömrün alqışla qarğışın, sevgiylə nifrətin, həqiqətlə yalanın, xeyirlə şərin, ağıllı sözlə dedi-qodunun, qohumla yadın arasında dağ çayı kimi özünü dağa-daşa çırpa-çırpa, vurnuxa-vurnuxa davam edəcək. Səni öz içindən özününkülər yeməyə, didməyə başlayacaq. Səni yaxından tanıyanlar, sağlığına badə qaldıranlar, ailənin içini bilənlər, paxıl qonşular, rəzil qohumlar hədəfə götürəcək. Sən heç vaxt düşmən qazanmaq istəməyəcəksən. Amma səni düşmənli eləmək, isti yerini soyuq eləmək üçün qurban kəsməyə, barmağına xına yaxmağa hazır olanlar tapılacaq. Sənə düşmən qazandıran, paxılları çoxaldan xalq olmayacaq, zününkülər olacaq. Öz “dostların”, gündə oturub-durduğun, üzünə gülüb, ayağının altını eşənlər olacaq. Sən neyləmisən, sənin düşmənin kimlərdi ki, səni pis günə salmaq istəyirlər? Sənin heç bir günahın olmasa da, ən böyük düşmənin özünsən. Mənim sənə bağışladığım şirin səs – bir düşmən, bu səsdən onlara verməmişəm. Bu sağlam can, bu boy-buxun – bir düşmən, bu yaraşıq onlarda yoxdur. Göydə quşları dayandıran şirin avaz – bir düşmən, bu avazdan onlarda yoxdur, verməmişəm. Səni ozanlar ozanı eləmişəm, bu, bir düşmən, bu keyfiyyə ləri onlara verməmişəm, səbəbini özüm bilirəm niyə verməmişəm. Min illər boyu yol gələn paxıllıq, rəzillik heç vaxt ikincilərə, üçüncülərə tuşlanmır. Birincilərə, boyu görünənlərə, səsi eşidilənlərə, Allah vergisi olanlara tuşlanır, oğul! Meşədə min ağac var, ildırım həmişə palıdı vurur. Barlı ağaca tolamazlı atarlar. Qarğanı yox, qartalı gülləyə hədəf seçirlər. Çirkini yox, dünya gözəlini dedi-qodu hədəfi edirlər, oğul!

Quranda belə bir mübarək mətləb var. Allah kainatı yaradanda yeddi qat yerdən, yeddi qat göydən ibarət yaratdı. Cənnətin yeddinci qatına daxil elədiyi insanlara

dörd peyğəmbərin ən aliməqam sifətlərini verdi. Davud peyğəmbərin səsini, Ləhni-Davud avazı deyilən avaz verdi. Yusif peyğəmbərin gözəlliyini verdi. İsa peyğəmbərin yaşını verdi. Məhəmməd peyğəmbərin əxlaqını verdi. Ancaq insanlar neylədi? Davudun bədəninə qurd yeritdi, Yusif peyğəmbəri quyuya saldı, İsa peyğəmbəri çarmıxa çəkdi, Məhəmməd peyğəmbəri daşqalaq elədi. Ancaq Allahın böyüklüyündən nə qurd qaldı, nə quyu qaldı, nə çarmıx qaldı, nə daşqalaq qaldı. Qalan – dünyanın, tarixin istiqamətini dəyişdirən, insanlığa "Tövrat"ı, "Zəbur"u, "İncil"i, "Quran"ı – Allahın kitablarını çatdıran peyğəmbərlər oldu.

Cəhənnəmin yeddinci qatına da ən alçaq, ən şərəfsiz, ən əxlaqsız adamları daxil elədi, onların da taleyi hamıya bəllidi. Budur tarixin min illər boyu gələn böyük həqiqəti.

Davudun bədəninə qurd yeridən də, Yusifi quyuya saldıran da, İsanı çarmıxa çəkdirən də, Məhəmmədi daşqalaq elətdirən də bu rəzil insanların işləridi, oğul! Peyğəmbər olanlara peyğəmbər olmaq istəyən, ancaq peyğəmbər ola bilməyənlər qənim kəsilir, oğul!

Xeyirin yanında Məhəmməd vardısa, şərin yanında Əbu-Sufyan var idi. Ədalətin yanında Həzrət Əli vardısa, xəyanətin yanında Mərvan var idi, İmam Hüseynin yanında Haqqın səsi vardısa, Yezidin, Şümürün yanında iblisin hiyləsi, fitnəsi var idi, oğul!

Çox uzağa getməyək. Lap elə yaxın tarixlərə baş vuraq. Cavidi, Əhməd Cavadı sürgünə göndərən, Müşfiqi bir gecənin içində qanına qəltan eləyən, Səməd Vurğunu əlli yaşında həyatdan ayıran bir yandan qanlı rejim idisə, bir yandan da ilana ağı verən kərtənkələlər, böyük şöhrət sahibi, məhəbbət sahibi olan şairlərin böyük sənət sahibi olmayan qələm dostları idi. "Peyğəmbər"i yazan Cavidi peyğəmbərin ozamankı, bugünkü düşmənləri sürgünə göndərdi. "Çəkdiyim ağrılar bir

yana dursun" deyən Səməd Vurğunun başına gələnləri Allah heç bir şairin başına gətirməsin. Onu bu gün adı it dəftərində olmayanlar çərlətdi. "Nəydi o yazığın, nəydi günahı, indi çöllərmidir onun pənahı?.. "

Kürəyə bıçaq vuranlar, iblislər, şeytanlar, həşəratlar, sürgünlər, güllələnmələr qalmadı, qalan Cavidin, Əhməd Cavadın, Müşfiqin, Səməd Vurğunun böyük şairliyi, uca şəxsiyyətləri oldu.

Paxıllığa tuş gəlib
gur ocaqlar sönəndə,
Canda saxlamaq olmur
gözdən axan yaşları.
Xəbislərin niyyəti
hücuma çevriləndə
Artır, günbəgün artır
ürəyin təlaşları.

Nə çoxdu bu dünyada
küsdürənlər, küsənlər,
Başı gedən imamlar,
zəhərlənmiş Həsənlər.
Özgələr deyildi ki,
kəndirini kəsənlər,
Yusifi dar quyuya
kim saldı? Qardaşları!

Şah hökmü, vəzir kini
bıçağı daşa çəkdi,
Sevənlərin bəxtini
bahardan qışa çəkdi.
Ayrılığın, həsrətin
əlindən haşa çəkdi,
Abbas göydə tanıdı
Gülgəz atan daşları.

Əgər bülbül susursa,
demək, orda qarğa var,
Bir damla göz yaşında
bir nisgilli dərya var.
Bil ki, içərisində
tufan var, qasırğa var,
Buludtək çatılanda
bir igidin qaşları.
Ömrü boyu güvənib
Tanrı adlı yarına,
Dar gündə, dar ayaqda
sevgi gəlib karına.
Toxunmaq istəyiblər
əyilməz vüqarına,
Əymək üçün kəsiblər
əyilməyən başları.

Həmişə yadında saxla. Gördün ki, düşmənlər artır, dedi-qodular çoxalır, yaxşını qoyub yamanını danışanlar bir-birinə züy tutur, haqqın danılır, həqiqətin tapdanır, onda qətiyyən vaxtını sərf edib onlara izahat verməyə çalışma! Gücü sazına-sözünə, ilhamına, sevginə, məhəbbətinə ver. Böyük Nizaminin şah misraları qoy sənə həmişə güc versin, dayaq olsun.

Təmkinli oturmağı
etdiyiyçün dağ peşə,
Mötəbərdi yerində
varlığıyla həmişə.
Dənizə min çay axar,
o yenə sakit durar,
Arxa bir sel gələndə
çalxanıb ləngər vurar.

Qoy sənin ən böyük döyüşün və mübarizən daha da qaynasın, ilhamın, coşan qəlbin, çağlayan havan-hava-

catın olsun. Bütün çirkin dedi-qoduları zaman bildirki qar kimi əridib sellərin-suların ağzında daşlara, qayalara çırpacaq.

Düşmənlərinə de ki:

Ey rəzil, yumşalan deyiləm qəti,
Sən dəyirman daşı, mən bir dən olsam.
Təzə deyiləm ki, könül xam düşə,
Çoxdan üyünərdim, üyünən olsam.

Acı sözdən, yaman gözdən, pis üzdən, köntöy baxışdan, bədnəzərdən, bayquş nəfəsdən qorunmağın yeganə xilas yolu Haqqa tapınıb, həqiqətin səsinə səs verib, ağılla iş görməkdir, oğul.

Allah Aşıq Hüseynin səsini, Aşıq Hüseyn də Allahın səsini eşitdi. Bu söhbətdən sonra ömrü boyu Tanrıdan verilən bu tapşırıqlara qulluq elədi, ömrü boyu qul oldu bu səsin qulluğunda.

Göylərdən gələn, buludlardan enən, mələklərin qanadında aşığa çatdırılan bu səsdən, sədadan sonra aşıq necə havalanmasın? Aşıq həyatında ilk dəfəydi Allahından və özündən əmin-arxayın şəkildə ürək sözlərini eşidənlərə, onu dinləyənlərə çatdırırdı. Hara getsə, onu bu səs aparırdı, hardan gəlsə, onu bu səs gətiridi. Ömrünün axır gününə qədər, qəbir evinə qədər bu səs onu idarə elədi, qorudu, yaşatdı.

Beləliklə, Aşıq Hüseyn Saraçlı Haqdan gələn səsə Haqqın eşqiylə öz səsini qatıb aşıqlığını ellərə görək necə bəyan elədi:

Səda gəldi İlahidən,
mənə buyruq verildi,
Yaradanın eşqi ilə
yollar yoran mənəm, mən.

Ürfan əhli dediyimiz
ərənlərin yolunda
Daş qaldıran, qaya çapan,
dağlar yaran mənəm, mən.

Haqq deyənə qəlbim açıq,
yuva kimi istiyəm,
Haqsızlara qapım bağlı,
kor gözlərə tüstüyəm,
Sevənlərin sirdaşıyam,
doğruların dostuyam,
Nadanların başı üstə
tüpü, boran mənəm, mən.

Aşiq nədi, aşıq nədi,
ocaq nədi, pir nədi,
Adı min bir olan nədi,
sevdiyimiz Bir nədi,
Zaman-zaman açılmayan,
bağlı qalan sir nədi, –
Suallara cavab verən,
sorğu soran mənəm, mən.

Qovrulmuşam, sovrulmuşam,
səhradakı qum kimi,
Əkilmişəm, səpilmişəm,
bərəkətli şum kimi,
İllər boyu damla-damla
ərimişəm mum kimi,
Yerdə işıq, aranda dağ,
dağda aran mənəm, mən.

Hara düşsəm o yerlərin
şəhəriyəm, kəndiyəm,
Enişiyəm, yoxuşuyam,
bərəsiyəm, bəndiyəm,

Həm müridəm, həm mürşidəm,
qaziyəm, əfəndiyəm,
Haqqı duyan, Haqqı görən,
Haqqa varan mənəm, mən.

Hər sənətkar ömrü son nəticədə divardan asılmış çoxgüllü, çoxnaxışlı bir xalıya, xalçaya bənzəyir. Xalça divardan asılana qədər hansı yolları keçirsə, sənətkar da həmin qaydada ömür yolunda son nəticəyə doğru – ölümə və ölməzliyə doğru gedir.

Bir anlığa xalçanı gözünüzün qabağına gətirin. Yun qırxılır, yuyulur, qurudulur, didilir, daraqdan keçir, daranır, cəhrədə əyrilir, düyçədən keçir, incəlir – ipə, nazilir – sapa dönür. Kələf kimi əllərə, dirsəklərə dolanır, kəndirdə, gün işığında qurudulur, boyanır, boyaqdan keçir, xanaya bağlanır, ərişə, arğaca, ilməyə dönür, toxunur, əllə sığallanır, kirkidlə toxunur, həvə ilə bərkidilir, çesnişi, çeşidi, xalı-gülü yerbəyer olur, nəhayət, qayçıyla kəsilir, xanadan azad olur. Sənət də belədir, sənətkar da. İşığını paylamalıdı, nurunu saçmalıdı, çeşidini-çeşnisini göstərməlidir.

Ömrünü-gününü məclislərdə, səfərlərdə, yollarda keçirən adamlar yaxşı bilir ki, həyatda insanın başına hər şey gələ bilər. Ona görə də hər çətinliyə sinə gərməli, hər şeyə dözməyə hazır olmalıdır. Əgər məclisdirsə – ağıllısı-dəlisi, arifi-nadanı, qananı-qanmazı var. Əgər yoldursa – enişi-yoxuşu, çalısı-çəpəri, daşı-çınqılı, qarı-boranı var. Əgər səfərdirsə – yaxını-uzağı, ölümü-itimi, gedər-gəlməzi var. Ağılın, dözümün, səbrin, düşüncənin sınağa çəkilməyi var. Bu deyilənlərə hazır olmasan, girmə o məclislərə, çıxma o yollara, getmə o səfərlərə. Məclisdə pərt edəcəklər, yolda büdrədəcəklər, səfərdə divlər, yeddibaşlı əjdahalar başına oyun açacaq.

Şükürlər olsun Allaha ki, mənim qəhrəmanım, ozanım, aşığım artıq bu şeylərə hazır idi, çünki buyruq Tanrıdan gəlmişdi.

Aşıq səfər tədarükünə başladı. “Qara tutun parası, dərdli sinəmin çarası” deyib sazbəndin yanına getdi. Əlinə, barmağına, ürəyinə yatan, ağlına batan, səsi fələklərə çatan, uzunqollu, durnaboğazlı, gensinəli, qara bir tavar saz götürdü. Saza nizam bir kök verib, təzənəni tellərə çəkəndə aşığın gözünə işıq gəldi. Sazbənd gördü ki, saz aşığın əlinə yatdı. Ürəklənib soruşdu ki, ay aşıq, saz xoşuna gəldimi?

Hüseyn Saraçlı üzünü sazbəndə tutub dedi:

– Sazbənd qardaş, bu sazların hamısı bir-birindən gözəldi. Pis desəm, ağzım əyilər. Ancaq mənim istədiyim saz bunların arasında yoxdu.

Sazbənd dedi:

– Aşıq qardaş, o necə sazdı ki, bu sazların arasında yoxdu?

Aşıq Hüseyn görək sazbənddən necə saz istədi:

Usta, mənə bir saz bağla, bağlamalar açarı,
Hər mətləbi yeddi qatdan qanan sazı ver mənə.
Gecə-gündüz Tanrı desin, Yaradannan oxusun,
Addımbaşı Allahımı anan sazı ver mənə.

Sazbənd olan yaxşı bilir nasaz nədi, saz nədi,
Pərdələrdə qarlı qış nə, çiçəklənən yaz nədi,
İşvə nədi, qəmzə nədi, cilvə nədi, naz nədi,
Can deyəndə canım olan, canan sazı ver mənə.

Ürəklərin çırpıntısı, könüllərin çarası,
Yetmiş yeddi dil danışsın qara tutun parası,
Məclisinə meydan olsun yerlə göyün arası,
Qartal kimi zirvələrə qonan sazı ver mənə.

Döyüş vaxtı şimşəklərin nərəsini andıran,
Deyiş vaxtı incə-incə mətləbləri qandıran,
Görüş vaxtı ürəkləri, dodaqları yandıran,
Yerdən-göydən atəş alıb yanan sazı ver mənə.

Sazbənd indi başa düşdü ki, bu aşıq cavan olsa da, çox danəndə, vergili adama oxşayır. Dedi: "Aşıq qardaş, evimlə dükanımın arası beş-on addımdır. Gözlə məni, dabanımın üstündə qayıdıram". Sazbənd dediyi kimi də elədi. Aşıq xəyaldan ayılana qədər sazbənd qara, tavar bir sazla dükana qayıtdı. Dedi:

– Aşıq Hüseyn, bu saz atamdan mənə yadigardı. O, mənə vəsiyyət eləmişdi ki, oğul, 50 il sazbəndlik elədim. Bu saz kimi dil-dil ötən saz görmədim. Bu, mənim öz əllərimdən çıxan şah sazımdı. Onu heç kəsə vermə. Nə vaxt bir Haqq aşiqi qapını döysə, onda bu müqəddəs əmanəti təmənnasız ona bağışlayarsan. Haqq aşiqinin əlində hər dəfə bu saz dilə gələndə, məzarda mənim ruhum şad olacaq. Aşıq qardaş, 30 ildi mən də bir sazbənd kimi atamın yolunu davam etdirirəm. Onun dediyi nişanları səndə gördüm. Birinci dəfədir ki, məndən saz istəyənin özünün də təpədən-dırnağa saz, nizam, gözəl, kamallı və vergili olduğunu gördüm. Şükür Allaha, axır ki, sənin şəxsində atamın vəsiyyətini yerinə yetirib yüngülləşdim.

Aşıq Hüseyn sazbəndi sazqarışıq bağrına basdı. Minnətdarlıq edib, ata sazbəndin ruhuna dualar oxuyub, oğul sazbəndə Allahdan uzun ömür arzulayıb, dükandan ayrıldı.

Sazbənddən ayrılıb, nalbəndin yanına gəldi. Köhlən atın nalları köhnəlib əldən çıxmışdı. Dedi:

– Nalbənd qardaş, uzaq bir səfərim var, atana rəhmət, əllərin ağrımasın, bir bu atı ifçin nalla, yola dözsün.

Nalbənd atın dırnaqlarını yaxşı təmizləyib, yonub, yontalayıb düzəltdi. Doğrudan da, çox ifçin nalladı atı. Nalbənd dedi:

– Aşıq, vallah, naldan ötrü eləmirəm, çalış heç vaxt bu atı daşlığa salma. Bu atın nə incə, nə gözəl ayaqları var. Onu qoru, lap sür dünyanın o başına, heç vaxt səni yolda qoymaz.

Nalbəndlə sağollaşıb, gəldi mehtərin yanına. Yəhəri, üzəngini, cilovu, qantarğanı yaxşı-yaxşı yoxlatdı. Mehtər də baxdıqlarının təzə, möhkəm olduğunu bildi və aşığı arxayın saldı ki, səfərdə heç bir narahatçılığın olmasın. Mehtərlə sağollaşıb gəldi çəkməçinin yanına. Bir neçə çəkməyə baxdı, ustanın əl işi çox xoşuna gəldi. Par-par parıldayıb, gözün işığını çəkən yaxşı bir çəkmə tikdirdi. Ayağına geyinəndə elə gözəl yaraşdı ki, aşıq dönə-dönə baxmaqdan doymadı. Çəkməçiylə alış-verişini qurtarıb, gəldi papaqçının yanına. Salam verib, əleyk aldı. Bir-bir papaqlara göz gəzdirdi. Nə söz ola bilərdi, hamısı göz oxşayırdı. Aşıq bir-bir papaqların qiymətini soruşdu:

– Qardaş, o papaq neçəyədir?

– 100 manat.

– O biri papaq neçəyədir?

– 150 manat.

– Bəs yuxarıdan asılan necə?

– 200 manat.

Aşıq özünü saxlaya bilmədi. Sözün yeri gəlmişdi. Dedi: "Papaqları baha verdiyin üçün hamısı mıxdan asılı qalıb". Bu sözə ikisi də gülüşdü. Papaqçı hal əhli, saz-söz adamıydı, bu dükanda o qədər maraqlı adamlar görüb, gözəl söhbətlər eşitmişdi ki, dedi:

– Aşıq qardaş, mənim üçün söz papaqdan bahadı. Bir halda ki, sən bu gözəl sözü işlətdin, əlini at, ürəyin istəyən, gözün tutan ən yaxşı bir papağı sənə peşkəş verirəm. Aşıq razılaşmadı:

– Xeyr, elə şey yoxdu. Sənin ona zəhmətin keçib, münasib qiymətini de, papağı götürüm.

Aşıq çox dedi, papaqçı az eşitdi. Papaqçı aşığın gözü tutan ən gözəl papağı Hüseyn Saraçlıya verdi. Aşıq bir də narazılıq eləmək istəyəndə papaqçı dedi:

– Aşıq, ürəklə sənə bağışlayıram. Bilirəm, o başın içində ağıllı sözlər çoxdu. Qoy mənim papağım sənin başını

qorusun, hər dəfə səndən ağıllı söhbətlər eşidəndə mən də qarpızdanım ki, baş başdısa, papaq da papaqdı, haaa!

Ovçular ova, səyyahlar səyahətə, dərvişlər ellərə-obalara, ozanlar məclislərə, aşiqlər uzaq səfərlərə necə hazırlıq görərsə, Aşıq Hüseyn Saraçlı da beləcə səfərə hazırlaşdı. Ovçunu da, səyyahı da, dərvişi də, ozanı da dar və dolama yoxuşlar, sərt aşırımlar, imtahanlı, sınaqlı hadisələr gözləyir.

Sağollaşıb papaqçıdan ayrıldı. Artıq səfər tədarükü görülmüşdü. Evə gəldi, Şahsənəm xanımdan xəbər aldı ki, mən səfərə gedirəm, de görüm, evin ehtiyatı yerindədimi? Unun-dənin, yağın-balın, şorun-pendirin, qarının-motalın, qovurman-basdırman, odunun-ocağın qaydasındadımı?

Şahsənəm xanım dedi:

– Ay kişi, hər şey yerindədi, bircə şey yerində deyil.

Dedi:

– Arvad, o nədi elə?

Dedi:

– Sənin həsrətin. Sən üççə gün evə gəlməyəndə özümü-sözümü bilmirəm, bu uzun səfərə dözə bilərəmmi?

Dedi:

– Şahsənəm, Allah səbirli qulunun dostudu, nə səni, nə məni utandırmaz, inşallah. Bir də dözməlisən, ayrı yolumuz yoxdu.

Sonatək boylanıb, gözəltək baxıb,
Gəlintək gəzməyi bacarmalısan.
Uçub əlimizdən gedən illəri
Nizama düzməyi bacarmalısan.
Düz dərəyə dönsə, dərə düz olsa,
Coşan dalğaların sayı yüz olsa,
Ayrılıq sahilsiz bir dəniz olsa,
Qol atıb üzməyi bacarmalısan.

Qoy zaya getməsin çəkdiyin əmək,
Dostum min olsa da, səndədir kömək,
Nə lazım hər sözü dil açıb demək,
Baxışdan sezməyi bacarmalısan.

Hər qalxan tufana bir sinə gərib,
Sevənlər özünü saymayıb qərib,
Vaxtında becərib, vaxtında dərib,
Vaxtında üzməyi bacarmalısan.

Çoxdu bu aşığın doğması, yadı,
Çalış el içində enməsin adı,
Onsuz da vüsalın şirindir dadı,
Həsrətə dözməyi bacarmalısan.

Şahsənəm xanımnan, anası Yetər xanımnan halal-hümmət eləyib, Allahı çağırdı, atı mindi, ata bir qamçı göstərib yerindən tərpəndi. Qarşısına məqsəd qoymuşdu ki, Dədə Ələsgərin məzarını ziyarət eləmək, onu yetirən torpağa baş əymək, o elnən-obaynan görüşmək lazımdı. Gecəli-gündüzlü at sürsə də, qətiyyən yorulmaq bilmir, elə bil göynən uçurdu. Yorulmaq olardımı, onu Göyçəyə Ələsgərin ruhu aparırdı. Amma səfəri Göyçəyə olsa da, fikrindən-xəyalından çox yerlər keçirdi. Təbrizi, Urmiyanı, Qaradağı, Qarsı, Ərzurumu, Çıldırı, Zəngibasarı, Dərəçiçəyi, Dərələyəzi, Qaraqolunu, Qarabağı, Gəncəni, Şəkini, Şirvanı gəzib-dolaşırdı. Borçalıdan artıq yola çıxmışdı, görək tale onu haralara qovuşduracaqdı...

Ürəyi yanırdı, su içmək istəyirdi. Bir kəndin içindən keçəndə gördü kəndin ortasında beş-on cavan oğlan şirin-şirin söhbət eləyir. Salam verib, əleyk aldı. Gördü yolun qırağında bir qız bulaqdan su doldurur.

– Ay qızım, ölənlərin ehsanı olsun, ciyərim yanır, mənə bir dolça su ver içim, – dedi.

Qız bu sözü eşidib quş kimi uçub əlində dolça aşığın yanına gəldi:

– Əmi, buyur iç, nuş olsun, – dedi.

Aşıq suyu birnəfəsə başına çəkib, “baxtın da bu su kimi duru olsun, qızım” – dedi.

Cavanlardan biri dilini dinc qoymayıb dilləndi:

– Aşıq qardaş, sən bizdən qorxmadınmı, çəkinmədinmi, biz dura-dura suyu qızdan istədin?

– Ay oğul, şəriətdə yanana su vermək savabdı. Mən də istədim ki, savab o qıza qismət olsun.

Söz cavanların xoşuna gəlsə də, oğlan yenə dilləndi ki, sən bilirsənmi sənə su verən qız kimin butasıdı?

Aşıq gördü ki, bu sözə tutarlı cavab verməsə, cavanlar ondan əl çəkməyəcək. Cavanların ürəyindən keçənləri duymuşdu. Aşığı söhbətə tutub ondan ləzzət almaq istəyirdilər. Aldı görək, Aşıq Hüseyn cavanlara nə dedi, cavanlar nə eşitdi:

Hüseyn Saraçlı:

Gözəllərə Allah versin eşqi, baxtı, yığvalı,
Öz gülümüz, çiçəyimiz, öz arımız var bizim.
Gözümüz yox özgələrin bağçasında, bağında,
Mən bağbanam, hər çiçəkdə yüz arımız var bizim.

İndi də başqa bir cavan dilləndi ki, aşıq əmi, bu sənə söz atan oğlan da şairdi, ona görə sizi ilişdirmək, sizdən söz almaq istəyir.

Şair olan oğlan dedi:

– Əmi, Allah eləməsin mən sizə söz atam. O ki elədi, onda bir balaca mənə də qulaq as:

Oğlan:

Aşıq qardaş, zarafatım toxunmasın qəlbinə,
Bura gələn hər qonağa hörmətimiz var bizim.
Xoş olsa da çeşmələrin suyunu nuş eləmək,
Atdan enin, ev-eşikdə nemətimiz var bizim.

Hüseyn Saraçlı:

Qadir Allah bağışlasın, əgər varsa günahım,
Bu dünyanın heç nəyində yoxdu gözüm, tamahım,
Baha aldım, baha satdım, sözdü mənim mətahım,
Öz daşımız, tərəzimiz, bazarımız var bizim.

Oğlan:

Sazdı, sözdü, məclislərdə sevincimiz, nəşəmiz,
Saz bitirir, söz yetirir dağ-daşımız, meşəmiz,
Uzaq yollar yolçusuna uğur demək peşəmiz,
Bizi sayıb gələnlərə rəğbətimiz var bizim.

Hüseyn Saraçlı:

Tez düşməsin kişi ruhdan, tez enməsin bəy atdan,
Ləzzət alsın aydan, gündən, saniyədən, saatdan,
Qılınc çəkib qan tökənlər nə apardı həyatdan,
Axır gündə haqq yerində məzarımız var bizim.

Oğlan:

Sən bir tavar telli sazsan, o sazdakı siməm mən,
Sən bərkimiş bir özülsən, təzə düşən himəm mən,
Ağsaqqalın qarşısında necə deyim kiməm mən,
Ustadlara baş əyməyə qeyrətimiz var bizim.

Aşıq Hüseyn Saraçlı oğlana "afərin" dedi. Cavanlarla xudahafizləşib yoluna davam elədi.

Yol gedə-gedə fikrindən-xəyalından nələr keçirdi?

Qan adından,
Qorxuram qan adından.
Xəyalım gəzən yeri
Quş gəzməz qanadınnan.

Aşığın fikri-xəyalı haraları dolaşmırdı? O, Alıdan, Ələsgərdən ötrü Göyçəni, Valehdən ötrü Qarabağı, Aşıq Şenlikdən ötrü Çıldırı, Abbasdan ötrü Tufarqanı, Xəstə Qasımdan ötrü Tikmədaşı, Qurbanidən ötrü Diridağı, Molla Cümadan ötrü Şəkini, Hüseyn Bozalqanlıdan ötrü Bozalqanı, Şəmşirdən ötrü Kəlbəcəri, Bilaldan ötrü Şirvanı, Sarı Aşıqdan ötrü Güləbirdi, Cəlildən, Qəhrəmandan ötrü Dərəçiçəyi ziyarət eləmək, onların ruhu ilə həmsöhbət olmaq istəyirdi.

Aşıq yol gedirdi. Biçinin, biçənəyin qızğın vaxtlarıydı. Otunu biçən biçir, yehrəsini vuran vurur, tayasını quran qurur, alafını aparan aparırdı. Arabalar, ziyrıqlar şaq-şaq şaqqıldaşır, öküzün, atın, ulağın qaçaqaç, daşıhadaşı çağlarıydı. Yabalar göydə oynayır, dırmıqlar yerə daraq çəkir, kərəntilər ilan kimi fışıldayırdı. Kərəntilər zindanda döyülür, bülövə çəkilir, itilənib ülgücə dönür, otun ağzından çıxanda buluddan şimşək sıyrılan kimi havada parıldayırdı. Biçinçilər çöllərdə qarışqa kimi qaynaşırdılar. Günəşin istisindən, təbiətin ətrindən, havaların gözəlliyindən elə qarışqalar, arılar da qayır-qayır qaynaşırdı. Bu gözəl mənzərələrə tamaşa eləyə-eləyə aşıq yol gedirdi. Artıq Göyçənin sərhədini keçmişdi. Soraqlaşa-soraqlaşa Ağkilsəyə sarı yön aldı. Gün günortaya qalxmışdı. Biçinçilər göy çəməndə süfrə salmış, bir xeyli adam süfrənin başına yığışmışdı. Aşıq uzaqdan yığnağa salam verib, keçib getmək istəyirdi. Ancaq aşığın verdiyi bir salama yeddi yerdən "əleyk" cavabı gəldi. "Aşıq qardaş, keçmə, buyur qonaq ol" sözünü o qədər şövqlə dedilər ki, aşıq sözü qəti çevirmədi, üzəngini basıb, atdan endi. Baxmayaraq ki, çörək üstəydilər, hamı bir nəfər kimi ayağa durdu. Aşıq onların hamısı ilə bir-bir əl tutub görüşdü. Məclisin ağsaqqalı dedi:

– Aşıq qardaş, yol gəlibsən, yaxşı bir çörək ye, sonra imkanın olsa, bir az sazına qulaq asarıq.

Belə də elədilər. Allah verəndən yaylaq süfrəsində yedilər-içdilər, dincəldilər, gözlərinə işıq gəldi. Yenə həmin ağsaqqal dilləndi:

– Aşıq qardaş, bağışla, qəlbinə toxunmasın. Geyim-kecimindən aşıq olduğunu bildik. Ancaq yerini-yurdunu, adını-ünvanını bilsək, çox şad olardıq. Bir bilək hansı qohumlardansan?

Aşıq "Baş üstə!" deyib, çox böyük həvəslə sazı köynəyindən çıxartdı. Sazın zilini zil, bəmini bəm eləyib təzənəni tellərə çəkəndə gördülər yox, bu elə-belə aşıq deyil. Hüseyn Saraçlı eşidənlərin arzusunu yerinə yetirib görək əyləşənlərə özünü necə təqdim elədi, "Divani" havası üstündə necə nişan verdi:

Hüseyn Saraçlı:

Mən damlayam, yol gedirəm, dəryalara baş vuram,
Min bir qəlbi dilləndirən bir eşqin rübabıyam.
Hardan gəlib hara getmək mənim fərmanım deyil,
Ulu Tanrım nə buyursa, mən bu əmrə tabıyam.

Mərd iyidin meydanına həmişə mərdlər gələr,
Hər görüşdə qarşımıza suallar, şərtlər gələr,
Əl Allahda, ayaq yerdə, başa çox dərdlər gələr,
Öz dərdimdi, öz ürəyim, göz yaşımın qabıyam.

Günəş öpər budağımı, torpaq öpər kökümü,
Aylar, illər qara yelə pay eləməz tükümü,
Mən karvanam, dünya səhra, daşıyaram yükümü,
Məcnunların, Kərəmlərin qayğısı, əzabıyam.

Məni ulu dərgahına çağıranda ol Xuda,
Dedi, gərək qonağını dilləndirə, oxuda,
Ağam gəldi, mətləb aldım, mətləb verdim yuxuda,
Məhəbbətin dəftəriyəm, sevginin kitabıyam.

Doğma elim Borçalıdı, Saraçlı kəndim mənim,
İtməz huşum, çaşmaz ağlım, pozulmaz zəndim mənim,
Telli sazdı uçmaz qalam, dağılmaz bəndim mənim,
Özüm ulu, yaşım qədim, min ilin hesabıyam.

Biçinçilərin sevinci yerə-göyə sığmadı. “Sözün cavabı söz olar”, “Xəstələn məndən ötrü, ölüm səndən ötrü” deyiblər. Aşıq az qala ürəyini yerindən çıxarıb onlara vermək istədi. Necə qarşılamışdılar, beşqat artıq bir sevgiylə də yola saldılar. Amma yolun salığını verdilər ki, aşıq yolu dolaşdırıb çaşmasın. Aşıq Ağkilsə kəndinə yaxınlaşdıqca həyəcanı çoxalır, ürəyi döyünürdü. O, hara getdiyini, hansı qapını açdığını, kimlərlə görüşəcəyini çox yaxşı bilirdi, ona görə də bu yükün ağırlığı altında özünü itirən kimi olmuşdu. Nəhayət, kəndin içindəki adamlarla salamlaşa-salamlaşa gəlib Ələsgər ocağına çatdı. Elə bu vaxt aşığın nəvəsi İslam müəllim əlini arxasında çarpazlayıb var-gəl eləyirdi. Aşıq da İslam müəllimi uzaqdan görən kimi atdan düşüb atı yedəklədi. Bir-birinə yaxınlaşıb hörmətlə əl tutub, hər ikisi adlarını nişan verdi. Həyətdə uşaqlar oynaşırdı. Səs-küyə Ələsgərin o biri nəvələri – Haqverdiylə İsmixan çıxdılar. İsti bir tanışlıqdan sonra onun Borçalıdan gəldiyini bilib çox şad oldular. Kəndin bir neçə ağsaqqalını da dəvət edib ustadın çox da uzaq olmayan məzarını ziyarətə getdilər. Allah kəlamı oxundu. Hüseyn Saraçlı Ələsgər məzarının ayaq tərəfində diz çöküb, qəbir torpağını öpüb gözünün üstə qoydu, sonra da əl yaylığını çıxarıb, torpağı yaylığa büküb yadigar götürdü. Başdaşına sarı gəldi. Qollarıyla başdaşını qucaqladı, üzünü daşa sürtüb, alnını daşa söykədi. Bir neçə dəqiqə beləcə qaldı. Hamı sakit dayandı, heç kəsdən səs çıxmadı.

Murazına yetən, arzusuna çatan, həsrətinə qovuşan adamlar hansı hissi keçirirsə, Aşıq Hüseyn də dilnən deyiləsi olmayan həmin hissləri keçirirdi.

Bu sənətə könül bağlayan gündən Aşıq Hüseyn Saraçlı Aşıq Ələsgərin bir şerinin hər bəndini, hər sətrini, hər kəlməsini incəldir, iynədən keçirir, ələyir, süzür, bu şe rin üstündə xəyala dalmaqdan, var-gəl eləməkdən yorulmurdu.

Aşıq olub diyar-diyar gəzənin
Əzəl başdan pür kamalı gərəkdi.
Oturub-durmaqda ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Bu bəndlə başlanan şe rin bütün sözləri onun həyatının mənasına çevrilmişdi. Aşıq "pür-kamal" olmalıdır. Yəni aşıq kimi qabil və kamil, ağıl, dərrakə, savad, danışıq, yaddaş, səliqə-sahman sahibi olmalıdır. Yükü, sərvəti, xəzinəsi, nağılı, dastanı, ustadnaməsi, vücudnaməsi ta duvaqqapmaya, müxəmməsə qədər yerli-yerində olmalıdır. Aşıq "mərifət elmi"nə sahib olmalıdır. Ədəbi-ərkanı, mərifəti-qanacağı, ağır oturub batman gəlməyi, nəfsini-nəfəsini təmiz saxlamağı, əl halallığı, dil halallığı, bel halallığı, yol halallığı ilə yaşamağı, mərifətdən təriqətə, təriqətdən şəriətə, şəriətdən həqiqətə – son məqsədə sağ-salamat, zədəsiz-ləkəsiz, duru və pak gəlib çıxmaq – bütün bunlar aşıq sənətinin Ələsgər tərəfindən yazılmış əbədi və dəyişməz qanunlarıdır.

Bəli, mərifətdən həqiqətə doğru gedən yol Ələsgər məzarından, Ələsgər ocağından keçib gedirdi. İslam müəllim gözəl bir məclis qurmuşdu. Borçalıdan gələn aşığın şərəfinə Göyçənin hörmətli ağsaqqalları məclisə dəvət olunmuşdu.

Bircə nəfər çatışmırdı, onun yeri görünürdü. Ələsgər kişinin sonbeşik oğlu Aşıq Talıb baba görünmürdü. Yaşı yetmişi haqlayan aşıq Göyçənin hansı kəndindəsə toy məclisi aparırdı. Aşıq Talıb toy məclisini başa vurub, evə qayıdanda ustada yolda xəbər verdilər ki, Talıb baba, Aşıq Hüseyn Saraçlı sizə qonaq gəlib.

Aşıq Talıb bu xəbərə çox sevindi. Atını bir az da yeyinlətdi. Gəlib evə çatanda gördü məclis qurulub. Hüseyn Saraçlı oxumağında, çalmağında, camaat da ona şirin-şirin qulaq asmaqda. Talıb kişinin uca boyu qapıda görünəndə bütün məclis ona sarı döndü.

Aşıq Talıbla Aşıq Hüseyn Saraçlı bir-birini bağrına basdı. Məclis bir az da gözəlləşdi. Aşıq aşığı, saz sazı, hava havanı əvəz eləyə-eləyə zaman musiqinin və Ələsgər sözünün sehri ilə axıb asta-asta gedirdi.

Nəhayət, vədə gəlib yetişdi. Aşıq Talıbdan xahiş elədilər ki, bu da bir tarixdi, Göyçənin, Borçalının nəfəsi bir-birinə toxunan məclisdə gərək üz-üzə oxuyasınız. Ya qismət, bir də belə bir görüş ola-olmaya. Bu "ya qismət" sözündən bəzi adamların ürəyi üzüldü, qəlbinə şübhə toxumları düşdü. Çünki Göyçənin başı dönə-dönə bəlalar çəkmiş, iki dəfə qaçqın düşüb, yerlərindən oynamışdılar.

Zaman aşığı dəyirmançı, ağanı çarvadar eləyəndə Ələsgər kişi demişdi:

Dad sənin əlindən çərxi-kəçmədar,
Ürəyimdə yüz dərmansız yaram var.
Aşıq dəyirmançı, ağa çarvadar,
Sərraf gəlsin bu bazara dolansın.

Məclisdə o faciələri gözləriylə görən kişilər vardı. Vahram adlı bir xaçpərəstin anasına yazdığı məktubu çoxları bilirdi. Zabit anasına yazırdı: "Mən Basarkeçərin tatar-türk əhalisini heç nəyə məhəl qoymadan məhv etdim. Bəzən gülləyə heyfim gəlirdi. Bütün qadınları, kişiləri və uşaqları yığıb quyulara atır, başlarına daş tökərək öldürürdüm". Bəli, bu, tarixin acı həqiqətiydi. Qışın qarlı-şaxtalı günündə Göyçədən Kəlbəcərə gələn Göyçə qaçqınları üçün zamanın acı tarixi "Dar dərəni" "Sümüklü dərə"yə, "Qanlı dərə"yə çevirmiş, qaçqınların çoxu orda qırılmışdı.

Göyçəlilər nə biləydi ki, onların başına sonradan gələn faciələrin yanında əvvəlkilər toya getməli olacaq. Onlar nə biləydi ki, İsmixan Göyçə deyə-deyə, göynəyə-göynəyə, ağlaya-ağlaya bu dünyadan Göyçəsiz köçəcək. Sızıltılı misraları bizə yadigar qalacaq:

İsmixanam, yönüm düşdü yad elə,
Nələr etdin, eyləməzdi yad, elə.

Mən aşığam yad elə,
Yad ölkəyə, yad elə.
Dedim mənnən sirdaş ol,
Sağlığımda yad elə.

Mən öləndə yaddan çıxart, yad elə,
Nə soruş, nə axtar, nə ara məni.

Onlar nə biləydi ki:

Dilimin əzbəri, andım, amanım,
Daha sağlığına yoxdu gümanım,
Ölüb Ələsgərim, itib İmanım,
Dolanıram hər bir yanı, tapmıram,

– deyən Aşıq Talıbın nəinki özünə, məzarına da həsrət qalacaqlar. Hələ bunlar sonralar olacaqdı.

Nəysə ... Aşıq Talıb hörmətlə "baş üstə" deyib, ayağa qalxdı. Kişi o qədər boylu-buxunlu bir adam idi ki, yerindən duranda elə bilirdin dağ tərpənir. Talıb kişinin sazını gətirdilər. Görək ustad oğlu Aşıq Talıb əziz qonağı Aşıq Hüseyn Saraçlıya nə dedi, Saraçlı ona nə cavab verdi:

Aşıq Talıb:

Ay Saraçlı, göz üstündə yerin var,
Öz babanı ziyarətə gəlmisən.

Ələsgərin həsrətini çəkirdin,
Nöqtə qoyub o həsrətə, gəlmisən.

Hüseyn Saraçlı:

Aşıq Talıb, Borçalıdan güc alıb,
Göyçə adlı bir cənnətə gəlmişəm.
Sazın-sözün şahı, xanı, sultanı,
Tanrı quran səltənətə gəlmişəm.

Aşıq Talıb:

Ulu Tanrı ağ eyləsin üzünü,
Öz evin bil, qonaq sayma özünü,
Öpə-öpə çeşmələrin gözünü,
Dadmaq üçün bal-şərbətə gəlmisən.

Hüseyn Saraçlı:

Şeirin dostu, sazın yarı burdadı,
Gözün nuru, qəlbin varı burdadı,
Xəzinənin xəznədarı burdadı,
Baxmaq üçün o sərvətə gəlmişəm.

Aşıq Talıb:

İşıq aldım ata adlı butamdan,
Heç doymadım bu ləzzətdən, bu tamdan,
Mən oğluyam, nə danışım atamdan,
Layiq olub, ləyaqətə gəlmisən.

Hüseyn Saraçlı:

Söz-söhbəti düşüb dilə-dodağa,
Çilçıraqdı qəlb adlanan otağa,

Baş endirib Haqq yandıran çırağa,
Saf sevgiyə, məhəbbətə gəlmişəm.

Aşıq Talıb:

Üşüyənlər istisinə qızındı,
Bu ocağın söz-söhbəti uzundu.
Nemətindi, çörəyindi, duzundu,
Tükənməyən bir sərvətə gəlmisən.

Hüseyn Saraçlı:

Oxucuydum, əlif-lama yetişdim,
Pərvanəydim, gəldim şama yetişdim,
Arzuladım, arzu-kama yetişdim,
Yetmək üçün o qismətə gəlmişəm.

Aşıq Talıb:

Neçə-neçə istəyindən aralı,
Borçalım da Göyçəm kimi yaralı,
Niyə bizim meydanımız daralı,
Bəlkə sözə, məsləhətə gəlmisən?

Hüseyn Saraçlı:

Sevgi yağsın hər dövrana, hər çağa,
Kim istər ki vaxtsız başa qar yağa.
Saraçlıyam, arxa dursun dağ-dağa,
Mən bu eşqə, sədaqətə gəlmişəm.

Hər yandan "Bərəkallah!" sədaları ucaldı.

Ələsgərin qardaşı Məşədi Salahın nəvəsi İsmixan da məclisdəydi. Gənc olsa da, gözəl şair kimi dilə-dişə düşmüşdü. Aşıq Talıbdan xahiş elədilər ki, icazə verin,

İsmixan da bir neçə kəlmə söz desin. Aşıq Talıb razılıq verdi. İsmixan əvvəlcə çəkindi, danışmaq istəmədi. İşi belə görən Aşıq Hüseyn dedi:

– Oğul, “bir güllə yaz açılmaz”, “tək əldən səs çıxmaz” deyiblər. Biz siznən güclüyük. Bu sənət babadan nəvəyə, atadan oğula, ustaddan şagirdə, qocadan cavana keçməsə, bulağımız quruyar.

Bu söz gənc İsmixanı ilhama gətirdi, ona söz demək fürsəti verdi:

İsmixan:

Aşıq qardaş, mən bir körpə tərlanam,
Fikrim uçar, göy üzündə süzər hey.
Sən babamın Göyçəsinə yetişdin,
Mənim fikrim Borçalıda gəzər hey.

Aşıq Hüseyn:

Körpə tərlan, ötən dilin mübarək,
Gənclik bizim bağçamızı bəzər hey.
Ət yeyən quş dimdiyindən bilinər,
Arif onu körpəlikdən sezər hey.

İsmixan:

Dost bağında çiçəkləri üzəydim,
Ləçək-ləçək yaddaşıma düzəydim,
Borçalını qarış-qarış gəzəydim,
Bir salaydım o yerlərə nəzər hey.

Aşıq Hüseyn:

Cavan olan saat kimi qurular,
Çeşmə kimi axa-axa durular,

Vaxtı çatdı, bir gözələ vurular,
Bir budağın qönçəsini üzər hey.

İsmixan:

Dədələrdi özülümüz, mayamız,
Çiçəklərdi abırımız, həyamız,
Təbiətdi boyaqçımız, boyamız,
Ömrümüzü əlvan-əlvan bəzər hey.

Aşıq Hüseyn:

Saraçlıyam, ocaq bildim kəndini,
Çox bəyəndim kamalını, zəndini,
Dürüst dedin hər beytini, bəndini,
Qoşmaların dil-dil olub gəzər hey.

İsmixan:

İsmixanam, ağsaqqaldı tacımız,
Oğlun-qızın qardaşımız, bacımız,
Telli sazla şirinləşər acımız,
Ruhumuza şərbətini süzər hey.

Söz tamama yetişdi. Aşıq Hüseyn Saraçlı İsmixanı öz doğma balası kimi bağrına basıb ona gələcək həyat və sənət yollarında xeyir-dua verdi. Aşıq sazı yerə qoydu. Yağlı-ballı bir yaylaq süfrəsi – çay dəsgahı açıldı. Süfrə arxası söhbətlər daha da şirinləşdi, getdikcə dərinə işlədi. Göyçənin, Borçalının tarixi və tarixi şəxsiyyətləri bir-bir yada düşdü.

Birinin qaçaqlığından, birinin qoçaqlığından, birinin qanlı faciəsindən şirinli-acılı söhbətlər getdi. Göyçənin ağsaqqalları Göyçənin tarixi ilə bağlı Əmir Teymurdan, Şah İsmayıl Xətaidən, Miskin Abdaldan, Alıdan, Ələs-

gərdən, Loğman Nağıdan, Səməd ağadan, Aşıq Nəcəfdən, Aşıq Əsəddən, Mirzə Bəylərdən danışdılar. Deməklə qurtarasıdımı bu söhbətlər?

Aşıq Hüseyn Saraçlı da öz növbəsində Borçalıdan, Borçalının adıbəlli oğulları – Darvazlı Mehralı bəydən, Qızılhacılı Cöyrə oğlu Qaradan, Kəpənəkçi İsrafil ağadan, Emin ağadan, Qasımlı Səməd ağadan, Arıxlı Uzunbaşoğlu Məhəmməddən, Faxralı şair Nəbidən, Qaçağanlı şair Ağacandan gözəl söhbətlər elədi. Amma Çıldırlı Aşıq Şenliklə Faxralı air Nəbidən danışanda, elə bil ki, aşığa təzədən vergi verildi, o qədər gözəl məsəllər, misallar çəkib söhbəti bəzədi ki, məclisdə oturanların barmağını kəssələr, xəbəri olmazdı. Təsbeh çəkilsə, səsi eşidilərdi.

Nəysə...

Aşıq Hüseyn Saraçlı bir neçə gün burda qalandan sonra getmək üçün izin-icazə istədi. Aşıq Talıb dedi:

– Aşıq Hüseyn, getsən yolundu, qalsan evindi.

Hüseyn Saraçlı neçə gündü onun zəhmətini çəkənlərə minnətdarlıq edib, görək Göyçədən necə ayrıldı?

Aşıq Hüseyn Saraçlı Göyçədən ayrılanda gözləri doldu, könlü qubar eylədi, əlini günlükləyib başı qarlı dağlara baxdı. “Gəlimli-gedimli, son ucu ölümlü” dünyada xəyalından nələr keçmədi? “Atüstü” havasına elə bayatı çəkdi ki, dağlar, daşlar yerindən oynadı:

Dəryada dəryalıqlar,
Suda oynar balıqlar.
Nə bu görüş olaydı,
Nə də bu ayrılıqlar.

Mən aşıq olmayaydı,
Saralıb-solmayaydı.
Ölüm Allah əmridi,
Ayrılıq olmayaydı.

Əzizim belə meylər,
Süzülüb belə meylər.
Sevən sevənin axırın
Gətirib beləmi eylər?

Göyçəylə görüşə gedəndə aşıq quş kimi uçurdu, Göyçədən ayrılanda ayaqları getmirdi:

Görüşəndə nur yağırdı düzlərə,
Ayrılanda dağlar qəmli göründü.
Titrəməyə him gəzirdi dodaqlar,
Göz yaşardı, kirpik nəmli göründü.

Qəlb alışdı sızıltıya, göynəyə,
Yanan mənəm, nəyə lazım ney, nəyə?
Yavaş-yavaş saz çəkildi köynəyə,
Dili tutqun, səsi bəmli göründü.

Gələn gedər, cərgəsi var, səfi var,
Qazancı var, ziyanı var, nəfi var,
Ayrılığın nə amansız xofu var,
Baş ağrılı, can sitəmli göründü.

Elə bil aşığın sümüyünə dammışdı ki, bir vaxtlar Göyçə boyda bir mahal yerindən oynayacaq. İldırım buluddan, qaya dağdan, palıd kökündən, dünya mehvərindən qopan kimi, Göyçə də Azərbaycanın əlindən, ürəyindən, bağrından qoparılacaq. Can cəsəddən, ruh bədəndən, ət dırnaqdan, kök budaqdan ayrılanda insan hansı duyğuları yaşayırsa, aşıq eldən ayrılanda eynilə həmin duyğuları yaşayır. “Arsız aşıq elsiz niyə yaşadı, ölsün Ələsgərtək qulların, dağlar”.

Aşıq Göyçədən ayrılmışdı. Qazuçandan Kəlbəcərə aşmaq üçün yol gedirdi. Əvvəlki yol onu Ələsgər ocağına aparmışdısa, bu yol onu Ağdabanlı Qurbanın ocağına, Aşıq Şəmşirin səsinə-sorağına aparırdı.

Aşıq Kəlbəcərə doğru getsə də, fikri, düşüncəsi Göyçədə gördüklərinin, eşitdiklərinin, bildiklərinin yanında idi. Bu səfərdən çox razı gedirdi. Fikirləşirdi ki, bütün ömrü boyu getdiyim və gedəcəyim səfərlərin ən gözəli, yəqin, bu səfər olacaq. Körpəlikdən ürəyində yaşatdığı ən gözəl arzusunu, ən təmiz niyyətini həqiqətə çevirmişdi. Ələsgər ocağından Ələsgər haqda, Göyçə aşıqları haqda yeni rəvayətlər, əfsanələr, dastanlar aparırdı. Bunların içində "Su" məsələsi onu yaman tutmuşdu. Bir evdə, bir eldə, bir obada böyük bir istedad sahibi dünyaya gələndə, bir Tanrı hədiyyəsi, Allah vergisi meydana çıxanda xalq o şəxsiyyət haqqında müxtəlif fikirlər danışır. Belə adamların yetişməsini hər kəs bir səbəblə bağlayır, hərə bir kökə, bir səmtə, hərə bir sunura çəkir.

Biri deyir: – Anasının südündəndi!

Biri deyir: – Ata tərəfdən ulu babası filankəsə çəkib!

Biri deyir: – İçdiyi sudandı!

Biri deyir: – Onu yetirən torpağın hünəridi!

Biri deyir: – Zarafat deyil, kişinin oğluna buta verilib.

Bəzi ağzıgöyçəklər, gözügötürməyənlər xoşagəlməz bir ifadə işlədir:

– Cillikdə bir gül bitib!

Bir adam şair kimi üzə düşəndə əvvəlcə camaatın içində lağlağı söhbətlər gəzir. O şair haqqında hər başdan bir avaz gəlir. Elə ki həmin adam böyüdü, ucaldı, şöhrət tapdı, onda el sevgisi, xalq məhəbbəti ilə yanaşı, paxıllıqlar başlayır. Elə ki, görürlər paxıllıq, rəzillik, xudbinlik yel olub heç onun yanından da keçə bilmir, onda artıq səcdə, məhəbbət, rəğbət mərhələsi başlayır. Hamı bir ağızdan birmənalı şəkildə: "Kişinin oğlu şair doğulub, bu, Allah vergisidir", – deyir. Kim ki, yaş əllini keçəndə ya arabadan "yıxılır", ya sərsəm yuxular görür, ya başı daşa dəyib zədələnir, bu səbəbdən şair olmaq eşqinə düşür, onda xalq doğru olaraq ironiya ilə filankəs

“şair olub” deyir. Deməli, şair doğulubsa, Allah vergisidi, şair olubsa, şeytan əməlidir.

Bu mənada Allah Aşıq Hüseyn Saraçlını hər yerdə şair doğulanlarla qovuşdurmaq üçün bu yollara yoldaş eləmişdi.

Səfər gərək səfər ola, yola çıxan da əsil Allah adamı.

Səfərdən gözəl nə var,
dərk ola.
Hər yerdə sənə qarşı
Sevgi ola, ərk ola.

Od qaynaya qanından,
Qızlar keçə yanından,
Ağrı-azar canından
Birdəfəlik tərk ola.

Nə yata, nə sürünə,
Haqq nuruna bürünə,
Yaxşı elə görünə,
Yamanlara görk ola.

Səfərdən gözəl nə var,
“Gəl!” – deyə Pərvərdigar.
Yağsa da üstünə qar,
Boz dumanlar kürk ola.

Gül açanda arzular,
Qışda da verəcək bar.
Səfərdən gözəl nə var.
Evdən belin bərk ola!

Qayıdaq “ u” məsələsinə!

Növrəs İmanın gənc, odlu-alovlu çağlarıymış. Yayın günündə çöldə qoyun otarırmış. Axşam olur, sürü arxaca

dönür. Görürlər ki, İman yoxdu, gözə görünmədi, səsi-səmiri gəlmədi. Axşamın şəri, gecənin qaranlığı, yaylağın dumanı – hara edəsən, hardan tapasan Növrəs İmanı? Məcbur olub səhərin açılmasını gözləyirlər. Elə ki səhər açılır, camaat düşür ələ-ayağa.

Orda İman, burda İman, gəlib görürlər ki, bir qayanın dibində yatır. Nə qədər səsləyirlər, İman oyanmır. Görürlər ağzından köpük daşlanır. Xəbər Ələsgərə çatır, o saat Ələsgər xəbər göndərir ki, ona toxunmaq olmaz. Göz-qulaq olun. Elə ki, ayıldı, heç nə soruşmadan, heç bir sual vermədən evə gətirin. Belə də olur.

Aşıq Ələsgər bu haqda heç kəsə heç nə demir. Uzun illər bu sirri özündə saxlayır. Ömrünün axır çağlarında Ələsgər bir dəfə möhkəm xəstələnir və İmanla bağlı saxladığı sirri doğmalarına, Aşıq Talıba danışır. Danışır ki, 17-18 yaşım olardı. Eynilə İmanın başına gələn bu hadisə mənim başıma gəlib.

Biri deyir: – Vurğun vurub!
Biri deyir: – Üstündən saat addayıb!
Biri deyir: – Yuxusuna mələklər girib!
Biri deyir: – Kiminsə qızına aşiq olub!
Ancaq heç kəs həqiqəti deyə bilmir.

Biri deyir: – Sudandı,
Biri deyir: – Oddandı.
Biri deyir: – Qohumdan,
Biri deyir: – Yaddandı.

Biri durdu, dayandı,
Dedi: – mənə əyandı.
Yaşı keçib on beşdən,
Bir parçadı Günəşdən,
Ruhu “Abı-atəş”dən,
Qəlbi “Xaki-bad”dandı.

Biri deyir: – Ələsgər
İmam adı daşıyır.
Ona verilən nə var,
Daşıdığı addandı.

Biri deyir: – Göyçənin
Sularında sehr var.
Çiçəkdəki ətirdən,
Meyvədəki daddandı.

Axırıncı fikri deyən adam həqiqətə yaxınlaşmışdı. Ancaq dediyi sözü dərindən dərk edib deməmişdi, fəhmin gücünə demişdi.

Bəli, uzun illərdən sonra bu mətləb açılırdı. Ustad danışırdı ki, mənim Səhnəbanının eşqi ilə alışıb-yanan çağlarım idi. Günlərin birində havalandım, coşdum, yerə-göyə sığmadım. “Həm aşığam, həm dərvişəm, həm dəli” dediyim günlər idi. Özümü elə apardım ki, heç kəs mənim bu halımdan xəbər tutmadı. Bir gün şirin və dərin bir yuxuya getdim. Yuxuma bir nurani-pirani, nur parçası, açıq alınlı, enli qaşlı, ağ saqqallı, ala gözlü bir kişi girdi. Qurbani ki deyir: “Yatmışdım, üstümə gəldi ərənlər: – Qafil, nə yatmısan, oyan”, – dedilər. Bax mənim də belə bir saatım gəlib çatmışdı.

Yuxuma girən kişi əllərimi sıxdı, saçlarımı sığalladı, üzümdən öpdü.

Mənə sual verib dedi:

– Oğlum, dünən günorta kəndinizin üst tərəfindən axan çaydan içdiyin su yadındadımı? Dedim: “Bəli, yadımdadı”. Dedi: “Oğlum, bu gündən sən Allahın sevilmiş, seçilmiş bəndələrindən birinə çevrildin. Sənə yüz ildən çox ömür, dünyaya sığmayan həyat eşqi verildi”. Dedim: “Ey piran qoca, nədən bilim mənə bu nemətlərin verildiyini?” Dedi: “Oğlum, o ki, kəndinizin üst tərəfində nazik bir dərə var, haa. Heç vaxt o dərənin suyu

kəsilmir. Yeddi ildə bir dəfə günün günorta çağları üç saat o su gömgöy axır. Yeddi ildə bir dəfə üç saat gömgöy axan o sudan kim içərsə, kimin bəxtinə, hansı bəxtəvərin qismətinə düşərsə, ona alimlik, şairlik, aşıqlıq, pəhləvanlıq, qəhrəmanlıq, görücülük verilir. Sənə aşıqlığı, görücülüyü verdik. Halalın olsun!"

Kişinin axırıncı "halalın" sözü ağzından çıxan kimi yox oldu.

Demək, hikmət suyun hikmətiymiş. Çünki dağlardan gələn sular buludun nəmini, yerin-göyün sevincini qəmini, bütün çiçəklərin şəhdini-şirəsini, ağacların kökündəki qayaları yarmaq eşqini, torpağın canındakı "itirmək" və bitirmək, öldürmək və diriltmək qüdrətini, Günəşin odunu, ulduzların işığını, qayanın sərtliyini, palıdın möhkəmliyini, dağların əzəmətini, zirvələrin qarını-buzunu özündən yuxarıda, özündən aşağıda nə varsa – yığıb-yığşırıb öz canına çəkir. Onu içən adama Allahın qüvvəti, Tanrının sağlamlığı, təbiətin əlvanlığı verilir.

İnsan dünyaya gələn kimi əvəçi uşağı su ilə çimizdirir, pak edir, ona həyat verir. İnsan dünyadan gedəndə yuyucu yenə su ilə cəsədi yuyub təmizləyir, o dünya üçün pak edir və kəfən üçün hazırlıq görür.

Əvəçidən başlamış yuyucuya qədər, beşikdən məzara, bələkdən kəfənə, əvvəldən axıra bizi su yaşadır, oğul. Bizi yaşadan dörd ünsürün biri də "SUDUR!!!", mənim balam!

Allah mən o suyu içmək, onun atəşinə, yanğısına, oduna, alovuna, yükünə dözmək üçün, o yükü götürmək üçün uca boy, enli kürək, palıd cüssəli bədən, sağlam can vermişdi. Ona görə də mən dözdüm, dayandım, külə dönüb yellərə yem olmadım. Hərdən eşqim mənə zor gələndə "Demədimmi, içmə eşqin camını, içsən dünya sənə dar olacaqdı" deyib özümü danlayırdım. Sonra da lənət şeytana deyib, Tanrının buyurduğunu qəbul edir-

dim. Ancaq məndən fərqli olaraq Növrəs İmana Allah çox balaca boy vermişdi. İkimiz də eyni sudan eyni ölçüdə içmişdik. Mənim bədənim dözən yükə onun bədəni tab gətirmədi.

Su adlı nemətlə bağlı xalq içində nə qədər deyimlər var, heç biri boşuna deyilməyib, oğul.

"Axar su qapından axsın", "Səni görüm otun bitib, suyun axmasın", "Yuxunu suya danış", "Su kimi baxtın olsun", "Suyu filankəsə çəkib", "Bu işdən gözüm su içmir", "Əməyin qar suyuna dönsün", "Öləndə üstündə su tapılmasın", "Su tökməklə quyu sulu olmaz", "Evimiz susuz dəyirman kimidir" və s.

Bəli, baxtı su kimi duru, yolu su kimi aydın olan Aşıq Hüseyn Saraçlı Göyçədən bu sərvətnən, bu xəzinəynən, bu varidatnan ayrılırdı. Ayrılırdı Göyçəni ürəyində əbədi yaşatmaq – sazını tutub, sözünü oxumaq üçün.

* * *

Aşıq Kəlbəcərə gedirdi. Hansı düzdən keçdi, hansı dağdan aşdı, hansı cığırı ətəklədi, hansı yolu tutdu, bilmədi, bir də gözlərini açanda özünü Tərtər çayının qırağında, bir ağacın kölgəsində, bir çeşmənin başında gördü. Sağa baxanda gördü çeşmədən bir az aralı nəhəng yaşıl bir palıd ağacının altında bir oğlanla bir qız sarmaşıq kimi bir-birinə dolanıb. Aşığı görən kimi həyalanıb aralandılar. Kökündən kəsilib kötüyə çevrilmiş fıstıq ağacının üstündə əyləşdilər. Aşıq sevgililərin adını xəbər aldı. Oğlan "mənim adım Məhəmməd, sevgilimin adı Güləndamdır – özümüz də Kəlbəcərdənik" – deyib cavab verdi. Dedi: "Aşıq qardaş, mən də, sevgilim də sazın, sözün, aşığın xəstəsiyik. Üç gündən sonra xeyir işimiz olacaq. Bəlkə bir sazını köynəkdən çıxardasan?" Amma oğlan deyəndə ki, "Mənim adım

Məhəmməddi, sevgilimin adı Güləndam", aşığın yadına "Məhəmməd və Güləndam" dastanı düşdü. Dedi: "Elə oğlanın da, qızın da könlünü almaq üçün o dastandan oxuyaram".

Bir də fikirləşdi ki, yeni söz qəhətliyidimi? Əgər mən aşığamsa, muraz üstə olan, toyunu gözləyən bu cavanların eşqinə təzə bir könül sözü söyləməsəm olarmı?

Aşıq üzünü cavanlara tutub "Aran gözəlləməsi" havası üstündə onlara xeyir-dua verdi:

Sizi gördüm, gözüm-könlüm açıldı,
Ürəyimə süzüldünüz, axdınız.
Yaylaq yaşıl, meşə yaşıl, dağ yaşıl,
Yaylaq kimi yaşıl olsun baxtınız.

Ay nurunda qar işığı gözəldi,
Yar gözündə yar işığı gözəldi,
Yağla balın qarışığı gözəldi,
Şirin olsun dövranınız, vaxtınız.

Vüsal gəlsin, həsrət çıxsın aradan,
Müjdə versin yara səhər, yara dan,
İşığını bol eyləsin Yaradan,
Toy gecəsi bəzənəndə taxtınız.

Toyqabağı bu sözləri eşidən sevgililərin ürəyi çiçək kimi açıldı, sevinci birə-min oldu. Elə bil ki, ozan xeyir-duası, ağsaqqal alqışı üçün Aşıq Hüseyni cavanların yanına Allah özü göndərmişdi.

Aşiqlərin sevincinə sevinən aşıq onların ruhunu daha da qanadlandırmaq üçün sözün ikinci varağını çevirdi:

Güləndam bir güldü, Məhəmməd çiçək,
Nə gözəl yaraşır qız Məhəmmədə.

Elə bir qız seçib qızlar içindən,
Layiqdi ən şirin söz Məhəmmədə.

Qəlbin atəşinə, oduna qurban,
Eşqin ləzzətinə, dadına qurban,
Peyğəmbər adıdı, adına qurban,
İlahi, dəyməsin göz Məhəmmədə.

Dönsün məhəbbətin şirin barına,
Tanrı qovuşdursun yarı yarına,
Qarışsın Hüseynin arzularına,
Versin murazını saz Məhəmmədə.

Oğlan ustad alqışından, ozan xeyir-duasından qanadlanıb uçur, az qalırdı aşığı ən əziz adamı kimi yarıb qoynuna qoysun.

Məhəmməd dedi:

– Aşıq qardaş, bu gözəl sözləri eşitdim, mənim də şairliyim tutdu. İcazə verin mən də öz duyğularımı sizə çatdırım.

Aşıq "buyur" dedi. Görək oğlan nə buyurdu:

Aşıq qardaş, bu gün dünya mənimdi,
Torpaq mənim, mahal mənim, el mənim.
Bu dağların çayı kimi coşmuşam,
Dolu mənim, tufan mənim, sel mənim.

Bu yerlərin bir nəğməkar oğluyam,
Çeşməliyəm, zirvəliyəm, dağlıyam,
Min bir tellə bir gözələ bağlıyam,
Yanaq mənim, dodaq mənim, dil mənim.

Uçan quşu səmalardan endirən,
Qəlbimizi Qaf dağına mindirən,
Telli sazı cəh-cəh vurub dindirən,
Mizrab mənim, pərdə mənim, tel mənim.

Sevən qəlbim, yanan şamım var olsun,
Sevgi dolu nurlu camım var olsun,
Gül dediyin Güləndamım var olsun,
Gərdən mənim, kəmər mənim, bel mənim.

Göz işığı gözlərimə çıraqdı,
Bir dastanam, sinəm min bir varaqdı,
Sevgilimin saçlarında daraqdı,
Bilək mənim, barmaq mənim, əl mənim.

Aşıq Hüseyn Saraçlı gördü ki, oğlan çox dolu təbli, şirin sulu, şirin dilli bir oğlandı. Dedi: "Ay qardaşoğlu, buralar nə gözəl yerlərdi, bu meşələr, çəmənlər kimindi, burda hansı bəxtəvərlər yaşayır?" Oğlan dedi: "Aşıq qardaş, bu dağlar, bu düzlər, bu meşələr hamısı bizimdi. Bu yaşıl ağacların altı da, göydə ulduzlar da, yerdə çiçəklər də hamısı bizimdir. Mənim atam bu meşələrin bəyidi. Meşəbəyi kimi bu basalaqda onu tanımayan adam yoxdu. Atam olduğu üçün demirəm. Çox yaxşı kişidi, səxavətli adamdı. Bilsə, səni buraxmaz, amma heç mən də səni buraxan deyiləm. Evimizin ən əziz qonağı olacaqsan". Oğlan belə deyəndə yenə Hüseyn Saraçlının yadına Ələsgərin şeiri düşdü.

Gəşt elədim, bu dünyanı dolandım,
Kəlbəcərin xeyri-şəri yaxşıdı...

Məhəmməd dedi: "Aşıq qardaş, üç gündən sonra toyumuzdu. Bu gün ata-anamızdan icazə aldıq ki, toy-qabağı bir az təbiətin qoynunda havamızı dəyişək. Demək, qismət beləymiş. İndi təkcə bu yaşıl ağacın altı yox, aşıq da, saz da, hava da, toy da, məclis də bizimdir". Oğlan sevdiyi bir şairin şeirini çox böyük şövqlə oxumağa başladı:

Kök üstə budağı neçədi, bildim,
Budaqda yarpağı neçədi, bildim,
Salxımı, saçağı neçədi, bildim, –
Bu yaşıl ağacın altı bizimdir.

Saçağı titrəşir tellərin kimi,
Yarpağı oynaşır əllərin kimi,
Düyməsi açılıb tüllərin kimi, –
Bu yaşıl ağacın altı bizimdir.

Bu sevgi, bu layla, bu beşik bizim,
Çəkər növbəmizi bu keşik bizim,
Nəyimizə lazım ev-eşik bizim, –
Bu yaşıl ağacın altı bizimdir.

Alov Allahındı, isti Allahın,
Ocaq Allahındı, tüstü Allahın,
Bu yaşıl ağacın üstü Allahın, –
Bu yaşıl ağacın altı bizimdir.

Gözümüz havalı, könlümüz də ac,
Gəncliyin havası başımızda tac,
Bir sənsən, bir mənəm, bir yaşıl ağac, –
Bu yaşıl ağacın altı bizimdir.

Dən kimi səpələ, toxum kimi ək,
Zəlimxan, bu anın ləzzətini çək,
Hələ bizdən sonra çoxu deyəcək:
"Bu yaşıl ağacın altı bizimdir".

Şeir aşığın ürəyinə ayrı cür yatmışdı, dedi: "Ay qardaşoğlu, icazə ver, Güləndam xanımın eşqinə sinəmə gələn rədifli, cinaslı bir qoşma deyim". "Əmi, izindi, de, başına dönüm, de". Aldı Aşıq Hüseyn, görək Güləndamı necə saza-sözə gətirdi:

Bir qız bir oğlanın pərvanəsiydi,
Yaman sarımışdı bir gül əndamı.
Hərə öz yerini doğma bilirdi,
Bir gülən sarayı, bir gülən damı.

Sevgililər bu sözü eşidib, şaqqanaq çəkib güldülər. Aşıq pərt oldu ki, yəqin sözüm yerinə düşmədi. Oğlan aşığın tutulduğunu görüb, yenə gülə-gülə aşığa dedi:

– Aşıq qardaş, sən lap peyğəmbərsənmiş. Sən hardan bildin ki, biz səndən əvvəl elə saraydan, damdan danışırdıq? Mənim atam varlı-hallı bir adamdı. Evlərimiz saray kimidi. Ancaq Güləndamın atası kasıb, qoca bir kişidi, evdən-eşikdən bir qara damları var. Mən zarafatla Güləndama deyirdim ki, gəlsənə toyun olanda elə o damı da sökək bizim saraya gətirək. Güləndam da deyirdi ki, dam olsa da, bizim üçün xoşdu. Orda mən böyümüşəm. Aşıq, qəti çəkinmə, sözün arxası varmı?

Aşıq dedi:

– Onda al gəldi.

Elə bil dərəni duman çəkirdi,
Eşqin atəşindən aman çəkirdi.
Arı öz bağrına yaman çəkirdi,
Bir çiçək bədəni, bir gül əndamı.

Sonu yox canımdan çıxan istimin,
Sönən alovumun, qalxan tüstümün,
İki sevgilisi vardı dostumun,
Bir Haqqı sevirdi, bir Güləndamı.

Bu şeirdən hər iki gəncin ürəyi sinələrinə sığmırdı. Məhəmməd yarızarafat, yarıciddi: "Sevgilim, sən də belə tarixə düşdün, – dedi. – Aşıq Ələsgərin Güləndamından sonra deyəsən ikinci Güləndamsan ki, şəninə, şərəfinə söz qoşulur. Özü də deyəsən üç gündən sonra

keçiriləcək toy məclisimizin əvvəli elə çeşmə başından, bu yaşıl ağacın altından başladı. Çeşmə baxtımızın duruluğu, yaşıl ağac taleyimizin rəngi olacaq, inşallah!”

Elə də oldu. Bu toyu Aşıq Hüseyn apardı. Bulaq başında gördüyü, duyduğu, eşitdiyi söhbətləri yenidən məclisdə elə dilə-qələmə, saza-sözə gətirdi ki, bu söhbət özü elə bir dastana çevrildi.

* * *

Hüseyn Saraçlı məclisdə məqsədini, məramını camaata bildirmişdi ki, düşəcəyi yer haradı, hardan gəlib, hara gedir. Xəbər Şəmşir ocağına çatmışdı. Ağdaban da ustad Hüseyn Saraçlının yolunu gözləyirdi. Dəlidağda, Ceyran bulağının başında Aşıq Şəmşirlə Səməd Vurğunun görüşü dillərdə dastan olmuşdu. Səməd Vurğunun ölümündən neçə illər keçməsinə baxmayaraq Aşıq Şəmşirin ürəyindən dost yarası getməmişdi. Ona görə də Borçalıdan olan bir aşığın gəlişi ona Səməd Vurğunun nəfəsini gətirirdi. Bilirdi ki, Aşıq Hüseyn Saraçlının söz-söhbəti onun ağrısına əlac, yarasına məlhəm, dərdinə dərman olacaq. Üzü Yeddi qardaş dağına baxan, arxasında Qurban bulağı çağlayan, Ağdaban kəndinin tən ortasında yerləşən Aşıq Şəmşir ocağı Bakıdan, Azərbaycanın müxtəlif yerlərindən gələn qonaq-qarayla hər gün dolub-boşalır, həyət-baca qazan kimi qaynayırdı. Bu ocaqda hər günün öz qonağı, hər qonağın öz qisməti varıydı. Hüseyn Saraçlı da öz qismətinin üstünə gəlib çıxmışdı. Aşıq Şəmşirlə Hüseyn Saraçlının aralarındakı yaş fərqi çox olsa da, bir ananın əkiz oğlu kimi, doğma qardaş kimi görüşdülər. Çünki Aşıq Şəmşir təkcə Aşıq Hüseynlə görüşmürdü, onun şəxsində həmişə sazlı-sözlü bir mahal kimi tərifini eşitdiyi, sevdiyi, xətrini əziz tutduğu Borçalının adət-ənənəsi, böyüyü-kiçiyi, kökü-budağı ilə görüşürdü.

Hüseyn Saraçlı çoxdan idi Aşıq Şəmşiri görmək, onun əllərini sıxmaq istəyirdi. Ona görə ki, bu əllər Ağdabanlı Aşıq Qurbanın əllərinə toxunmuşdu. Bu əllər Ələsgərin əllərindən isinmişdi. Bu əlləri böyük şairimiz Səməd Vurğun sıxmışdı.

Əllərdən əllərə keçən isti var,
Əllərdən əllərə bərəkət verər.
Ocaq kişilərin nəfsi, nəfəsi,
Sünbüllü çöllərə bərəkət verər.

Başına tac bilər abrı, həyanı,
Sayar hörmət ilə onu sayanı,
İlahi qüdrətdən tutar mayanı,
El olub, ellərə bərəkət verər.

Şöhrəti bac verməz qışa, ayaza,
Onu öz qeyrəti çıxardar yaza,
Boğazı laylaya, nəfəsi saza,
Barmağı tellərə bərəkət verər.

Səsini ürəklə qatar səslərə,
Dost olar, tay olar müqəddəslərə,
Düşünən başlara, sevən kəslərə,
Duyan könüllərə hərəkət verər.

Bu bərəkət hər iki aşığın gözündə, qəlbində, varlığında, canında, cövhərində idi. Ona görə də Hüseyn Saraçlı bu görüşə adi bir görüş kimi baxmırdı, haqlı olaraq ocaq kimi, pir kimi, ziyarət kimi baxırdı.

Aşıq Hüseyn Saraçlı ürəyindən keçənləri Dədə Şəmşirə çatdırmaq üçün söylədi, görək nə söylədi:

Gözəl üzlər, gül çöhrələr
gözəlləşdirdi dünyanı,
Alov saçan ürəklərə
odlu təndir kimi baxdım.

Yerində deyilən sözlər
şərəfim, şöhrətim oldu,
Yerinə düşməyən sözə
ağır təhqir kimi baxdım.

Tanrıdan aldığım nuru
bol-bol insana payladım,
Hər kim ağsaqqal oldusa,
mən ona pir kimi baxdım.

Çox-çox arzulayan oldu,
az-az insanlara çatdı,
Ağsaqqala möcüzətək,
müqəddəs pir kimi baxdım.
Özü Haqdan, sözü Haqdan,
ilhamı Haqdan gələnə,
Sözdə Səməd Vurğun kimi,
sazda Şəmşir kimi baxdım.

Sazın, sözün meydanında
Hüseyn heç sıxılmadı,
Mən ona harda baxdımsa,
şir oğlu şir kimi baxdım.

Hüseyn Saraçlı Borçalıdan Göyçəyə, Göyçədən Kəlbəcərə, Ağdabana necə gəldiyini, yollarda, məclislərdə kimlərlə görüşdüyünü Dədə Şəmşirə nağıl elədi. Şəmşir kişi də dostluq elədiyi, tanış olduğu Borçalı-Qazax-Tovuz aşıqları ilə maraqlandı, onların vəziyyətini soruşdu.

Nəhayət, sazın-sözün əsl məclisi başladı. Əslində, qayda-qanuna, el adətinə görə, ilk söhbəti birinci Aşıq Şəmşir başlamalı idi. Ancaq böyük ustad hörmət əlaməti olaraq ilk sözü Aşıq Hüseyn Saraçlıya verdi. Hüseyn Saraçlı razılıq elədi, görək “Şahsevəni” havası üstündə nə dedi, necə başladı:

Aşıq Hüseyn Saraçlı:

Havalandı dəli könlüm,
Kəlbəcərdə, Dədə Şəmşir!
Qocalırsan, necə dözüm,
Belə dərdə, Dədə Şəmşir!

Aşıq Şəmşir:

Yeriniz var göz üstündə,
Kəlbəcərdə, ay Saraçlı!
Arxamızda zirvələr var,
Düşmə dərdə, ay Saraçlı!

Aşıq Hüseyn Saraçlı:

İnsanlıqda mehirlisən,
Aşıqlıqda sehirlisən,
Səməd Vurğun möhürlüsən,
Huşda, sərdə, Dədə Şəmşir!

Aşıq Şəmşir:

Şər işlərdə izimiz yox,
Yerə düşən sözümüz yox,
Sənətkarıq, gözümüz yox,
Pulda, zərdə, ay Saraçlı!

Aşıq Hüseyn Saraçlı:

Bu dünyada möhlət azdı,
Xudam özü belə yazdı,
Umudumuz telli sazdı,
Belə yerdə, Dədə Şəmşir!

Aşıq Şəmşir:

Eşqi qəlbimin təpəri,
Borçalıdan ver xəbəri,
Qoy ucalsın "Süsənbəri",
Pərdə-pərdə, ay Saraçlı!

Aşıq Hüseyn Saraçlı:

Borçalı bir ağır eldi,
Saz qanımda daşan seldi,
Oylaqları Çənlibeldi,
Mərddi mərdə, Dədə Şəmşir!

Dədə Şəmşir Aşıq Hüseyn Saraçlıya Borçalının qəm üstündə köklənən yaslı-yaralı, ağır oxunan havaları haqqında bir neçə sual verdi, maraqlı cavablar aldı. Bir az azalan, bir az sozalan, bir az seyrələn, bir az kövrələn, budaqları budanan, gövdəsi baltalanan, kökü zədələnən, əlli ildən çoxdu ki, üzülən, süzülən, nəzilən, incələn, ancaq gördüyü işgəncələr qarşısında mərdi-mərdanə duruş gətirən, yıxılmayan Borçalının sözü-söhbəti, sazı-aşığı qəmgin olmaya bilərmi?

Suların məşqinə bax,
Sellərdə daşqına bax,
Dərdimnən oynayıram,
Deyillər eşqinə bax.

Aşıq Hüseyn bu fikirlərə qüvvət kimi görək ustada nə dedi:

Ağrıdan, həsrətdən qurulan evə
Him çəkən olmuşuq, ay Dədə Şəmşir!
Qəmli könüllərdən qara sazlara
Sim çəkən olmuşuq, ay Dədə Şəmşir!

Ümidlər qırılar, gümanlar itər,
Cığırı kol basar, yolda ot bitər,
Bulud görünəndə, pambıqdan betər
Nəm çəkən olmuşuq, ay Dədə Şəmşir!

Nə qədər olsaq da yenilməz, mətin,
İşimiz ağırdı, yolumuz çətin,
Sıxılıb içində özgə millətin,
Qəm çəkən olmuşuq, ay Dədə Şəmşir!

Havanı döndərib, Borçalının qayğıları, dərdləri ilə bağlı bir "Qürbəti" köklədi:

Bilmirəm nə deyim Borçalıya mən,
Alovlar içində cənnətmi deyim?
Yağılar əlində qalan torpağa,
Vətənmi söyləyim, qürbətmi deyim?

Zimistana dönür yazımız bizim,
Perikir oğlumuz, qızımız bizim,
Zar-zar ağlayırsa sazımız bizim,
Mən buna nifrətmi, ləzzətmi deyim?

Axşam ağlayacaq, dan ağlayacaq,
Könül sızlayanda can ağlayacaq,
Sazımız nə qədər qan ağlayacaq,
Mən belə qismətə qismətmi deyim?

Qılıncı qınından sıyıranlara,
Qanımla qarnını doyuranlara,
Məni öz kökümdən ayıranlara
Qarğışmı eyləyim, lənətmi deyim?

Hamı kövrəlmişdi. Aşıq Şəmşir daha heç bir sual vermədi. Araya lal bir sükut çökdü. Onların heç biri

bilmirdi, heç vaxt da bilməyəcəkdilər ki, bu gün toy-tamaşa meydanına çevrilən ana Kəlbəcər, Ağdaban kəndi, Aşıq Qurban ocağı, Ağdabanlı Qurbanın, Dədə Şəmşirin əlyazmaları da Kəlbəcər oğulları kimi şəhid olacaq, yanıb külə dönəcək və heç vaxt bu yaralar sağalmayacaq.

Hələ ki, Kəlbəcər də, Ağdaban da, Dədə Şəmşir də, Qurban ocağı da, qəbri Aşıq Şəmşir məzarından aralı düşəcək Güllü nənə də, bu evin əziz qonaqları da xoşbəxt günlərini yaşayırdı.

Aşıq Hüseyn bir neçə gün Kəlbəcərdə qalandan sonra Dədə Şəmşirlə halal-hümmət elədi, ayrılıq məqamında görək Dədə Şəmşirə nə dedi, bu sənət ocağından necə ayrıldı:

Kəlbəcər dağları, salamat qalın,
Meylimi düzlərə salıb gedirəm.
Zirvələr önündə əyib başımı,
Dərin bir xəyala dalıb gedirəm.

Dünya yarıtmadı məni payından,
Nə ilindən doydum, nə də ayından.
Ceyran bulağından, Tərtər çayından
Vurğunun ətrini alıb gedirəm.

Hüseynəm, alışıb yanmaqdır peşəm,
Gərək Fərhad olub qayalar deşəm.
Qurban ocağında közə dönmüşəm,
Şəmşirin sazını çalıb gedirəm.

Dədə Şəmşir öz sənət dostuna uğurlu yol arzuladı:

Borçalıya məndən salam deyərsən,
Ay Saraçlı, sənə yaxşı yol olsun.
Nə götürdün ocağından Qurbanın,
Qoy daha da bəhrə-barı bol olsun.

Üzümüzün ağlığıdı yağan qar,
Sözümüzün sağlığıdı bağça-bar,
Bu dağlardan götürdüyün hər nə var,
Dalğalansın, dəniz olsun, sel olsun.

Şad elədin başı uca Şəmşiri,
Haqq qaldırıb taxtı-taca Şəmşiri,
Yada salın hərdən qoca Şəmşiri,
Söz-söhbətim ağızlarda bal olsun.

Borçalıdan çıxanda bir köhlən atnan çıxan Aşıq Hüseyn Saraçlı Borçalıya bir cüt qırılmaz qoşa qanadla qayıdırdı. O qanadın biri Göyçə – Ələsgər ocağı, o biri Kəlbəcər – Şəmşir ocağı idi. Aşıq elə bil yerlə yerimirdi, uça-uça buludların arasınnan gedirdi...

* * *

Qarabağ torpağı, muğamat beşiyi, tərlanlar oylağı, çaylar-çeşmələr-zəngulələr dünyası. Qoçaqlar – qaçaqlar yurdu, deyişlər – döyüşlər meydanı.

Qarabağ torpağı. Xanlığım, xaqanlığım, bəyliyim, bəyzadəliyim! Səni kimlər sevmədi, sənə kimlər vurulmadı? Kimlər gözəlliyinə əsir olmadı? Biri səni sevdi – viran qoyub talamaq üçün, odlara, atəşlərə qalamaq üçün. Biri səni sevdi – gözünə sürmə əvəzinə çəkib, daşını-torpağını duz kimi yalamaq üçün. Səsimin, nəfəsimin muzeyi, tarımın sədası, ruhumun qidası. Dastanlaşan ömürlərə, bayatılaşan talelərə qanad verən, Seyidlərə, Cabbarlara, Xanlara, Bülbüllərə həyat verən, dünyamıza Valeh kimi ustad verən Qarabağım, Qarabağım.

Kimlər sənin camalına valeh olub şairə, rəssama, xanəndəyə, sərkərdəyə, ozana dönmədi? Bu valehlərdən biri də Abdal-Gülablıda Aşıq Valeh oldu. Valehə valeh olanlar da çox oldu. Onlardan biri də aşıqdan xanəndəyə, sazdan muğama, Borçalıdan Qarabağa, Saraçlıdan

Abdal-Gülablıya körpü salan Aşıq Hüseyn Saraçlı oldu. Günlərin birində Qarabağı, Abdal-Gülablını, Aşıq Valehin məzarını ziyarət eləmək, Valehin nəticəsi Aşıq Xaspoladla görüşmək eşqinə düşdü.

Qoca Vidadinin

Külli-Qarabağın abi-həyatı,
Nərmi-nazik bayatıdır, bayatı...

– beyti ilə başlayan məşhur şeiri ilə Qarabağ bayatılarının içinə girmək, onu ağsaqqalların, ağbirçəklərin öz dilindən eşitmək havasına qanadlanırdı. Günlərin birində şəyirdi Aşıq Muradı da götürüb qədim Bərdəyə, ordan da Ağdama, Abdal-Gülablıya gəldi. Bu gəliş Aşıq Valeh ocağında əsl toy-bayrama çevrildi. Çünki Aşıq Xaspolad çoxdan idi Aşıq Hüseyn Saraçlını bu şeir-sənət ocağında görmək istəyirdi. Bu arzu yerinə yetmişdi. Şirin görüşdən, xoş-beşdən, yüngülvari bir çay süfrəsindən sonra Aşıq Səməd yadigarı Aşıq Valehin və Zərnigarın məzarını ziyarət eləmək üçün Abdal-Gülablının ağsaqqalları Hüseyn Saraçlı ilə birlikdə aşığın türbəsinin səcdəsinə gəldilər. Aşığın gözü birinci məzar daşlarının üstündəki şeir parçalarına sataşdı. Valehin qəbir daşında yazılmışdı:

Valeh ləqəbimdi, Şəfidir adım,
Allahı sevənlər, budur muradım,
Qəbrim yol üstündə irzilillələllah,
Hər gələn oxusun əlhəm, qülfəllah.

Zərnigarın məzar daşında yazılmışdı:

Adım Zərnigardı, əməlim saleh,
Bəxtimi qürbətə yönəltdi taleh.
Öləndə yazdırın məzarım üstə:
Sakini-Dərbəndəm, övrəti Valeh.

Məzar daşının üstündəki bu misralar Valehin və Zərnigarın daxili dünyasını açmaq üçün aşığa çox gözəl bələdçilik elədi: Allahın varlığına heyran olmaq, Tanrının qüdrətinə valeh olmaq, Yaradanın yaratdığına vurğun olmaq, həqiqətə tapınmaq, Allah kəlamını həmişə dildə zikr eləmək... Haqq aşiqlərinin bu məzarüstü şeirlərinin mənası Hüseyn Saraçlıya yeni bir dünya bağışladı. Bu məqamda aşığın dodağında qanadlanan misralar səs kimi, nəğmə kimi, ruh kimi, dua kimi məzar daşlarının üstündə dövrə vurur, İsaq-Musaq quşuna dönüb uçurdu. Hüseyn Saraçlının ürəyindən gələn sözlər ürəklərə süzülürdü:

Hər insanın bir ömrü var,
borandan, qardan keçib,
Hər aşiqin bir yolu var,
sınaqdan, dardan keçib.
Hardan-hara gedir getsin
söhbətində, sözündə,
Aşıqların doğanağı
Tanrıdan, yardan keçib.

Yaradanın ətəyindən
heç üzməyib əlini,
Heçə sayıb bu dünyanın
gövhərini, ləlini.
Qarabağın oğlu sevib
Dərbəndin gözəlini,
Başı qoyub yar yolunda,
sərvətdən, vardan keçib.

Yarın yarla peymanı var,
ilqarı var, əhdi var,
Sevgisinə qovuşmağa
sevənlərin cəhdi var.

Dilimizin nə qədər ki
şirəsi var, şəhdi var,
Həm Valehdən mayalanıb,
həm Zərnigardan keçib.

Ziyarətdən ayrılıb evə döndülər. Borçalıdan gələn qonaqların başına yığışan Abdal-Gülablı camaatı nə Aşıq Hüseyn Saraçlının sazından doyurdu, nə də Aşıq Xaspoladın Aşıq Valehlə bağlı sözündən-söhbətindən. Məclisin xahişi ilə iki ustad aşıq ayağa durub üz-üzə dayandı. Sazlar qoşalaşdı, nə qoşalaşdı:

Aşıq Xaspolad:

Bura muğam beşiyidi,
Hökmrandı tar havası.
Hər ürəkdə bir qız eşqi,
Hər başda bir yar havası.

Hüseyn Saraçlı:

Qaymaq üstə bal kimidi,
Tar üstündən saz havası.
Gümüş tellər dinən kimi
Gətirəcək yaz havası.

Aşıq Xaspolad:

Sevsəm də “Segah”ı, “Şur”u,
Sazdı gözlərimin nuru,
“Misri” təmiz, “Cəngi” duru,
Dağ başında qar havası.

Hüseyn Saraçlı:

Ay Xaspolad, gəlsin səsin,
Heç susmasın zilin, pəsin,

Burdan heç vaxt kəsilməsin
Gözəllərin naz havası.

Aşıq Xaspolad:

Xaspoladın ziyasıdı,
Dilimizin duasıdı,
Ruhumuzun mayasıdı,
Valeh-Zərnigar havası.

Hüseyn Saraçlı:

Saz – yurdun dağı-dərəsi,
Saz – ruhun bəndi-bərəsi,
Susmaz Saraçlı nərəsi,
Batmaz Xan Eyvaz havası.

Söz sözü, söhbət söhbəti çəkir, meydan get-gedə qızışır, aşıqlar coşub-daşır, könüllər havalanırdı:

Kür aşığın kürəyindən tər gedər,
Ya vurular, ya sənəti tərk edər.

Doğrudan da, aşıqların kürəyindən tər gedir, sinələri Valeh sevgisindən, Zərnigar məhəbbətindən güc alıb yeri-göyü qucaqlayır, Abdal-Gülablının başı üzərində Tanrının duaları kimi dalğalanırdı. Sazın kökünü dəyişib "Ruhani" havasına keçdilər.

Hüseyn Saraçlı:

Gəldim Qarabağa bahar çağında,
Öpdüm, əzizlədim torpağı burda.
Hayana baxdımsa nəğməli gördüm,
Hər otu, ağacı, yarpağı burda.

Aşıq Xaspolad:

Ustad ocağına xoş gəldin, ustad,
Güldürdün eyvanı, otağı burda.
Ozan gəlişinə sevindi güllər,
Qaçdı çiçəklərin dodağı burda.

Hüseyn Saraçlı:

Hansı obasına düşdüsə yönüm,
Çiçək sərgisiylə bəzəndi önüm,
Nənələr deyəndə "başına dönüm",
Alışdı ömrümün çırağı burda.

Aşıq Xaspolad:

Gündə min arzuda, min həvəsdədi,
Kimi zildən gedir, kimi pəsdədi,
Şirin ləhcədədi, qaynar səsdədi,
Axtarmaq nə lazım bulağı burda.

Hüseyn Saraçlı:

Yüz dərdə dərmandı bir çiçək ətri,
Dünyadı Hüseynə duz-çörək ətri,
Ağsaqqal nəfəsi, ağbirçək ətri,
Tanrıya döndərdi qonağı burda.

Aşıq Xaspolad:

Xaspolad səsini səslərə qatıb,
Söhbəti ellərin qəlbinə yatıb,
Vaqiflər yandırıb, Valehlər çatıb,
Sönərmi sənətin ocağı burda?

Aşıqlar coşqun-havalı bir məclis keçirib dincəlmək üçün camaat gedəndən sonra mütəkkəyə, balınca söykənib şirin, duzlu-məzəli, dirsək söhbətləri elədilər.

O günlərdə olan bir söhbətin haşiyəsi:

İki ustad aşıq şirin-şirin söhbət elədikləri yerdə Aşıq Xaspoladın arvadı qaşlı-qabaqlı evə girdi. Xaspoladın sözündən məlum oldu ki, onun ömür-gün yoldaşının aşıq tayfası ilə qəti arası yoxdu. Hüseyn Saraçlı gördü ki, aşığın arvadının əlində bir qab yumurta var. Soruşdu: "Ay bajı, o nə yumurtasıdı elə?" Arvad dedi: "Qonaq qardaş, sənə qayğanaq bişirmək istəyirəm". Hüseyn Saraçlı özünəməxsus bir gülüşlə: "Ay bajı, mən qatar ayağına tələsmirəm, biletim yanmır, hələ Allah bilir neçə gün burda qalajam, quzunu, erkəyini qıymırsanmı, mənə yumurta bişirirsən? Beş-on yumurta heç mənim şəyirdimə yetməz". Aşıq Xaspolad arvad sarıdan bir az yaralıydı. Ona görə də yaranan fürsəti fövtə verməmək üçün görək ömür-gün yoldaşını Aşıq Hüseyn Saraçlıya necə təqdim elədi, biz deyək, siz də şad olun:

Min mənə andırır dolğun gözlərin,
Niyə pərişansan, ay bizim arvad?
Hamı şadlıq edir, gülür, oynayır,
Sən nədən salırsan vay, bizim arvad?

Nə vaxt dindirirəm olursan bihal,
Düşür evimizə hər gün qalmaqal,
İnsafı, mürvəti bir az yada sal,
Məni də bir adam say, bizim arvad.

Aşıq Xaspoladı gətirdin cana,
Bais olma indi sən nahaq qana,
Uzaq yoldan gələn əziz mehmana,
Gətir bir istəkan çay, bizim arvad.

Bu şeiri Xaspolad kişi elə şirin və turşməzə bir tərzdə oxudu ki, aşıqlar da, arvad da o ki var ürəkdən güldülər. Xaspolad kişi dedi: "Ay Hüseyn kişi, səndən xahiş edirəm, bu üç gündə Aşıq Valeh ocağında yaddaşına nə yazdınsa, hamısını ellərə-obalara yay. Ancaq arvadla bağlı söhbəti heç kəsə demə. Sənin bu şəyirdin Aşıq Muraddan da heç gözüm su içmir, gözü-başı yaman oynayır, qorxuram sözü dağıda, baya, Baydara xavar eləyə".

Hüseyn Saraçlı dedi: "Xaspolad kişi, ürəyini buz kimi saxla, heç kəsə deyən, xəbər verən deyiləm. Bir toyda danışasıyam, bir vayda". Yenə gülüşmə qopdu...

XX əsrin 80-ci illəri idi. Məşhur İraq–Türkmən şairi Əbdüllətif Bəndəroğlu Bakıya qonaq gəlmişdi. Şairlər, yazıçılar, alimlər canı-qanı, dini-imanı, kitabı-Quranı bir olan, bizim olan, bizlərnən olan şairi çox böyük sevgiylə, məhəbbətlə qarşıladılar.

Bir-birindən maraqlı görüşlər, məclislər keçirdilər. Belə görüşlərin birində unudulmaz xalq şairi Osman Sarıvəlli Əbdüllətif Bəndəroğluna müraciətlə dedi:

– Şair qardaş, ürəyin nə istəyir bizə de, sənə adımıza layiq bir hədiyyə təqdim etmək istəyirik.

Bəndəroğlu heç fikirləşmədən dedi:

– Hörmətli Osman müəllim, sizin türkmən qardaşlarınıza ən böyük hədiyyəniz ancaq və ancaq saz ola bilər. Ona görə saz deyirəm ki, biz o sazda birləşirik. "Vidadi xəstədən Bağdad elinə, Siz yetirin bir nişanə, durnalar" deyən qoca Vidadini də sazın ruhu yetişdirib.

Bu arzu ağsaqqal şairimizin və bütün məclis əhlinin ürəyindən oldu. Osman Sarıvəlli gülümsündü və "Bəndəroğlu, sən lap bizim ürəyimizi oxudun, – dedi... – Bizim də fikrimizdən saz keçirdi. Vaqiflə Vidadi durnalara söz qoşmuşdu. Elə saz da durnaboğazlı müqəddəs bir dünyadı. Qoy həmişə ellərimizdə, obalarımızda saz dillənsin".

Bu məclisdən sonra Osman Sarıvəlli dostu Aşıq Hüseyn Saraçlıya ismarıc göndərdi ki, ay aşıq, Kərkükdən bir hörmətli qardaşımız qonaq gəlib, ona ərməğan eləmək üçün bir yaxşı saz lazımdı. "Arifə bir işarə" deyiblər. Hüseyn Saraçlı şair dostunun ismarıcını canla-başla yerinə yetirdi.

Telli sazın əziz qonağımız Əbdüllətif Bəndəroğluna təqdimetmə günündə ustadımız Osman Sarıvəlli, xalq şairi Hüseyn Arif, Aşıq Hüseyn Saraçlı, görkəmli alim – Azərbaycanla İraq arasında mənəvi körpülər salmış Qəzənfər Paşa ilə birlikdə bu dastanı qələmə alan mən – Zəlimxan Yaqub da iştirak edirdim.

İraq türkmənlərinin Türkiyədən və Azərbaycandan ayrı düşməsi, kökümüzün Şumerlərə, Dəclə və Fərat arasındakı torpaqlara bağlılığı, əsrin əvvəllərində ingilislərin türklərə xəyanəti nəticəsində Mosulun, Kərkükün Türkiyədən, Anadolu məmləkətindən zorla ayrı salınması, Türkiyəni və türkləri içindən və çölündən qarışdıranlar, İraqda türkmənlərin çəkdiyi əzab və işgəncələr, başqa millətlərin basqısı altında yaşanan faciələr, Kərkük ellərində ruhumuza, sazımıza, sözümüzə, yaddaşımıza olan haqsız hücumlar sözümüzün, söhbətimizin canı-qanı idi.

Məclisin ağırlaşdığını görən Osman Sarıvəlli Aşıq Hüseynə sarı dönüb uca səslə "Onsuz da dünyanın dərdləri qurtaran deyil, yenə əlac saza qalıb, gör neyliyirsən, ay aşıq", – dedi.

Ustad şairin sözü ustad aşığı ayağa qaldırdı. Bəndəroğluna bağışlanan saz dil açıb danışmağa başladı. Hüseyn Saraçlı özünəməxsus bir şirinliklə bir xeyli çalıb-oxuyandan sonra böyük şairə müraciətlə dedi:

– Osman müəllim, Bəndəroğluna hədiyyə verilən sazın eşqinə icazə verin bizim gənc şairimiz Zəlimxan bir neçə kəlmə söz desin.

Ustad "buyursun, icazədi" – dedi. Mən çox həyəcanlı idim. Çünki belə mötəbər bir məclisdə, böyük

kişilərin qarşısında söz danışmalıydım. Üzümü məclisə tutub hədiyyə verilən saza müraciətlə şeir oxumağa başladım:

Dostluğun nəğməsi baldan şirindi,
Tellər bu eşq ilə ötür, ay sazım.
Sən varsan, həyatda mən varam demək,
Səsimi hər yana yetir, ay sazım.
Göstər qüdrətini sən dost ellərə,
Dünyanı yurduma gətir, ay sazım.
Bu uzaq səfərdə uğurlar sənə,
Həsrəti dünyadan itir, ay sazım.
Orda nəğməkarım, şairim yatır,
Müqəddəs məzarı ziyarət üçün,
Bir ovuc torpaq da götür, ay sazım.
Abbası Gülgəzə yetirən kimi,
Mənim salamımı, mənim sözümü
Babam Füzuliyə yetir, ay sazım.
Yetir, nəğmə yetir, nişanə yetir,
Vidadi xəstədən Bağdad elinə.
Dindir bulaqları, dindir çayları,
Qarışsın nəfəsin səhər yelinə.
Saz köynəkdən çıxsa, el yasdan çıxar,
Danış, telli sazım, özündən danış.
Aləmi yandırıb, özü yanmayan,
Quru taxtadakı dözümdən danış.
Ovçular ovdadı, ehtiyat eylə,
Səni durna bilib vuran olmasın.
Bir telin qırılsa bağlamaq olar,
Könül tellərini qıran olmasın.

Şeir sona çatan kimi alqış sədaları göylərə ucaldı. Hamı yenidən ilhama gəldi. Osman müəllim buyurdu:

– Bir halda ki, gənc şairimiz məclisi belə coşdurdu, onda davam edirik. Gəlin hərəmiz bir bənd şeir oxumaqla saz-söz məclisini daha da gözəlləşdirək. Qoy Kərkükdən gələn şair dostumuz təkcə sazı yox, həm də bu şirin və tarixi məclisi gözəl bir xatirə kimi Kərkükə ərməğan aparsın.

Osman Sarıvəlli:

Könül ilham alsın dost gəlişindən,
Qoy şirin dillənsin saz, Bəndəroğlu.
Dünya gözəlinə dönsün telli saz,
Eyləsin məclisə naz, Bəndəroğlu.

Aşıq Hüseyn Saraçlı:

Sevinc qanadlana, qəm boyun bükə,
Çiyin tab gətirməz dağ boyda yükə.
Gedək Borçalıya, gedək Kərkükə,
Ömrümüz olsa da az, Bəndəroğlu.

Hüseyn Arif:

Ömrümüz bürküdən, sazaqdan keçir,
Yolumuz yaxından, uzaqdan keçir,
Borçalının yolu Qazaxdan keçir,
Keçmə bu təklifdən vaz, Bəndəroğlu.

Zəlimxan Yaqub:

Qəlbi havalandır, ruhu təzələ,
Burdadı Xan Kərəm, burdadı Lələ.
Məclisin söhbəti uzundu hələ,
Gördüyün nə varsa yaz, Bəndəroğlu.

Əbdüllətif Bəndəroğlu:

Mən türkəm, türk mənəm, min il yaşım var,
Tanrı dağlarından uca başım var.
Mənim ki, bu qədər qan qardaşım var,
Sizə qurban olsun yüz Bəndəroğlu.

Heyranlıqla bu şeirləşməyə diqqət kəsilən alim dostumuz Qəzənfər Paşa özünü saxlaya bilməyib ayağa durdu. Üzünü Osman Sarıvəlliyə tutub dedi:

– Osman qağa, sizdən üzr istəyirəm, mən şair deyiləm, ancaq Səməd Vurğun demişkən: "Az-az uydururam yeri gələndə". Sizin bədahətən oxuduğunuz bu şeirlər o qədər şirin oldu ki, deyəsən, mənə də şairlik gəldi. Gərək birini də mən deyəm.

Osman Sarıvəllidən bir şaqqanaq, gülüş qopdu. Dedi: "Ayə, ay Qəzənfər müəlllim, sən şair olmasan, burda nə işin var, çəkinmə, ürəyində nə var, de gəlsin".

Qəzənfər Paşa:

Hər fikrin, hər sətrin yeddi qatı var,
Hər qatda min dastan, min bayatı var.
Xalqımın nə zəngin bir həyatı var,
Dəyməsin bu xalqa göz, Bəndəroğlu.

Alqış sədaları yenidən məclisi başına götürdü. Ustad aşığın, ustad şairlərin nəfəsində, söhbətində, sözündə İraqla Azərbaycan, Bağdadla Bakı, Kərküklə Borçalı bir-birinə sarı qanadlanıb uçurdu. Yenə Osman Sarıvəlli dilləndi: "İndi gəlin meydanı verək Aşıq Hüseyn Saraçlıya, qoy bizi kövrək havaların qanadında hara qədər bacarır aparsın".

Aradan illər keçdi... Mənim ürəyimə daman şübhələr həqiqət oldu. Fürsət yoxsulu olan əliqanlı ovçular Bakıdan Bağdada gedən sazın könül tellərini qırdılar. İraq

dağıldı, daşı daş üstə qalmadı, Kərkükdə, Mosulda talanlar başladı.

Aradan illər keçdi...

Şərə-böhtana, qana-qırğına saldılar Qarabağı. Borçalıdan köç başladı. Yüz ildi bu köç yavaş-yavaş gəlirdi, indi çox iti yerişlə gəlir. Nə Kərkükdə başlanan talanın qarşısın ala bilirik, nə Borçalıdan başlanan köçün yollarını kəsə bilirik, nə Qarabağımızı qaytara bilirik. İtkilərimizdən, ağrılarımızdan bizə yaralı havalar, qəmli bayatılar qalır.

Kərkükün bu gününü görsəydi Aşıq Hüseyn Saraçlı, yəqin ki, sazın-sözün diliylə Kərkükə, Borçalıya belə layla çalardı:

Bu gün sənin taleyini
düşünürəm,
Ağır gündə üstünü
od alan Kərkük.
Öndə qatil, sağda düşmən,
solda yağı,
Yurd-yuvası, el-obası
talan Kərkük.

Dərdlərini zirvələrə
tən bilirəm,
Əzabını saçlarıma
dən bilirəm,
Borçalıyam, nə çəkirəm
mən bilirəm,
Borçalıtək könül bağı
talan Kərkük.

Beş yüz ildi Boyat səndə,
Nəsim səndə,
Məndən qopan ruhum səndə,
səsim səndə.

Gəl qovuşaq, qurbanımı
kəsim səndə,
Bəd xəbərlər yalan olsun,
yalan, Kərkük.

Əvvəlkitək vuran əlim
yoxdu hələ,
Qılınc çəkib, coşan dəlim
yoxdu hələ,
Fateh yoxdu, Sultan Səlim
yoxdu hələ,
Gözlə görək, gözü yolda
qalan Kərkük.

Harda zor var,
orda xəbis barmağı var,
Harda şər var,
orda iblis barmağı var,
Taleyində bir
"ingilis barmağı" var,
Qızıl ilan qismətini
çalan Kərkük.

Qarabağ da Ərbil, Mosul
talelidi,
Ruhu girov, özü yoxsul
talelidi,
Əzilənin taleyi qul
taleyidi,
Yıxdı səni filan oğlu
filan, Kərkük.

Dönə-dönə sındırıblar
inadını,
Uça bilmir, tale qırıb
qanadını.

Məkkə bilib öz adını,
soyadını,
Namazını Türkə sarı
qılan Kərkük.

Cəllad deyək, yağı deyək
bəxtimizə,
Ömrün qara çağı deyək
bəxtimizə,
Layla çalaq, ağı deyək
bəxtimizə,
Sən anam ol, mən də sənin
balan, Kərkük.

* * *

Adına dastan bağlamağım yaman ürəyinə yatmışdı. Son vaxtlar tez-tez yuxuma girirdi. Bəlkə də Allah yuxuları ona görə yaradıb ki, diriynən ölünün görüşməsi həmişə olmasa da, hərdənbir mümkün olsun. Yenə yuxuma girmişdi. Bu dəfə həmişəkindən fərqli olaraq çox şad-xürrəm idi. Görüşdük, salamlaşdıq. Gümüşü qutusunu çıxardıb Trabzon tütününü gözün işığını çəkən ağ, nazik kağıza bükdü, damağına qoydu. Əvvəla onu deyim ki, Allah bu kişiyə ilahi bir nizam-intizam, səliqə-sahman vermişdi. Görənlər yaxşı bilirdi ki, onun Trabzon tütündən siqar eşməyi ayrıca bir mənzərə idi, rəssam istəyirdi bu anı yaratsın. Rənglərin dilində danışdırsın. Yenə adəti üzrə bığlarını eşib, sığallayıb gülə-gülə dedi:

– Ay şair, rəhmətlik Ələsgər kişi deyirdi ki:

Adım Ələsgərdi, mərdi-mərdana,
On iki şəyirdim işlər hər yana.

Ayə, göz dəyməsin, şükür Allaha, mənim də yaxşı ustalaşmış şəyirdlərim var. Amma mən şəyirdi götürəndə

o adamın əslini-nəslini, halal-haramlığını, nəfsini-nəfəsini, insanlığını ələyib ələkdən keçirir, sonra şəyird götürürəm.

Bir gün bir kişi oğlunu Aşıq Hüseyn Saraçlıya şəyird vermək üçün Saraçlıya gəlir. Aşığa peşkəş eləmək üçün yaxşı bir toğlu da gətirir. Aşıqla qonaq arasında mətləb aydın olanda Aşıq Hüseyn deyir: "Qardaş, çox yaxşı fikirdi. Gətirdiyin toğlunu ot tayasının üstünə burax, oğlun da qoy üç gün bizdə qalsın. Üç gündən sonra gəl, məsələni aydınlaşdıraq". Belə də olur. Üç gündən sonra oğlanın atası gəlir ki, vəziyyətdən hal olsun. Aşıq deyir: "Ay qardaş, üç gündə mən bu sənətlə bağlı sənin oğlundan üç qəpiklik bir şey qana bilmədim. Məndən incimə, sən mənim qapıma bir yox, iki qoyun gətiribsən. İkisini də apar, çıx get. O oğlun, bu da toğlun".

Payızın son ayıydı. Aşıq qapıya bir maşın odun tökdürmüşdü. Biləyini çırmayıb doğranan kötükləri yarmaqla məşğul idi.

Bu vaxt qapı döyülür. Aşıq qapını açır ki, boylu-buxunlu, yaraşıqlı bir oğlandı. İçəri dəvət edir. Deyir: "Qardaşoğlu, bir az gözlə, mən bu kötüyü yarım, sonra söhbətimizi edərik. Ona qədər siz əyləşin". Oğlan əyləşmir, əlini qoyur belinə, aşığın odun yarmağına tamaşa eləyir. Yalannan quşqun təklifi də olsa demir ki, əmi, icazə ver sənə kömək eləyim. Tərslikdən də kötük qozbel, düyünlü dəmirqara kötüyü olur. Baltanın, pazın ağzını geri qaytarır. Nəysə... aşıq işi yarımçıq qoyub, əl-üzünü uyub, daranıb, durunub, saçlarına sığal çəkib, bığlarını eşib, odun yaran Hüseyn kişidən əsil Aşıq Hüseyn Saraçlıya çevrilib əyləşir oğlanın qabağında. Deyir: "Oğlum, buyur, eşidirəm". Oğlan deyir: "Əmi, bu sənətə böyük sevgim var. Sizə şəyird gəlmək istəyirəm". Aşıq Trabzon tütünündən siqar eşə-eşə deyir: "Bu, çox gözəl, oğlum. De görum, hansı qohumlardansan, kimlərdənsən, hansı nəsildənsən?" Oğlan deyir: "Əmi, mən ağalardanam, filan ağanın oğluyam".

Aşıq bircə kəlmə deyir:

– Ay oğul, mən ağa nəslindən şəyird götürmürəm.

Aşıq Hüseyn Saraçlı söhbətinə davam elədi ki, şəyirdlərimin heç biri yarımənzildə, yarıyolda qalmadı:

– El içində dilimi uzun, başımı uca elədilər. Heç biri üzümə ağ olmadı. Hamısından razıyam. Hər yerdə adımı andılar, söhbətimi saldılar. Sözümü-söhbətimi ellərə yaydılar. Mən də onlara az əmək çəkmədim, halal xoşları olsun.

Bir şəyird ki, ustadına kəm baxa,
Onun gözlərinə ağ damar-damar.

Ələsgər babam bu sözü yerli-yataqlı deyib.

Mənim şəyirdlərimin hər biri ad aldı, şan-şöhrət sahibi oldu. Sarallar Aşıq Əmir ilk şəyirdim olub. Onun xəzinəsi çox zəngin idi. Məhəmməd Sadaxlı, Əhməd Sadaxlı, Nurəddin Qasımlı, Sədi Ulaçlı, ... son şəyirdim xətrini çox istədiyim Aşıq Muraddı. Axırıncı dəfə sazımı Dəllərdə onun oğlunun sünnət toyunda çalmışam. Ondan sonra fələk aman vermədi. Şəyirdlərimə dərs verəndə, sənətlə bağlı incə mətləblərə toxunanda çox tələbkar olurdum. Di gəl ki, kefimin kök vaxtına düşəndə hərəsinə bir atmaca tullayırdım. Amma atmacanı elə yerində və vaxtında deyirdim ki, heç kəs məndən incimirdi: məsələn, Aşıq Əhməd çox arığıydı, ona deyirdim, ay camaat, siz Allah buna baxın, atdı qarışqaya oxşayır. Aşıq Məhəmməd Sadaxlı çox uzunuydu. Deyirdim, ay camaat, mən ölüm, bu uzunluqda aşıq görübsünüzmü? Kimin borcu var bu il alsın, gələn il heç kəsin əli çatmayacaq. Aşıq Sədi kök və dolu bədənli idi. Deyirdim, birdən bilməzsiniz, bunu qonaq çağırarsınız. Qətiyyən elə iş görməyin, kim qonaq çağırsa, evi yıxılıb. Bir erkək kəssələr, bircə tikə bunun boğazından artmaz ki, ev yiyəsi də nüyvər eləyə.

Aşıq Murad çox cansız-cələfsiz idi. Deyirdim, daha bu yazığa nə deyim, bunu da özünüz görürsünüz, ayağı üstə qırxı çıxıb.

Amma ay şair qardaş, Allahdan gizlin deyil, səndən nə gizlin. Muraddan ötrü burnumun ucu göynəyir. Ölmüş məndən betər çox zarafatcıldı. Məndən çox şey götürdü. Daha çox baməzə, turşməzə tərəflərimi. Səndən bircə xahişim var: gözün həmişə onun üstündə olsun. Bir az xəstələndi, səsi kalladı, boğaz-başı tutuldu, amma yenə ustalıq dadına çatır. Onun sazbənd olmağı məni çox sevindirir. Əgər bu sənətə yiyələnməsəydi, aşıqlıq onu dolandıra bilməzdi. Ölmüşün quruluğuna baxma, canı sağlamdı, dəf kimidi. Amma yanında bir qəmli hava çalıb, bir kövrək söz oxuyan kimi gözünün yaşı ovcundadı. Ona görə də adını övrək Murad qoymuşam. Çox zarafatcıl olmağına baxma, nə çəkir, içəridən çəkir.

Sözün bu yerində dedim: "Ay ustad, Aşıq Muradı mən də çox sevirəm. Bir halda ki, hər ikimizin ona sevgimiz var, deyirəm, Aşıq Murada bir qələm çəkək ki, səs-sorağı qiyamətə qədər getsin".

İndi görək Aşıq Hüseyn Saraçlı nə dedi, Zəlimxan ona nə cavab verdi:

Aşıq Hüseyn Saraçlı:

Ay Zəlimxan, son şagirdim Muraddı,
Öz işində qızılquşdan zirəkdi.
Baxma onun arıq-quru canına,
Zalım oğlu başdan-başa ürəkdi.

Zəlimxan Yaqub:

Ozan lələ, sözlərində haqlısan,
Aşıq Murad saza, sözə gərəkdi.

Yeməyini, içməyini versələr,
Bir yıxılı, uçuq dama dirəkdi.

Aşıq Hüseyn Saraçlı:

Heç doymurdu gözəllikdən, gözəldən,
İndi rəngi heç seçilmir xəzəldən,
Onu elə bəsləyirdim əzəldən,
Deyirdin ki, yağ içində böyrəkdi.

Zəlimxan Yaqub:

Həvəskardı möhkəm vurub yatmağa,
Dərd selində, qəm gölündə batmağa,
Yüz ili var gəlib sənə çatmağa,
Amma sözü yağdı, baldı, çörəkdi.

Aşıq Hüseyn Saraçlı:

Nizamlayır bülövünü, daşını,
Saza verib ürəyinin başını,
Sazbənd işi yaman qatıb huşunu,
Xeyrə-şərə get-gəlişi seyrəkdi.

Zəlimxan Yaqub:

Ərşə çıxır dumanları, tozları,
Göyə qalxır işvələri, nazları,
Qaş-gözünən əyləndirir qızları,
Şükür Haqqa, atı hələ yüyrəkdi.

Aşıq Hüseyn Saraçlı:

Yerindədi, sərrast ağlı, huşu var,
Əllərində neçə tərlan quşu var,

Aşıqları dolamağa xoşu var,
Aradabir fırıldaqdı, kələkdi.

Zəlimxan Yaqub:

Xoşu gəlir bildirçindən, cücədən,
Bəsdi deməz gecə keçsə gecədən,
Şirə dönür çox vuranda cecədən,
Deyirsən ki, fələk oğlu fələkdi.

Aşıq Hüseyn Saraçlı:

Saz yerində, söz yerində, Zəlimxan,
Qaş yerində, göz yerində, Zəlimxan,
Bu zarafat öz yerində, Zəlimxan,
Kövrək Murad kövrəkdi ki, kövrəkdi.

Bugünkü görüşümüz turşməzə, baməzə bir söhbətlə başlamışdı. Ancaq kədərli bir söhbətlə bitdi. Keçəldən, kosadan, təhnənin qalaylanmağından, fil həkimliyindən, dəvənin, tülkünün, keçinin əhvalatlarından o danışır, mən də qəşş eləyib gülürdüm.

Aşıq deyirdi: "Allah o evi dağıtsın ki, o evə qonaq gəlməyəcək, Allah o qonağın da evini dağıtsın ki, axşam gəlib sabah getməyəcək".

Aşıq deyirdi: "Fatma qarının nöyüdü qurtarmışdı. Çırası keçmişdi. Qaranlıqda qalmışdılar. Gəldi qonşusu Tükəzban arvadın yanına ki, ay Tükəzban bajı, bir çıra başı nöyüt ver, qaranlıqda qalmışıq. Dedi: "Get qab gətir, töküm apar". Tükəzban arvad dedi: "Ay Fatma bajı, kişilik zamanasından 50 il keçib, qorxuram mən gedib-gələnə qədər fikrini dəyişəsən. Gətir tök donumun ətəyinə, ətəyimdə apararam".

Aşıq deyirdi: "Birinin atı qaçırdı. Gördü qarşıdan bir oğlan gəlir, dedi: "Ay oğul, zəhmət olmasın, bir o atı

qaytar". Oğlan dedi: "Dodağım ağrıyır". Kişi dedi: "Dodağın bura nə qarışacağı var?" Oğlan dedi: "Çox böyük qarışacağı var. O atı qaytarmaq üçün mən gərək dodağımla "duvvv!" eliyəm, ona mənim halım yoxdu".

Oğlanın sözü olmasın, mənim də dilim ağrıyır. Dinirəm – dilim bağlı, gedirəm – yolum bağlı, uçuram – qolum bağlı. Bəs qəbir evində mənə imarət, səltənətmi düzəldəsiydilər. Mən gələn yerə heç kəs vaxtsız gəlməsin".

Qapım, bacam bağlanıb,
İşıq düşmür, yel çəkmir.
Qırılan ürəyimə
Bir kimsənə tel çəkmir.

Düşüncəyəm, fikirəm,
Şumlayıram, əkirəm,
Mən ondan əl çəkirəm,
Fikir məndən əl çəkmir.

Dərdi, qəmi bol çəkdim,
Ölümümə qol çəkdim,
Mən hamıya yol çəkdim,
Heç kəs mənə yol çəkmir.

Söhbətin əvvəlində ürəkdən qəşş eləyib gülsəm də, yuxudan göz yaşları içində ayıldım. Əlacım dərddi başımın çarası qara saza qalmışdı. Sazı götürüb, qəmli-qəmli, vaxtsız ölənlərin, yetim qalanların halını gözümün qabağına gətirib "Bayramı" havası üstündə asta-asta oxumağa başladım:

Hər gedən bir cürə getdi dünyadan,
Dünyayla döyüşdü, qovğa apardı.
Biri sadələrdən sadə göründü,
Biri çox özünü lovğa apardı.

Kimin açılmadı baxtı, müşkülü,
Kimin açılmamış saraldı gülü?
Yanıq kərəmləri atəşin külü,
Dəli məcnunları səhra apardı.

Kimi zildən getdi, kimi pəs oldu,
Kimi sükut oldu, kimi səs oldu,
Kiminin sinəsi boş qəfəs oldu,
Kimi sinəsində dərya apardı.

Həyat başdan-başa nurdu, ətirdi.
Fikirlər, duyğular sətir-sətirdi,
Hər kəs bu dünyaya zərrə gətirdi,
Hər kəs bu dünyadan dünya apardı.

Bəli, Aşıq Hüseyn Saraçlı sinəsində qara torpağa bir dərya söz apardı. Onun dediklərini indən belə heç kim, heç zaman onun özü kimi deyə bilməyəcək.

* * *

Borçalıdan yas yerindən təzəcə qayıtmışdım. Çox fikirliydim. Tez-tez Kəpənəkçiyə gələ bilmədiyim üçün kənddə bir neçə yas yerinə dəyməli oldum. Dərd təkcə ölənlərin dərdi deyildi, dirilərin dərdiydi.

Dedilər ağırdı, sağalmağı Allaha qalıb. Cavan, ağır bir xəstəyə də baş çəkəsi oldum. Üzündən öpdüm, bağrıma basdım. Hər ikimiz ağlamamaq üçün dişimizi dodağımıza sıxmışdıq. Birtəhər özümü yığışdırıb hal-əhval tutmaq istədim.

Şairlə xəstənin sual-cavabına fikir verin:

– Nə var, nə yox?

– Nə olasıdı, ağzım aşa yetəndə başım daşa yetdi. Yeməyin-içməyin, işdahın necədi?

– Nə yiyəsiyəm indən belə, çörəyim buz, xörəyim qar. Eşik qar, içəri dar.

– Darıxma, sağalarsan, inşallah, niyə özünü çox sıxırsan?

– Yazan yazıb fərmanı,
Yox dərdimin dərmanı.

– Qorxma, ayağını torpağa möhkəm bas.

– Nəmi nəmdi torpağın, tozu tozdu torpağın,
Üzü bozdu torpağın, məni unudacaqlar.

Gördüm xəstə məni görüb, yarası deşilib. Nə sual verirəm şeir üstündə, qafiyə üstündə cavab verir. Mənim də yaralarım göz-göz olmuşdu. Onu bir də bağrıma basıb: "yasdığın yüngül olsun" deyib ayrıldım.

...Qar yağıb, qapını kəsib, hər iki qapıdan birinin üstündə bir kilo ağırlığında paslı qıfıl asılıb. O qıfıl təkcə qapılardan asılmayıb, arzulardan, ümidlərdən, düşüncələrdən, əllərdən, ayaqlardan asılıb. Pas qapıları elə tutub ki, açanda bağlamaq olmur, bağlayanda açmaq.

Pas təkcə qapıları tutsaydı nə vardı, yağ töküb açmaq olardı. Pas həm də ürəkləri, duyğuları, gözləri, könülləri tutub. Tüstüm dumana dönüb, ərşə bülənd olmuşdu. Ölənlərin sayı çox, doğulanların sayı az. Bu o deməkdir ki, bizi qarşıda ərimək, çürümək, yox olmaq, qeybə çəkilmək təhlükəsi gözləyir.

Bu elin nələri vardı, ilahi! Ağsaqqalı, ağbirçəyi, aşığı, şairi, xanəndəsi, həkimi, müəllimi, qoçusu, güləşçisi, əkinçisi, biçinçisi, bağbanı, arana enəni, dağa çıxanı, alaçıq quranı, dəyə tikəni, hər şeyi, hər şeyi, hər şeyi. İndi nəyi var? Heç nəyi, heç nəyi, heç nəyi!!!

Aradan çox yox, balaca bir tarix keçib. 20 il. Bu 20 ildə 20 dəfə sökülmüşük, dağılmışıq, səpələnmişik. Elə səpələnmişik ki, bir yerə yığıla bilmirik. Mən bilirəm ki, bu illər ərzində Kəpənəkçi boyda kənd, Borçalı boyda mahal nələr çəkib. Biz çəkəni Allah heç kəsə göstərməsin.

Hər kəsə bir sirdaş yaradıb Allah,
Quşun ağrısını quş gözəl bilər.

Adamdan soruşma daşın halını,
Daşın ağrısını daş gözəl bilər.

Dərdimiz dənizdi, ömrümüz ada,
Nə candan dərd əskik, nə başdan qada.
Ayaqlar nə çəkib daşda, qayada,
Hərdən daşa dəyən baş gözəl bilər.

Axtarır zilini, tapır bəmini,
Hər kəs yaxşı bilir öz aləmini.
Vaxtın acısını, qəlbin qəmini,
Yanaqdan süzülən yaş gözəl bilər.

Bülbül səsi eşitmək istəyirəm, qulaqlarıma bayquş, qarğa səsləri gəlir. Heç kəsin üzü gülmür, sevinmir. Sevinən bircə varlıq varsa, o da bayquşdur. Viranələr, xarabalar, xarabalıqlar vurğunu bayquş!

Elə bu ovqatla da yenə Aşıq Hüseyn Saraçlıyla yuxuda görüşürük. Yaxşı ki, heç olmasa bu yuxu andırsa varmış. Gördüm aşıq yaralıdı. Əlində cuna var. Dedi: "Mənim əlim tutmur, gör mənim yaramı sarıya bilərsənmi?" Nə qədər əlləşdim, vuruşdum, tər tökdüm, aşığın yarasını sarıya bilmədim. Bu gün hamı yaralıdı, heç kəs heç kəsin yarasını sarıya bilmir. Aşıq hirslənib yaranın qaysağını qopartdı. Yaradan qan axmağa başladı. Damla-damla axan qan selə döndü; sel bir çökəyə axırdı, o çökək də gölə, göl də dənizə dönürdü. Aşığın baxışı da qanlı idi. Qanlı-qanlı axan qana baxıb dedi: "Yaxşı bax, qanın töküldüyü çökək Borçalı çökəyidi". Aşıq göz yaşları içində bayatı çəkdi:

"Əziziyəm, qanlı səni,
Qadalı, qanlı səni.
Getmə gözüm önündən,
Tutaram qanlı səni".

Baş-başa verib, ikimiz də o ki var ağladıq:

“Gəl gedək baş bulağa,
Ürəyi daş bulağa.
Yenə baş-başa verək,
Axıdaq yaş bulağa”.

Nə o kiriyirdi, nə də mən. Əli xınalı oğlu ölmüş atalar kimi ağlayırdıq. Birdən qulağımıza bir səs gəldi: “Ağlamayın, kişi də ağlayarmı?” Aşıq bu səsin hardan gəldiyinə fikir vermədi. Hansı avam bu sözləri dillərə salıb? Aşıq burda daha bərkdən bayatı çəkdi, özünü soyutmaq istəsə də, ürəyi soyumadı:

“Əzizim, ağlağandı,
Qaraxaç, Ağlağandı.
Götürək yaş yaylığı,
Görək kim ağlagandı”.

Kişi də ağlayarmı?

Bu nə sualdı? Ağlayar da, canı da çıxar. Yadımdadı, vaxtilə analar uşaqlara qarğayanda “ay yurdu itmişin oğlu” deyərdilər. Yurdum itib, yuvam uçub, evim yıxılıb, hasarım dağılıb, cığırımı ot basıb, əzizim ölüb, balam qürbətdə, özüm həsrətdə, nə dirinin hayına, nə ölünün vayına çata bilirəm. Daşammı, ağacammı, dəmirəmmi, məni ana doğmayıbmı? Ağlayaram da, canım da çıxar, gözüm də bozarar, nəfəsim də kəsilər. Boş qürrədən, yalançı təkəbbürdən, özünü aldatmaqdan kim qazanıb ki, biz də qazanaq.

Əgər mən bir aşığın yarasını sarıya bilmədimsə, elin yarasını necə sarıyım? Ağrımayan yoxdu, hamı yaralıdı. Dağ yaralı, daş yaralı, qaya yaralı, ağac yaralı, torpaq zəhərli, göylər tüstülü, sular bulannıq, çöllər yanğılı. Sızıldama, üşümə, göynəmə, bürüşmə, yaşa görüm necə yaşayırsan?

Qalxmaq istədim, yerimdən dura bilmədim, yerimək istədim, qıçım sözümə baxmadı. Aşıq mənə ayağa durmaq üçün kömək eləmək istədi, bacarmadı. Elə yerimdəcə dedim:

– Kaş mən də sən ölən gün öləydim, cənazəmizi bir yerdə qaldıraydılar. Amma Borçalını qanı axan görməyəydim.

Bu qırılan, şikəst olan,
Qıç mənim qıçımdı, Lələ.
Niyə yerimdən oynadım?
Suç mənim suçumdu, Lələ.

Ağır ellərin yasıyam,
Qəmli tellərin pasıyam,
Yanan saman tayasıyam,
İç mənim içimdi, Lələ.

Düşmənə canı verilən,
Cəllada qanı verilən,
Bu gün ehsanı verilən,
Üç mənim üçümdü, Lələ.

Nə qaldı ki, xarabada,
Bir yanğı var hər obada,
Tabut gedir arabada,
Köç mənim köçümdü, Lələ.

Huş-guşla, peşmançılıq hissiylə məni dinləyən aşıq, yazıq bir görkəm alıb dedi: “Ay oğul, bu el-oba necə oldu, hara tərpəndi? Qardımı əriyə, küləkdimi əsə keçə, buluddumu Vətəni olmaya? Bu ağır ellər, ləngərli məclislər, əkənlər-biçənlər necə oldu?”

Taa necə olasıdı? Necə olmalıydısa, elə də oldu.

Bu elə el demə, qardaş,
Talan oldu bəhrələri.

Solmuş payız yarpağıdı,
Üzə gülməz çöhrələri.

Bal zəhərdi, yemə, qardaş,
Baş endirmə qəmə, qardaş.
Kola meşə demə, qardaş,
Doğrayıblar pöhrələri.

Əvvəli yox, axırı yox,
Söz deməyə yuxarı yox,
Sürüsü yox, naxırı yox,
Çalxalanmaz nəhrələri.

Sükut basar obaları,
Tüstülənməz sobaları,
Bulul qurmaz yabaları,
Tikan qırmaz dəhrələri.

Kəsilər nuru, ziyası,
Gözündən batar mayası,
Yığılmaz otu, tayası,
Üzə gülməz yehrələri.

O dağda meylimiz qalıb,
Yarımçıq toylumuz qalıb,
Yaylaqda Leylimiz qalıb,
Biz gəzirik səhraları...

* * *

Bu dərdlərimiz burda qalsın, sizə kimdən deyim, istanbullu Qul Mehdidən. Aşıq Hüseyn Saraçlının çox məşhurlaşan vaxtlarıydı. Səsi-sədası ellərə-obalara, ölkələrə yayılmışdı. Ancaq şura hökumətinin kəshakəs vaxtlarıydı. Sərhəddən o yana bir quş da səkə bilməzdi.

Sərhədlər, sınırlar, hasarlar, tikanlı məftillər ayaq açmağa aman vermirdi. Heç bir ölkəyə bugünkü kimi sərbəst gediş-gəliş yoxuydu. Ancaq qadağaların möhkəm olmasına baxmayaraq Aşıq Hüseyn Saraçlının ünvanına Təbrizdən, Tehrandan, Ərdəbildən, İstanbuldan, Qarsdan, Ərzurumdan, Qazaxıstandan məktublar gəlirdi. Günlərin bir günü belə bir məktub İstanbuldan – Qul Mehdidən gəldi. Aydın oldu ki, onun şairliyi də var. Özü də Şair Nəbinin eloğlusudu, Faxralı kəndindəndi. Hasannılardandı. İkinci Cahan savaşında almanlara əsir düşüb, öz xilas yolunu Türkiyədə tapıb. Aşıq Hüseyn şəyirdlərinə dedi: "Ay oğul, oxuyun görək Qul Mehdi İstanbuldan nə yazıb, biz də cavabını yazıb göndərək?! Sizə baxmayın, siz vətəndəsiniz, o qürbətdədi. İndi dörd gözlə məktubun cavabını gözləyir. Neyləyək, taleyin atişləməz yolları var. Özümüz gedib-gələ bilmirik, heç olmasa sözümüz kəsilməsin". Uşaqlar məktubu oxudular ki, doğrudan da, hər sözdən, hər kəlmədən həsrət – nisgil tökülür.

Qul Mehdi yazırdı:

Ay Saraçlı, Borçalıya salam var,
Salam olsun hallarına yurdumun.
Mən qəribə gəl deyəydi yamaclar,
Səriləydim yallarına yurdumun.

Faxralıda damağı çağ olaydım,
Özü sağlam, söhbəti sağ olaydım,
Ağacında yaşıl yarpaq olaydım,
Döşənəydim yollarına yurdumun.

Qanad taxıb əsən yeldən, küləkdən,
Bir ömür də borc alaydım fələkdən,
"Urfanı"nı sən çalanda ürəkdən,
Qarışaydım xallarına yurdumun.

Öz içimdən yana-yana kül oldum,
Alovlara, atəşlərə dil oldum,
Qul Mehdiyəm, qürbət eldə qul oldum,
Qul olaydım qullarına yurdumun.

Həsrət dolu bu məktub Aşıq Hüseyn Saraçlının çox xoşuna gəldi. Dedi: “Kağız-qələm gətirin, mən deyəjəm, siz köçürün, elə günü sabah göndərin, gözü yolda qalmasın”. İndi görək Aşıq Hüseyn Saraçlı İstanbuldan gələn məktuba nə cavab verir, uşaqlar nə yazır:

Mehdi kişi, namən gəldi, yetişdi,
O nəğmənin sorağına qayıt gəl.
Qəribliyin min bir dərdi-səri var,
Öz müqəddəs torpağına qayıt gəl.

Faxralıdı yurdun, evin-eşiyin,
Burda qalıb sözün, laylan, beşiyin,
Qürbət eldə kimdi çəkən keşiyin?
Öz kökünə, budağına qayıt gəl.

Yad ellərin çox alışma oduna,
Borçalının eşqi çatsın dadına,
Qocaların yaddaşına, yadına,
Körpələrin dodağına qayıt gəl.

Gəlişinə qızılgüllər dərili,
Gül-çiçəklər qədəminə sərili,
Saraçlıyam, mən oxuyum “Şərili”,
Sən havanın bulağına qayıt gəl.

Məktubu vaxtında göndərsələr də, sahibinə çatmamışdı. Sən demə, Qul Mehdi aşıq dostuna göndərdiyi məktubu çarpayıda, ölümnən əlləşdiyi vaxt yazıbmış. Ona görə də Aşıq Hüseynin cavab məktubu mər-

humun əzizləri tərəfindən Qul Mehdinin məzarı başında oxunmuşdu...

Hüseyn Saraçlını Lök Candarına toya çağırmışdılar. Tək gedirdi. Çataxdan yuxarı bir xeyli yol getmişdi, gördü qulağına ağlama səsi gəlir. Diqqətlə fikir verdi ki, bu, uşaq ağlamağına oxşamır. Yaşlı bir adam hönkürür. Səs qarşı tərəfdən gəlirdi. Atı qamçıladı ki, görsün bu nə məsələdi. Gördü yolun qırağında, mamırlı bir qayanın üstündə ortayaşlı bir kişi oturub. Amma elə ağlayır, elə bil ətindən ət kəsillər. Aşıq Hüseyn Saraçlı çox çətinliklə onu sakitləşdirdi. Niyə ağladığını soruşdu. Məlum oldu ki, bu kişi otuz yaşlı bir oğlanı öldürüb. Daha aşıq heç bir səbəb soruşmadı. Kişi ağlaya-ağlaya Tanrıya yalvarırdı ki, keç mənim günahımdan.

Birdən hər ikisinin də eşidəcəyi qədər bir səs gəldi onların qulağına. Səs Tanrının səsiydi. Öz cinayətkar bəndəsiylə haqq-hesab çəkməyə, sorğu-sual eləməyə gəlmişdi:

Tanrının səsi:

Dizini atıb yerə, əl açmısan göylərə,
Başına gələn qəza, qəmli hekayətmi var?
Karvanınmı talanıb, köçünmü yolda qalıb,
Mənim yaratdığımdan mənə şikayətmi var?

erin yoxdusa, göydə sənin göyün yox,
Dərdinə dəm tutmağa kamanın yox, neyin yox,
O qədər ağlamısan, dillənməyə heyin yox,
Əldən çıxan Vətənin, düşdüyün qürbətmi var?

Göydən min bəla gəlsə, biri səndən ötüşmür,
Hər kimi çağırırsan, harayına yetişmir,
Dərman da var, həkim də, yaraların bitişmir,
Yerin cəhənnəmdimi, gəzdiyin cənnətmi var?

Üzünü göyə tutub ah çəkirsən dərindən,
Səni ağladan nədi, danış dərdi-sərindən,
Qayamı dağdan qopub, dağmı uçub yerindən,
İsrafil surmu çaldı, qopan qiyamətmi var?

Yaxandan əl çəkərmi amanların, ahların,
Cəzasını çəkirsən tutduğun günahların,
Yapışma ətəyindən açılan sabahların,
Səni xilas etməyə Quranda ayətmi var?

Bəndənin səsi:

Ağlım sözə baxmadı, əlimdən xata çıxdı,
Dilimdən çıxan kəlam bəd oldu, ulu Tanrım!
Gözlərimi bağladı günahsız tökdüyüm qan,
Canıma, cəmdəyimə od oldu, ulu Tanrım!

Orman qaçır, düz qaçır, sünbül qaçır, dən qaçır,
Dağ məndən uzaqlaşır, duman qaçır, çən qaçır,
Hayana gedirəmsə, hamı məndən gen qaçır,
Doğmalarım da məndən yad oldu, ulu Tanrım!

Dünən mənim olanlar çevrildi, yana döndü,
Nahaqdan tökdüyüm qan axdı, ümmana döndü.
Harda kim eşitdisə, ürəyi qana döndü,
Ancaq iblis ürəyi şad oldu, ulu Tanrım!

Addımbaşı qarşıda yarğan, uçurum, dərə,
Mələklər itkin düşüb, şeytanlar çəkir şərə,
Nə könlümdə, gözümdə ürəkaçan mənzərə,
Nə ağzımda bir tikə dad oldu, ulu Tanrım!

Mən adam öldürmüşəm, qatil, cəllad olmuşam,
İnsana, insanlığa, insafa yad olmuşam,
İndi özümdən ötrü ağrı, fəryad olmuşam,
Ömrüm getdi fənaya, bad oldu, ulu Tanrım!

Tanrının səsi:

Yaratdım ki Adəmi, ona verim cənnəti,
O da buğdanı yedi, açdı, tökdü sirləri.
Mən tərtəmiz yaratdım yeri, göyü, varlığı,
Murdarlayan sən oldun ocaqları, pirləri.

Gündə bir günah tutub, saymazyana keçirsən,
Sənə saf su vermişəm, sən çirkablar içirsən.
Sən özgənin gözündə tükü tükdən seçirsən,
Görmürsən öz gözündə kərənləri, tirləri.

Hər neməti dad dedim, dilinə tamı verdim,
Ruhunu nurlatmağa çırağı, şamı verdim,
Sənə Quran ayəsi, Allah kəlamı verdim,
Sənsə əzbər eylədin ən iyrənc təhqirləri.

Dinin, imanın gedib, dini yu, imanı yu,
Saldığın ləkəni yu, axıtdığın qanı yu,
Ürəyi yu, qəlbi yu, beyni yu, vicdanı yu,
Suyla yumağa nə var bədəndəki kirləri.

Qan tökən özün oldun, mən tökmədim qanını,
Vədəsiz köçənlərin özün aldın canını,
Çöllər üçün yaratdım çöllərin heyvanını,
Sən evlərə gətirdin tülküləri, şirləri.

Yamyaşıl dərələrdən göz yaşıtək axmadın,
Haqq yolunda özünü yandırmadın, yaxmadın,
Şeytan sözünə baxdın, mən deyənə baxmadın,
Dur keçir boğazına yağlanan kəndirləri!!!
Dur bağla qollarına pas atmış zəncirləri!!!
Təhqir etdiklərindən qəbul et təhqirləri!!!

Səs göylərə çəkildi. Yeri-göyü, dağı-dərəni lal bir sükut başına götürdü. O, oturduğu qayanın üstündəcə

daşa dönmüşdü. Adama elə gəlirdi ki, əfsanələrdə olduğu kimi, doğrudan da, daşa dönüb. Daşdan səs çıxdı, ondan yox. Bu arada sükutu pozan ancaq aşığın ata çəkdiyi qamçı səsləri oldu. At yel kimi yerindən oynadı. O da bu sükutdan baş götürüb qaçmaq istədi. Aşıq bir xeyli at sürmüşdü, yorğa yerişlə getdiyi yerdə at qəfildən dayandı. Aşıq nə qədər üzəngini atın qarnına döydüsə, qamçıya güc verdisə, at daş kimi yerindən tərpənmədi. Aşığı şübhə götürdü. Bu nə olan şeydi? Sən demə, buludlardan enib gələn səsi at insandan qabaq duyubmuş. Elə bu an həmin səs yumşaq, sevgi üstündə bəslənən nəğmə kimi dilləndi. Səs Tanrının səsiyidi.

Səs: – Ey mənim əziz bəndəm. Mənə yaxşı qulaq as. Qılınc kəsir, nizə batır, güllə deşir, top dağıdır, zəhər öldürür. Bu silahların hamısının səsi var. Bircə zəhərin səsi yoxdu, onun da səsi sonra çıxır, özü də daha bərkdən çıxır. Mən şərait yaradıb onu sənin ürcahına çıxartdım ki, ona dediyim sözlərin sən də şahidi olasan. Baxmayaraq ki, tutduğu günaha görə o, mənə yalvardı, ancaq iki daşın arasında üzrü günahından betər oldu. O,  sənə də, mənə də yalan danışdı. Birinci, o, indiyə qədər bir yox, üç adam öldürüb. İkinci də, öldürdüyü oğlanın otuz yox, iyirmi beş yaşı vardı. Sabah toyu olmalıydı. Mən o qatilin canını elə oradaca ala bilərdim, ancaq almadım. Mən onu zülümnən, it kimi hürdürə-hürdürə, donuz kimi donquldada-donquldada, çiban kimi zoqquldada-zoqquldada öldürəcəyəm. Qoy görsün xalqın toyunu vaya döndərmək nə deməkdir. Eşitdinmi, mən sənə "ey mənim əziz bəndəm" deyə müraciət elədim. Çiçəklərin rəngini də, sellərin ahəngini də, qızların qəşəngini də, könülaçan havaları – "Misri"ni də, "Cəngi"ni də mən sənə vermişəm, sənin ürəyinə görə vermişəm ki, sən də onu xalqa səxavətlə çatdırasan. Get, sənə uğur olsun. Gördüklərini, eşitdiklərini hamıya çatdır. De ki, hər kəs etdiyini bulacaq.

Səs yenə kəsildi. Aşıq Hüseynin uçmağa qanadı yox idi. Tanrının səsi onunla sevgi-məhəbbət dilində danışmışdı.

Nəysə... Gün günortadan əyiləndə özünü yetirdi toy evinə. Gördü böyük bir çadır qurulub. Camaat qarışqa kimi qaynaşır. Düşündü ki, yəqin bu xalq aşığı çox istədiyinə görə belə yığılıb. Həyətə daxil olanda gördü bu, toy çadırı yox, yas çadırıdı. Tanrının dediyi yadına düşdü. Deməli, o qatilin öldürdüyü bu oğlan imiş. Aşığın başında tükləri biz-biz oldu, papağı az qaldı başından düşsün. Atdan endi, yas yiyəsinə başsağlığı verdi, Allahdan təsəlli dilədi. Adına-sanına layiq şəkildə bu yasda iştirak edib, el-obanın ağsaqqallarının dərdinə şərik oldu...

* * *

Əsli Borçalıdan olan, iyirmi-otuzuncu illərdə şura hökumətinin əlindən xilas olmaq üçün əsil-nəcabəti, ata-babası Türkiyəyə adlayan, orda sənətkar kimi şöhrət tapan, adı Qarsda, Ərdahanda, Kağızmanda, Çıldırda bəlli olan Aşıq İslam Ərdənər uzun ayrılıqdan, yetmiş ilin həsrətindən, çətinliyindən sonra ana yurdu Borçalıya – Kürüstü Keşəliyə qonaq gəlmişdi. O, Şenliyin oğlu Aşıq Qasımın şəyirdiydi. Dinə, imana gəlmişdi. Ürəyindən çox şeyləri görmək, tanımaq keçsə də, böyük arzusu Aşıq Hüseyn Saraçlını görmək idi. Çünki Aşıq Hüseynin oxuduğu havalar, danışdığı dastanlar Qars-Ərzurum ətrafında çox yayılmışdı. İyirminci illərdə Borçalıdan gedənlərin, onların övladlarının çoxu bu səsdən, danışıqdan, ləhcədən Borçalının ətrini alırdılar. Ona görə də çoxları onun üzünü görmək, səsini eşitmək həsrəti ilə yaşayırdılar. Aşıq İslam öz arzusunu düşdüyü evdə Usuvoğlu Omara bildirəndə çox şad oldular. Aşıq Hüseyn Saraçlıya adam göndərdilər. “Qarsdan qonağımız var, sizə əziyyət olsa da, bizə şərəf olar. Yolunuzu gözləyirik”. Atalar deyir: “Çağırılan yerə ar eləmə, çağı-

rılmayan yeri dar eləmə”. Aşıq böyük hörmətlə bu dəvəti qəbul elədi. Bir də ona görə ki, Türkiyəni görmək üçün Aşıq Hüseyn Saraçlının burnunun ucu göynəyirdi. Çünki “Koroğlu” ilə “Əsli və Kərəm” dastanlarını dinləyicilərə yetirəndə, arada bir türk ləhcəsində danışanda elə bilirdin balın üstünə qaymaq tökür.

Hər iki sənətkar çox böyük sevgiylə, ehtiramla görüşürdü.

Bu ziyarət görüşdən çox, uzun illər ayrılığına dözmüş iki qardaşın vüsala çatan, muraza yetən gününə bənzəyirdi.

Əziziyəm o güneylər,
O quzeylər, o güneylər.
Həsrət həsrətə yetsə,
Bayramın o gün eylər.

Aşıq Hüseyn Saraçlı özü xahiş elədi ki, Aşıq İslam, dur ayağa, zəhmət olmasa, o yerlərdən-yurdlardan, ellərdən-obalaradan bizə bir xəbər ver.

Aşıq İslam dedi: “Ustad, mən sizin yanınızda nəkarəyəm ki, saz götürəm, söz deyəm. Mən sənin həsrətinlə Borçalıya gəlmişəm. Saz da, söz də, meydan da sizindi”.

Aşıq Hüseyn Saraçlı hörmətli qonağa bir də üz vurdu ki, darıxma, mən də meydana çıxajam. Amma qoy sənin nəfəsində o yerlərin ətri bu otaqlara dolsun. Bu söz Aşıq İslamı kövrəltdi. Aldı görək, fikirlərini Aşıq Hüseyn Saraçlıya və məclisə necə çatdırdı:

Düz yetmiş il bu günləri gözlədik,
Pozammadıq bu dağılmış qurğunu.
Borçalıya gedib-gəlmək olarmı? –
Çox soruşduq bu sualı, sorğunu.

Haqqı olan öz haqqına əmindi,
Sevgim bu gün asimanda zəmindi,

Nə əllidi, nə beş yüzdü, nə mindi,
Olan çoxdu bu yerlərin vurğunu.

Nə azaram, nə qibləmi çaşaram,
Sellər kimi qaynayaram, daşaram,
Min aşırım, min bir bələn aşaram,
Heç olmaram bu yolların yorğunu.

Həsrət varsa, bal zəhərdi, yağ acı,
Çəkdiyimiz dərd acıdı, dağ acı,
Saz elədim hər gördüyüm ağacı,
Ney elədim hər qamışı, qarğını.

Heç kimsənə qəm sazını çalmasın,
Heç bəndənin gözü yolda qalmasın,
Ulu Tanrı bir də heç vaxt salmasın
Köçhaköçü, qaçhaqaçı, qırğını.

Aşıq İslam, uzaq düşdü aralar,
Dərdimizə tapılmadı çaralar,
Yetmiş ildi sağalmırdı yaralar,
Bu gün açdım üstündəki sarğını.

Aşıq Hüseyn Saraçlı Aşıq İslam Ərdənərin şeirinə, səsinə, sözünə-söhbətinə, yaddaşına ürəkdən "Əhsən! Afərin!" dedi. Söhbətdən aydın oldu ki, Aşıq İslam Çıldırlı Aşıq Şenliyin külliyyatını əzbər bilir, bu işə çox sevindi. Məclisi və hörmətli qonağı çox intizarda saxlamamaq üçün Aşıq Hüseyn Saraçlı yerindən durdu. Saza bir nizam kök verdi, görək qəlbindən keçənləri Aşıq İslama və məclisə necə çatdırdı:

Ər işidi uzaq yollar boylamaq,
Aşıq İslam, ər işinə min şükür.
Könül sevir, qəlb açılır, üz gülür,
Xeyrə dönən hər işinə min şükür.

Ayrılığın sərt qayası çapılar,
Qıfıllara açar salan tapılar,
Üzümüzə qoy açılsın qapılar,
Ərənlərin yerişinə min şükür.

Gah boşaldı, gah da doldu sinələr,
Yavaş-yavaş gəldi keçdi sənələr,
Bizimkidi uca dağlar, binələr,
Yaylağına, örüşünə min şükür.

Həqiqətdən, mərifətdən oxudun,
Qars, Ərzurum, Çıldır, Ağrı qoxudun,
Söhbətini xalı kimi toxudun,
Arğacına, ərişinə min şükür.

Şükür Haqqa, avand oldu tərsimiz,
Boş getmədi zəhmətimiz, dərsimiz,
Qucaqlaşdı Borçalımız, Qarsımız,
Div səbrinə, nər işinə min şükür.

Ağrıdağda yoxa çıxsın ağrımız,
Saraçlıyam, köz olmasın bağrımız,
Meydan açdı dürüstümüz, doğrumuz,
Həqiqətin görüşünə min şükür.

İki sənətkarın görüşü, söhbətləri, şeirləri gələcək unudulmaz xatirələrin mayasına döndü. Ərzurumun gədiyində Lələnin qar-borana düşməsindən, Ərdahan dağlarında Kərəmin "Yalvarıram, durnam, tökün telləri" deyib, durna qatarını geriyə qaytarıb durnalardan lələk saldırmasından, "Aşıq Qərib" dastanında Qarsın düzündə Qəribin namaz qılmasından, Aşıq Şenliyin "Can sağ ikən yurd vermərik düşmənə" qoçaqlamasından, Dadaloğlunun "Fərman padşahındı, dağlar bizimdi" adlı şahanə qoşmasından... daha nələrdən, nələrdən söhbət

açmadılar. Allahın xoş dəqiqələri bir-birini əvəz edirdi. Bu söhbətlər genişləndikcə Aşıq Hüseyn Saraçlının ürəyindən nələr gəlib-keçirdi. Fikirləşirdi ki, buz əriyə, yollar açıla, sınırlar qalxa, tikanlı çəpərlər sökülə, qalan ömrümü dilimin duasına çevirdiyim o yerləri gəzməklə, məclislər aparmaqla keçirəm.

* * *

Aşıq Hüseyn Saraçlı Allahın xoşbəxt taleli bəndələrindən idi. Çox arzulara, diləklərə yetişmişdi. Ancaq onun ömrü boyu fikrində, xəyalında gəzdirdiyi bir arzu var idi ki, ona ha əlləşirdi çata bilmirdi. O, illər uzunu Təbrizi görmək arzusu ilə yandı-yaxıldı, amma bu məqsədinə yetişəmmədi. Bu tale görüşünə nə zamanın hökmü imkan verdi, nə də ömrün vəfasızlığı.

Müxtəlif məclislərdə, tədbirlərdə Təbrizin cəngavər aşığı Aşıq Hüseyn Cavanla bu haqda söhbətlər edərdilər. Ortaya min bir əngəl çıxır, hər iki aşığın murazı gözündə qalır, heç biri Təbrizə qovuşa bilmirdi.

Ağrı dağına çıxmaq olardı, Qaf dağına qalxmaq olardı, Çin səddini aşmaq olardı, dünyanın bütün şəhərlərinə getmək olardı, ancaq Təbrizə getmək olmazdı. Həm o tayda, həm bu tayda bizim taleyimizi bizdən xəbərsiz yadlar, özgələr, ögeylər qara yazmışdılar. Dünyanın bütün çaylarını üzüb keçmək olardı. Arazı keçmək olmazdı. Dünyanın harasına istəyirsən baxmaq, tamaşa etmək, seyr eləmək olardı. Vətəndən Vətənə, bu taydan o taya baxmaq olmazdı.

"Quzey də Vətəndi, Güney də Vətən, bu saz da Vətəndi, bu ney də Vətən" deyib görüşmək, bu görüşü bayram etmək olmazdı. O yandan bu yana, bu yandan o yana buludlar, tüstülər, dumanlar keçdi, nəğmələr, küləklər keçdi, düşmənlər, yağılar keçdi, dostlar, qardaşlar, eloğlular keçə bilmədi. Elə bil dünyanın bütün qada-

ğaları, qorxuları, qorxulu yuxuları, qorxulu nağılları ancaq bizdən ötrü yaranıbmış.

50-ci illərin axırlarıydı. Hər iki aşığın cavan və gümrah vaxtlarıydı.

Gözəl bir məclisdə hər ikisi şövqlə çalıb-oxuyurdu. Aşıq Hüseyn Saraçlı dedi: “Cavan Hüseyn, ölməyəydik, hər ikimiz o günü görəydik ki, bax beləcə Təbrizdə üzüzə iki qardaş bülbül kimi cəh-cəh vuraydıq”.

Bu arzu dilə gələn vaxtlardan 30 ildən çox keçmişdi. Günlərin birində tam təsadüf nəticəsində hər iki ustad aşıq Gəncə şəhərində görüşdü. Doğma qardaş kimi, Bakıyla Təbriz kimi qucaqlaşdılar. Ayaqüstü hal-əhvaldan sonra Cavan Hüseyn dedi: “Aşıq Hüseyn, yaxşı oldu görüşdük. Mən bu gün səni Təbrizə aparacağam”. Aşıq Hüseyn Saraçlı bu gözlənilməz söhbətdən çaşan kimi oldu. Amma heç nə demədi. Sual dolu baxışlarla mənalı-mənalı aşıq dostunun üzünə baxdı. Saraçlının baxışları deyirdi ki, zarafat olar, bu boyda yox. Ancaq dillənib heç bir şey demədi. Sözün sonunu gözlədi. Aşıq Hüseyn Cavan Saraçlı Hüseyni Gəncənin Bağmanlar tərəfində yerləşən ikimərtəbəli, bağlı-bağatlı, hovuzlu-bulaqlı bir evə apardı. Evə-eşiyə hay düşdü, ev sahibi, ailə üzvləri qonaqları çox hörmətlə qarşıladılar. Az keçməmiş səsə-səmirə qonşular yığıldı, ağsaqqallar gəldi. Aşıq Hüseyn Cavan üz tutdu Saraçlı Hüseynə ki: “Aşıq qardaş, icazə ver səni çox intizarda saxlamayım. Təbriz söhbətini açım. Bax, bizi qarşılayan, gördüyün bu ev yiyəsi İslam kişi mənim əziz dostumdu, sazın-sözün xəstəsidi. O qədər onun yanında Təbriz deyib ağlamışam, o qədər Təbrizdəki evimizdən, həyət-bacamızdan danışmışam ki, İslam kişi məni ovutmaq, yarama məlhəm qoymaq üçün tikdirdiyi bu evi eyniylə bizim Təbrizdə olan evimizə, bağımıza-bağçamıza bənzədib. Ona görə hər dəfə dostlarımla bura gələndə özümü aldadıram ki, Təbrizə gedirəm. Bura mənim balaca Təbrizimdi.

İndi bu gedişatı ki belə görürəm, deyəsən, Təbriz sarıdan Allah bizim murazımızı gözümüzdə qoyacaq. Onu nə sən görəcəksən, nə də mən. Ona görə də sazı köynəyindən çıxaraq. Ölüm-itim dünyasıdı. Dünyanın işini nə bilmək olar. Bir də ya qismət, görüşək, ya görüşməyək”. Hər ikisi kövrəldi. Sazlar köynəkdən çıxdı. Sazın Borçalı köküylə Təbriz kökü qoşalaşdı. Qaynadılar-daşdılar, qabardılar-çəkildilər, zillər-bəmlər, keçidlər-aşırımlar, endərmələr-döndərmələr ustad barmaqlarından bal kimi ruhlara, damarlara süzülürdü. Yenə axırda Təbriz söhbətinin üstə gəldilər. Aldı görək başı bəlalar çəkmiş, gözü odlar görmüş iki qocaman aşıq nə dedi, hardan dedi:

Aşıq Hüseyn Saraçlı:

Aşıq, arzularım gözümdə qaldı,
Sən məni Təbrizə aparammadın.
Təbriz söhbətimdə, sözümdə qaldı,
Sən məni Təbrizə aparammadın.

Aşıq Hüseyn Cavan:

Saraçlı, zamanın günahkarıyam,
Mən səni Təbrizə aparammadım.
Həsrət qollarımı salıb yanıma,
Mən səni Təbrizə aparammadım.

Aşıq Hüseyn Saraçlı:

Vursa da düşmənə hey pəncə Təbriz,
Çox gördü düşməndən işgəncə Təbriz,
Nə Təbriz Gəncədi, nə Gəncə Təbriz,
Sən məni Təbrizə aparammadın.

Aşıq Hüseyn Cavan:

Zalımlıq ovçuda, fağırlıq ovda,
Ayağım qandalda, əlim buxovda,
İçim də, çölüm də yandı alovda,
Mən səni Təbrizə aparammadım.

Aşıq Hüseyn Saraçlı:

Düşmən pıçıldadı, him-cimə düşdü,
Kim harda qırıldı, kim-kimə düşdü?
İşlər düyünləndi, tilsimə düşdü,
Sən məni Təbrizə aparammadın.

Aşıq Hüseyn Cavan:

Könül, Vətən sarı havalan dedim,
Qoy görsün üzünü Savalan dedim,
Ovuna çatmasın ov alan dedim,
Mən səni Təbrizə aparammadım.

Aşıq Hüseyn Saraçlı:

Tarixlər hamısı saxta yazıldı,
Uydurma zamana, vaxta yazıldı,
Ayrılıq yığvala, baxta yazıldı,
Sən məni Təbrizə aparammadın.

Aşıq Hüseyn Cavan:

Gözümdən, könlümdən qanlar ələdim,
Ömrümü, günümü oda bələdim,
Yetim quzu kimi yandım, mələdim,
Mən səni Təbrizə aparammadım.

Aşıq Hüseyn Saraçlı:

Göz yaşım olsa da sel kimi rəvan,
Səndə nə günah var, ay Aşıq Cavan?
Ədalətsiz oldu ədalət-divan,
Sən məni Təbrizə aparammadın.

Aşıq Hüseyn Cavan:

Adım Cavan oldu, yığvalım qoca,
Çatmadım Təbriztək Məkkəyə, Haca,
Döndü aqibətim Mənsur Həllaca,
Mən səni Təbrizə aparammadım.

Aşıq Hüseyn Saraçlı:

Saraçlı, hey yağdı həsrətin qarı,
Biz gedə bilmədik Təbrizə sarı,
Oğlumuz, qızımız gedəydi barı,
Sən məni Təbrizə aparammadın.

Söz sözü, dərd dərdi, hava havanı gətirirdi. Heç biri bilmirdi ki, bu onların həyatında axırıncı görüşü, birlikdə apardığı son məclis idi. Sazları "Şahsənəm" havasına köklədilər. Bədahətən elə oradaca gələn "Təbrizdə" rədifli gəraylı üstündə qoşa bülbüllərin qoşa zəngulələri Gəncədən göylərə qalxdı, Göygölə, Kəpəzə sarı uçdu ki, bəlkə bu səsdən Səhəndə, Savalana da yetişə...

Aşıq Hüseyn Cavan:

Ayrılıqdan qisasımı
Alam Təbrizdə, Təbrizdə.
Sevinc-şadlıq namazımı
Qılam Təbrizdə, Təbrizdə.

Aşıq Hüseyn Saraçlı:

Ulu Tanrım qanad verə,
Olam Təbrizdə, Təbrizdə,
Bulud kimi boşalmışam,
Dolam Təbrizdə, Təbrizdə.

Aşıq Hüseyn Cavan:

Talan oldu ömrüm-günüm,
Çaşbaş düşdü qibləm, yönüm,
Ağrım-acım, səsim-ünüm,
Nalam Təbrizdə, Təbrizdə.

Aşıq Hüseyn Saraçlı:

Uzaq yollara yovuşam,
Bu dərddən, qəmnən sovuşam,
Şirin bir eşqə qovuşam,
Qalam Təbrizdə, Təbrizdə.

Aşıq Hüseyn Cavan:

Hər şey yasaq türk adında,
Mal adında, mülk adında,
Yetim qalıb Ərk adında
Qalam Təbrizdə, Təbrizdə.

Aşıq Hüseyn Saraçlı:

Yolu verən Araz ola,
Hər işimiz taraz ola,
Görüş günü bir saz ola,
Çalam Təbrizdə, Təbrizdə.

Aşıq Hüseyn Cavan:

Nələr getdi, nələr qaldı,
Yaralı nəğmələr qaldı,
Quzu kimi mələr qaldı,
Balam Təbrizdə, Təbrizdə.

Deyişmə başa çatdı, çay süfrəsinə əyləşdilər. Aşıq Hüseyn Cavanı yenə həsrət dolu bir xəyal qanadlarına aldı. Xəyalında yenə Təbrizə sarı uçurdu.

Yenə fikirliydi, düşüncəliydi,
Bizə qəm şərbəti içirən aşıq.
Özü getməsə də, arzularını
Bu taydan-o taya keçirən aşıq.

Axtarıb dayazı, gəzib dərini,
Dağtək daşıyırdı dərdi-sərini,
Yuxuda görürdü öz şəhərini,
Fürsəti əlindən qaçıran aşıq.

Kövrək danışırdı, fağır dururdu,
Onu dərd kiridir, qəm susdururdu,
Xəyaldan özünə yuva qururdu,
Təbrizi Gəncəyə köçürən aşıq.

Aşıq Hüseyn Saraçlı Borçalıda, Bolus çökəyində Saraçlı kəndinə ən yaxın kəndlərdən olan Qoçuludan toy məclisindən təzəcə qayıtmışdı. Kefikök, damağı çağ idi. Sədri taxtda, xalı-xalçanın üstə, mütəkkəyə, balınca dirsəklənib pürrəngi çay içirdi.

Bu o vaxtlar idi ki, Qoçulu Məhəmmədin yazdığı, Aşıq Hüseyn Saraçlının "Dübeyti" havasına oxuduğu "Minaya" mahnısı düzü-dünyanı başına götürüb, dillərdə dastan olmuşdu.

Elləri var Qoçlu kəndi,
Sənə deyim beşcə bəndi.
İtməz Məhəmmədin zəndi,
Gözəl sənsən, ay Minaya!

Bu söz o qədər məşhurlaşmışdı ki, bu yerlərdə kimin əlinə harda aşıq keçirdi, o saat "Ay aşıq, bir "Minaya"nı oxu, qulaq asaq" deyirdi. Aşıqların çoxu o sözü oxumaq istəmirdi. Ona görə yox ki, sözü bilmirdi. Ona görə ki, Aşıq Hüseyn Saraçlı bu havanı o qədər həlim, gözəl və şirin oxumuşdu ki, başqası oxuyanda çox zəif bir yamsılama çıxırdı.

* * *

Aşığın ömür-gün yoldaşı Şahsənəm xanım çay süzə-süzə dedi:

– Ay kişi, sən gəlməmişdən iki-üç saat qabaq qapımıza bəy nişanlı, bəyzadə yerişli üç oğlan gəlmişdi. Durumundan-qırımından xana-bəyə layiq adamlardı. Sənə çatası bir məktub verdilər. Üstəlik, dilcavabı da dedilər ki, ay ana, hörmətli aşığımıza deynən biz Dərələyəz mahalından gəlmişik. O yerlərin ağsaqqalı İbrahim kişinin adamlarıyıq. O, sizi dördgözlə öz elində-obasında, ocağının başında gözləyir. Tiflisdə üç günlük işimiz var, qayıdıb gələndə sizə dönəcəyik. Əgər əlində elə vacib işi yoxdusa, bizim sözümüzü, ağsaqqalın dəvətini yerə salmasın.

Onsuz da damağı çağ olan aşığın kefi bir az da köklədi. Dedi:

– Arvad, payızın kövrək çağlarıdı. Onsuz da nə toylar qurtarasıdı, nə də mən dincələsiyəm. Bu İbrahim kişinin haqqında mən çox eşitmişəm. Deyirlər onun evi şairlərin, alimlərin, aşıqların görüş yeri, ziyarət məkanıdı. Hatəm səxavətli bir kişidi. Özü də o yerlərdə heç olmamışam. O kişinin mənə əvvəllər də ismarıcı olub.

Bu dəfə də getməsəm, deyəllər ki, aşıq saymazyanalıq elədi:

"Say səni sayanı, yer ilə yeksan olsa da,
Sayma səni saymayanı, cahanda sultan olsa da".

Bəli, üç günün tamamında İbrahim kişinin adamları gəlib çıxdı. Aşıq onları çox böyük hörmətlə qarşıladı. Yaxşı bir süfrə açdı. Şahsənəm xanım dürlü-dürlü hər nemətdən süfrəyə düzmüşdü. Cavanlardan biri dedi:

– Ay ustad, deyillər payız ağzını qışa sarı çevirəndə sizin ən çox sevdiyiniz yemək təkənin qovurması olur, ondan varındımı, bir az biz də dadaq.

Dağdan gələn cavanlar qovurmamı görməmişdilər? Onlar üçün maraqlı idi ki, görək belə şan-şöhrət sahibi olan el sənətkarının evdə günü-güzəranı, səliqə-sahmanı necədir. Aşıq dedi:

– Oğul, əlli ildi mənim evimdə təkə qovurması olur. Qoç da sizə qurban olsun, təkə də, onun qovurması da. – Elə bil qonaqların ürəyini oxumuşdu. – Oğul, aşığın qapısı elin qapısıdı. O həmişə elin üzünə açıq olmalıdır. Ev də həmişə, hər şeyə hazır olmalıdır. Kişinin iti də qapısında dəmbər gərək. Sənətkarın qapısına daxil olanda həyət-bacasında, ev-eşiyində səliqə-sahman, təmizlik görmədinsə, heç o evə girməsən yaxşıdı.

Hər şey yerini aldı, çörəklərini yeyib, süfrəyə xeyir-dua verib qalxdılar. İkindi vaxtı gün dağların dalına sarı əyilib, azca saraltısı qalanda özlərini Dərələyəzə yetirdilər. İbrahim kişi başqa yerlərdə, başqa məclislərdə Aşıq Hüseyn Saraçlını görmüşdü, ancaq tanışlıq verməmişdi. Səs-küyə eşiyə çıxdı, yola sarı boylananda o saat aşığı tanıdı. İbrahim kişi Dərələyəz mahalının sayılan, seçilən hörmətli ağsaqqallarından biriydi. Aşığı həm öz adına, həm də aşığın adına layiq şəkildə qarşıladı. Qonağın ayaqlarının altında burmabuynuz, kirkirəquyruq, beli xınalı bir qoçu qurban kəsdilər.

Say-seçmə kişilərə, saz-söz qədri bilənlərə İbrahim kişinin dəvətçiləri dedi ki, cümə günü hamı bizə buyursun. Borçalıdan Aşıq Hüseyn Saraçlı qonaq gəlib.

Dərələyəzin say-seçmə kişilərindən ovçu Qəhrəman, Aşıq Bəhman, Əsgər Şahgəldiyev, Baxşalı oğlu Cabbar, Aşıq Mehdi, Aşıq Mirzalı, Gəncinalıyev Gəray dəvətlilər arasında idi.

Cüməyə hələ üç gün qalırdı. Dəvət olunmayan adamlar da aşığa qulaq asmaq üçün saatları sayırdılar. Aşıq fikirləşdi ki, bu nə cür toydu? Heç bəydən, gəlindən, toydan, toyxanadan söhbət açan yoxdu. Heç nə soruşmadı. Aydın oldu ki, İbrahim kişi aşığı toya yox, əhli-ürfan kişilərin, elin-obanın görüşünə şəxsi qonağı kimi çağırıb.

Məclisin vaxtı gəldi çatdı. Hamı yerbəyer oldu. Üç gündü yağ içində böyrək kimi bəslənən, dincələn, özünə qarşı əsl ağsaqqal diqqəti görən Aşıq Hüseyn Saraçlı yavaş-yavaş sazı köynəyindən çıxartdı, nizam bir kök verdi, "Ya Allah, səndən mədəd" deyib ayağa durdu. Şair Nəbinin "Çox şükür" rədifli şeiri ilə "Baş divani" havasına məclisi açdı:

Yazılanlar gəldi başa, qələminə çox şükür,
Cümləmizə muraz verən kəráminə çox şükür!
Göydən dörd baş kitab endi, əzəl başdan "Tövrat"ı,
Biz götürdük ol "Quran"ı, kəlamına çox şükür!

Şivəni-məhşər günüdü, yarəbb, kim çəkər zillət,
İsrafil surun çaldı, gəldi nə ki var millət.
İbtida əfv olundu, gör hümməti-Məhəmməd,
Əl götürüb dua qılan, salamına çox şükür!

Gəl, biçarə Şair Nəbi, sərin sövdaya düşdü,
Çatıldı ol Qıl körpü, neçə mömin qul keçdi.
Quruldu mizan-tərəzi, yarəbb, nə hikmət işdi,
Biz də gəldik bu divana, divanına çox şükür!

Havanı o qədər kövrək, ləngərli başladı ki, camaatın dədəsi-babası, əvvəli-axırı, beşiyi-məzarı, toyu-yası gözünün qabağından gəldi-keçdi.

Elə birinci havadan aşıq məclisi, məclis də aşığı tutmuşdu. İbrahim kişi ayağa qalxıb hamıya "xoş gəldin" elədi və üzünü aşığa tutub dedi:

– Aşıq Hüseyn Saraçlı, mən sözümü bir az sonra demək istəyirdim. Ancaq sən elə birinci havadan məni tərpətdin. Bu mahalın adından sənə təşəkkür edirəm ki, dəvətimi qəbul edib gəlmisən. Sənin bizə gəlişini bütün Borçalı aşıqlarının Dərələyəzə gəlişi kimi başa düşürük. Çoxdan sənin həsrətini çəkirdik. Bu məclis sənindir. Biz hamımız sənin işığına yığılmışıq. Bizi yaşat, dilləndir, gülləndir, qəlbimizi telləndir. Dünyanın halını bilmək olmaz. Qoy fələkdən oğurlanan, səninlə keçən bu günlər yaddaşlara yazılsın, tarixlərə düşsün. Xalqın gözəl bir sözü var, aşıq qardaş. Deyir, "igidi darda, taciri varda, aşığı sazda sına". Biz səni sınağa, imtahana, sorğu-suala gətirməmişik. Yaddaşında nə var, səpələ, sandığında nə var, aç tök, barxananda nə var, bağışla. "Var əli kərəm əli, yox əli vərəm əli. Varını verən utanmaz, yoxdan verən dəlidi". Buyur, meydan sənindir.

İbrahim kişinin bu sözləri hamını kövrəltdi, məclisə elə bir sakitlik çökdü ki, qu desən qulaq tutulardı. Bu sükut müqəddəs sükut idi. Bütün düşüncəli insanlar həmişə belə sükutun həsrətində olublar. Aşıqla məclis bir ürəyə, bir cana döndü. Aşıq "baş üstə" deyib əlini gözünün üstünə apardı, başladı, nə başladı. Aşıq kimlərdən oxumadı, ilahi? Qurbanidən, Abbasdan, Kərəmdən, Qəribdən, Koroğludan, Alıdan, Ələsgərdən, Çıldırlı Aşıq Şenlikdən, Faxralı Şair Nəbidən, Cəlildən, Səməd Vurğundan, Osman Sarıvəllidən. Söz-söhbət arası atmacalar da ki məclisi nəhrə kimi çalxalayırdı.

Aşıq nə az, nə çox düz bir həftə irili-xırdalı məclislərdə sözünü-söhbətini ipə-sapa düzdü, xalı kimi

toxudu, ellərə ərməğan elədi. Bir həftənin tamamında Hüseyn Saraçlı Borçalıya qayıtmaq üçün İbrahim kişidən izin-icazə istədi. İbrahim kişi könül dostlarıyla bərabər elin-obanın adına layiq şəkildə aşığı qiymətli hədiyyə, dəyərli sor-sovqatla yola saldılar. Ayrılıq məqamında Aşıq Hüseyn Saraçlı üzünü qonağı olduğu başı qarlı dağlara, ona diqqət kəsilənlərə çevirdi. Görək Dərələyəzə, onun ağsaqqallarına, cavanlarına ürəyindən gələnləri "Dastanı" havası üstündə necə çatdırdı:

Üzünüz ağ olsun, el ağsaqqalı,
İlahi! Nur gördüm Dərələyəzdə.
Məclisi ləngərli, söhbəti şirin,
Hər sözü dürr gördüm Dərələyəzdə.

Çəkib sığalını Allahın əli,
Yerli-yataqlıdı sərvəti, ləli,
Dağları havalı, çayları dəli,
Selləri kür gördüm Dərələyəzdə.

Düzləri dolanıb, dağları aşır,
Zirvəyə baxanda xəyalım çaşır,
Bulaqlar başında qızlar qaynaşır,
Çeşməni gur gördüm Dərələyəzdə.

Göylərdən gələndi şeiri, bəstəsi,
Həm səsi gözəldi, həm şikəstəsi,
Elin divanəsi, yurdun xəstəsi,
Ocağı pir gördüm Dərələyəzdə.

Qızı ismətlidi, oğlu mətindi,
Saraçlı, bu eldən doymaq çətindi,
Möcüzə Allahın, təbiətindi,
Varlığı sirr gördüm Dərələyəzdə.

Hamı bu ayrılıq anlarında aşığa diqqət kəsilmişdi. İbrahim kişi möhkəm dolmuşdu. Dedi:

– Aşıq qardaş, sözün cavabı söz olar. Qoy bir söz də mən deyim, özünlə yadigar apar. Yeri gələndə məclislərdə hərdən bizi də yada salarsan.

İbrahim kişi:

Aşıq, yollarına güllər döşənsin,
Qəlbini şad apar Dərələyəzdən.
Şöhrətin bir az da artdı, çoxaldı,
Ad üstə ad apar Dərələyəzdən.

Bizim görüşümüz düşsün dillərə,
Keçsin pərdələrə, hopsun tellərə,
Qoca Borçalıya, ağır ellərə,
Bir parça od apar Dərələyəzdən.

Ömrümüz çox keçib alovdan, oddan,
Qoca İbrahimi çıxartma yaddan,
Həmişə şirin ol, həmişə daddan,
Tam apar, dad apar Dərələyəzdən.

İbrahim kişinin şeirə-şeriyyətə bu qədər dərindən bələd olması təsadüfi deyildi. Aşıqlar məskəni kimi tanınan, Aşıq Cəlil, Aşıq Qəhrəman, Aşıq Paşa, Aşıq Fətulla, Aşıq Məhəmməd, Aşıq Mirzalı, Aşıq Bəhman kimi ustad aşıqlar, Aşıq Mehdi, Aşıq Rzaqulu kimi el şairləri yetirən Dərələyəz mahalında aşıq sənətinə həmişə tükənməz sevgi, coşqun məhəbbət olmuşdur. İbrahim kişinin Aşıq Hüseyn Saraçlıya vurğunluğu da o kökdən, o mayadan qidalanırdı. Aşıq Hüseyn İbrahim kişinin şəxsində yeni bir xəzinə kəşf etmiş, canlı bir kitab tapmışdı. O kitabı varaqladıqca varaqlamaq, oxuduqca oxumaq istəyirdi. Ona görə də el ağsaqqalının sevgi dolu şeirinə elə həmin sevgi ilə də cavab verdi:

Gözüm gördü, könlüm sevdi, qulaqlarım eşitdi,
Səni əsil Dədə gördüm, Dədə İbrahim kişi!
İşığını bu yerlərə çox görməsin Yaradan,
Toxunmasın varlığına zədə, İbrahim kişi!

Ərənlərin sirdaşısan, sazdı-sözdü yaşıdın,
Baş kişilər məclisində başçılardan baş idin,
Peyğəmbərdən gələn adı imam kimi daşıdın,
Çoxdan bizə gəlib çatıb sədə, İbrahim kişi!

Yüz varaqla, başa çatmaz könüllərin kitabı,
Aqil olan hər suala orda tapar cavabı,
Öyrədənə, öyrənənə birə-mindi savabı,
Kim istər ki, əlləri boş gedə, İbrahim kişi?

İxtiyarsan, ağsaqqalsan, çox yormağa qıymadım,
Sənli keçən günlərimi öz ömrümdən saymadım,
Görüşündən, söhbətindən, məclisindən doymadım,
Heyif, gəldi tez yetişdi vədə, İbrahim kişi!

Bu səfərdən Borçalıya Aşıq Hüseyn Saraçlı bir Dərələyəz sevgisi, Dərələyəz məhəbbəti aparırdı. Aran Borçalıda, Dağ Borçalıda, Bağ Borçalıda yağış kimi məclislərə səpələmək, bərəkət kimi yaddaşlarda göyərtmək üçün.

* * *

Elə-obaya, kəndə-şəhərə xəbər yayıldı ki, Aşıq Hüseyn Saraçlı Naxçıvana gəlib. Doğrudan da, Aşıq Hüseyn Saraçlı bir neçə gün idi Naxçıvandaydı. Bu xəbər Şahbuz tərəflərdə Qışlaqlı Sərraf Qasıma da yetişdi. Sərraf Qasım neçə illərdi Aşıq Hüseyn Saraçlının səsinə, nəfəsinə, avazına heyran olmuşdu. Ancaq heç vaxt üzbəüz görüşməmişdi. Ona görə də fürsəti fövtə vermədi. Bu söhbəti eşidən kimi özünü Şahbuzdan

aşığın Naxçıvanda apardığı toy məclisinə yetirdi. Söz adamları bir-birini çox tez tanıyır. Yüz ilin doğması kimi görüşdülər. Naxçıvanda yaxşı tanınan və sevilən, Haqdan vergisi olan el şairi Sərraf Qasımla Aşıq Hüseyn Saraçlının qoşalaşması məclisə yeni bir təravət gətirdi. Sərraf Qasım Hüseyn Saraçlının gəlişi münasibətilə aldı görək ustad aşığa necə xoşgəldin elədi, Aşıq Hüseyn Saraçlı ona nə cavab verdi:

Sərraf Qasım:

Ustad, yerin gözlər üstə,
Xoş gəlib, səfa gəlmisən,
O yer halal, bu yerlər saf,
Halaldan safa gəlmisən.

Aşıq Hüseyn Saraçlı:

Məni gətirən gətirdi,
Can içində cana gəldim,
Nəqşi-cahan dediyimiz
Qədim bir cahana gəldim.

Sərraf Qasım:

Dildə, dişdə, səsdə mənəm,
Zildə mənəm, pəsdə mənəm,
Saza, sözə xəstə mənəm,
Sən mənə şəfa gəlmisən.

Aşıq Hüseyn Saraçlı:

Könlümü verdim sənətə,
Durdum Haqqa ibadətə,
Zəvvar kimi ziyarətə,
Arı kimi şana gəldim.

Sərraf Qasım:

Axar suların safısan,
Eşqin Ağrısı, Qafısan,
Sən sərraflar sərrafısan,
Qasım Sərrafa gəlmisən.

Aşıq Hüseyn Saraçlı:

Qara daşı ləl eylədi,
Qucaq açdı, gəl eylədi,
Saraçlıya əl eylədi,
Ulu Naxçıvana gəldim.

Bu əlüstü deyişmədən sonra Aşıq Hüseyn sazla dediyi kimi, sözlə də dedi ki, necə ola bilərdi ki, mən Aşıq Hüseyn Saraçlı olam, elləri-obaları diyar-diyar gəzəm, bu vaxta qədər Möminə xatının türbəsini, Atabəylərin yurdunu, Duz dağının şəfasını, Əcəminin naxışlarını, Batabatın gözəlliyini, Zor bulağın saflığını, Arpaçayın mənzərəsini, Əlincənin ucalığını, İlanlı dağın sərtliyini, Əshabi-kəhfin möcüzəsini, Atababa, Kültəpə, Qaradağlar türbələrinin qədimliyini və müqəddəsliyini öz gözlərimlə görməyəm. Bu səfər mənim çoxdankı arzum idi. Sazın ən şirin və ləngərli havalarından olan “Naxçıvanı” havasının səsi-sorağı məni bu yerlərə gətirdi. Aşıq Hüseyn Saraçlı bir az çay süfrəsi arxasında söhbətləşəndən sonra ağsaqqalların xahişi ilə yenidən ayağa durdu. Amma məclisdə əyləşənlərin ona qarşı diqqəti, marağı, məhəbbəti aşığı elə kövrəltmişdi ki, Ələsgər demiş, “çaylar kimi çağlamaq” eşqinə düşmüşdü. Elə bu eşqlə də sözə-söhbətə başladı:

Meydana çağırar sənətkarını,
Eşqini dillərdə bir dastan eylər.

Dünəni bu günlə qucaqlaşdırar,
Bir dövrün içində min dövran eylər.

Çiçəyi, yarpağı sevdirər bizə,
Hər gülü, hər bağı sevdirər bizə,
Yarpağı, torpağı sevdirər bizə,
Bir damla sevinci bir cahan eylər.

Coşar gözəlləri heyran görəndə,
Sağalar dərdinə dərman görəndə,
Elləri bir ürək, bir can görəndə,
Tellər qucaqlaşıb canhacan eylər.

Saraçlı Hüseynəm, nurlu danım var,
Hər teldə, pərdədə ruhum, canım var,
Harda "Şərili"m var, "Naxçıvanı"m var,
Orda bayramını Naxçıvan eylər.

"Naxçıvanı" havasına çox böyük şövqlə aşığın oxuduğu bu söz məclisi yerindən oynatdı, "Əhsən! Afərin!" sədaları buludları titrətdi.

Aşıq Hüseyn Saraçlının məclisdə yaratdığı heyrət Sərraf Qasımı yerindən oynatdı. Ayağa durub məclisə müraciətlə dedi:

Kişininki gərək Haqdan verilə,
Nərəyə bax, elə bil ki, Kürdü, Kür.
Avaza bax, ovsuna bax, sehrə bax,
Söhbətə bax, elə bil ki, dürdü, dürr.

İki qardaş dayanmışıq göz-gözə,
Yaraşıqdır fikir fikrə, söz sözə,
Hər dastanı ilahi bir möcüzə,
Kökdü, zatdı, qədimlikdi, pirdi, pir.

Şair Nəbi, Aşıq Şenlik ziyası,
"Əsli-Kərəm", "Aşıq Qərib" mayası,
Dilindədi Yaradanın duası,
Zirvələrin seli kimi gurdu, gur.

Sazdı-sözdü saniyəsi, saatı,
Yaraşığı qoşma, təcnis, bayatı,
Aşiqlərin ömrü-günü, həyatı,
Aydı, Gündü, çilçıraqdı, nurdu, nur.

Sərraf Qasım düşdü səsin izinə,
Qulaq asdı, işıq gəldi gözünə,
Belə dolu, belə zəngin xəzinə,
Yaradanın özü bilən sirdi, sir.

Halal sevgilərin alqış payından Sərraf Qasıma da çatdı. Məclis birə-min gözəlləşdi. Şirin məclislər bir-birini əvəz edirdi. Ağsaqqalların arzusuyla məclisin birini də Şahbuzun Kolanı kəndində Əsgərxan kişinin evində qurdular. Dərələyəzdən köçüb Şərurun Danyik kəndində yaşayan Aşıq Həmid, Aşıq Hidayət, Aşıq Fərrux Hüseyn Saraçlının sorağına gəlmişdilər. Naxçıvan aşıqlarından Aşıq Fətullahın (Aşıq Fətullah Aşıq Mehdinin doğma dayısıdır. Köçüb Naxçıvanda yaşayırdı. Dərələyəzin Herher kəndindəndir), Aşıq Qulunun, Aşıq Həsənin, Aşıq Məhəmmədin, Aşıq Əlinin, Aşıq Abdullanın adları dillərdə yenidən qanadlanır, hər biri ilə bağlı şirin xatirələr, gözəl söhbətlər könüllərə sazın-sözün sehrkar havasını gətirirdi.

Əsgərxan kişi elin hörmətli, sayılan-seçilən adamlarından idi. Hüseyn Saraçlının Naxçıvana gəlişinin əsas səbəbkarı da o kişi idi. Saz-söz xiridarı, aşıq vurğunuydu. Bir neçə dəfə Borçalıya gedib-gəlib, aşıqla möhkəm dost olmuşdu.

Şükür Haqqa, şirin keçdi görüşlər,
Qan damara, damar qana yetirdi.
Məhəbbətin qanadları açıldı,
Qəlbi qəlbə, canı cana yetirdi.

Aşıq dindi, şux bülbüllər lal oldu,
Bir havada dinən min bir xal oldu,
Simlər üstə barmaqları bal oldu,
Hər havadan bir nişana yetirdi.

Kim söhbətə vurğun oldu, kim saza,
Bu tarixi kim yarada, kim yaza?
Salam gəldi Borçalıdan Şahbuza,
Saraçlını Əsgərxana yetirdi.

Məclis başa çatandan sonra saz-söz vurğunu olan bir neçə cavan aşığın ürəyindən keçən arzuları canla-başla yerinə yetirdi. Naxçıvanda olan ocaqları, pirləri, ziyarətləri, türbələri, tarixi abidələri gəzdirib, hər birinin tarixiylə onu hali elədilər. Aşıq burda da böyük el sevgisi, xalq məhəbbəti görüb murazına çatmışdı. Artıq getmək vaxtı yaxınlaşırdı. Həvəskarlar aşıqdan ayrılmaq istəmirdilər. Saatın əqrəbini saxlamaq, buludun ətəyindən dartmaq, küləyi cilovlamaq mümkün olmadığı kimi, zamanı dayandırmaq da imkan xaricində idi.

Aşıq Hüseyn Saraçlı Naxçıvandan ayrılırdı. Vaxt hökmünü verirdi. Sağollaşmaq, vidalaşmaq, halal-hümmət – hamısı başa çatanda Aşıq Hüseyn Naxçıvanın başıqarlı dağlarına boylanıb son sözünü belə tamamladı:

Yüz də danış, sonluğu yox, sonu yox,
Tükənməzdi bu məkanın dastanı.
Fürsət tapıb tarixlərə yazsalar,
Bir dünyadı hər insanın dastanı.

Qoca tarix hər daş üstə qazılmaz,
Yaddaşlara yazılanlar pozulmaz,
Hər oğulun qismətinə yazılmaz,
Şan-şöhrətin, adın-sanın dastanı.

Türbə gördüm, türbə ətri qoxudum,
Sazdan, sözdən ona xalı toxudum,
Tarixlərdə çox dastanlar oxudum,
Atabəydi bu meydanın dastanı.

Bu yerlərdə neçə-neçə ozan var,
Bir mətləbi min bir yerə yozan var,
Hər dastanı yaradan var, yazan var,
Mənim oldu bu zamanın dastanı.

Saraçlıyam, qayğı gördüm elində,
Səsə döndüm pərdəsində, telində,
Dünya görmüş bir aşığın dilində,
Min bir oldu Naxçıvanın dastanı.

Sürgün... XX əsrin 90-cı illəri idi. Günlərin birində dostlar məni Qazaxıstanın Çu vilayətinə dəvət eləmişdilər. 15 günlük səfərimdə gözüm nələr gördü, qulağım nələr eşitdi... Otuzuncu illərdə Azərbaycandan sürgün olunanlar. Ağlayanlar, gülənlər, sevinənlər, göz yaşı tökənlər, rəyi gedənlər. Sazımın tellərində, sözümün qanadında uçanlar... Gələnlər bir-bir tanışlıq verir, adlarını, nəsillərini, hardan gəldiklərini deyir, özlərini təqdim edirdilər. Gələnlərin içində ucaboylu, nazik bədənli, alagözlü, ağsaçlı, bəy yerişli bir kişi mənə yaxınlaşıb əlimi sıxdı, öz doğma balası kimi bağrına basdı.

Adını soruşdum, “Adım Sürgündür” dedi. “Sürgün adında adama birinci dəfədir rast gəlirəm”, – dedim. Mənim sözüm kişini talan olmuş şəhərə döndərdi. Gözlərini uzaqlara zilləyib, fikirli-fikirli sözə başladı:

– Ay qardaşoğlu, bizi otuzuncu illərdə Füzuli rayonunun Kərimbəyli kəndindən sürgün ediblər. O kənd mənim babam Kərim bəyin adını daşıyırdı. Mən həmin Kərim bəyin nəvəsiyəm. Şura hökumətinin taxtı tarac olsun, yəhəri qanla dolsun, qan üstündə qurulmuşdu. Varımızı-dövlətimizi əlimizdən almaqla ürəyi soyumadı, gözü doymadı, üstəlik, bizi də Qazaxıstana sürgün elədi. Cənnətdən cəhənnəmə, çeşmələrin gözündən ilan mələyən qumlu səhralara düşdük, oğul. İndi nə var, buraları cənnətə döndərmişik. Yollarda qırılan qırıldı, ölən öldü, itən itdi, batan batdı. Atamın, qardaşımın, bacılarımın hamısının meyidi çöllərdə qurda-quşa yem oldu. Düz-əməlli basdıra da bilməyiblər. Sürgün qatarı Azərbaycandan tərpənəndə mən anamın boynunda olmuşam. Qatar Qazaxıstana çataçatda mən elə qatarda anadan olmuşam. Anam mən dünyaya gələndən bir həftə sonra dünyasını dəyişib.

Sürgünlük!

Yetimlik!

Qəriblik!

Yoxsulluq!

Hamısı birdən döyüb qapımızı. Yazıq nənəm ağlaya-ağlaya adımı “Sürgün” qoyub. Ömrümüz boyu burda ölənimizə, orda itənimizə ağlamışıq. Nə ölən dirilib, nə itən tapılıb. İndi sənin gəlişini eşidəndə elə bil camaatın üstünə gün doğdu. Sən təkcə özünü gətirməmisən. Qarabağı, Şuşanı, Qoşqarı, Kəpəzi, Kərimbəylini, Azərbaycanı bizə gətirmisən, oğul. Barmaqların, sazın, sözün, avazın var olsun, mənim balam.

Sürgün... qapıları bağlayan, ocaqları söndürən, ilikləri donduran, sümükləri göynədən, insanı dirigözlü öldürən, ətini yeyib, qanını içən yeddibaşlı əjdaha, zəhərli səhra ilanı, qudurmuş it, ac canavar, vəhşi donuz...

Azərbaycanın hər yerində olduğu kimi, sürgün Qazax mahalının Əskipara kəndindən də yan ötmədi. Əskiparadan da sürgünlər başladı.

Eldə-obada mərd və sərt kişi kimi tanınan Əskiparalı Aşıq Qurbanın nəslini, Məmmədağanın nəslini də Qırğızıstana sürgün elədilər.

İndi sizə hardan deyim, kimdən danışım, əsli Əskiparadan olan, sürgündə yaşayan Bimar təxəllüslü, Mehralı adlı bir el şairindən. O Bimardan ki, günlərin birində ürəyi qubar eləyib, qəlbi şan-şan olanda Aşıq Hüseyn Saraçlını yadına salıb, onun ünvanına şeirlə belə bir məktub yazmışdı:

Şər qarışar, şölə düşər çırağa,
Çıraq ağlar, ah-zar ağlar, şam ağlar.
Şam axşam alışar, gecələr yanar,
Amma mənim gözüm sübhi-şam ağlar.

Ayrılıq canıma necə güc eylər,
Sındırıb qəlbimi əyər, kəc eylər,
Çəkilməz dərdimi biəlac eylər,
Gözüm qürbət eldə hər axşam ağlar.

Çox sonalar ayrı düşüb gölündən,
Zəhər yedik ayrılığın əlindən,
Çünki ayrı düşüb yarın elindən,
Bimar ağlar, divar ağlar, dam ağlar.

Sən demə, bu şeir təkcə sürgünlə, həsrətlə bağlı deyilmiş. Bimar Mehralı şirin yuxuda yatdığı yerdə ona Tiflisdə Gülnar xanımı buta veriblər. Yuxudan ayılan kimi bir bayatı çəkir:

Mən aşıq birəm, birəm,
Qar düşər birəm-birəm.
Qadir Allah, kömək ol,
Qürbətdə birəm, birəm.

Allah min dərd veribsə, min bir də dərman verib deyillər. Ulu Tanrı Bimara kömək olur. Gəlir qoca Tiflisə, Şeytanbazarda aşıqların çalıb-oxuduğu, köhnə kişilərin “dıraxdın” dediyi bir çayxanaya daxil olur ki, adı çayxana olsa da, aşıqların, xanəndələrin, saz-söz adamlarının cəm olduğu, görüş, əhdi-peyman yeri kimi bu yer Tiflisdə çox məşhur imiş.

Dərdi olan özünə bir dərdmənd axtarar. Çayxanada fikir verir gələnlərə, gedənlərə, əyləşənlərə. Nəsə gözü bir ağsaqqalı tutur. Fikirləşir ki, bu adama ürək qızdırıb, dərd açmaq, sirr demək olar. Tanış olurlar. Kişi doğrudan da, danəndə bir kişi olur. Məsləhət görür ki, bu işdə sənə ancaq Aşıq Hüseyn Saraçlı kömək edə bilər. Bimarın yanına bir bələdçi qatıb onu hörmətlə Saraçlı kəndinə yola salır. Özünə də tapşırır ki, oğul, mənə Tavat Süleyman deyəllər. Al, bu da mənim ünvanım. Bu işdə nə çətinliyin olsa, tükümü yandır, yanında hazıram.

Bimar Mehralı gəlir Saraçlı kəndinə. Məsələdən hali olan Aşıq Hüseynin uçmağa qanadı olmur. Bir-birlərini yüz ilin həsrətlisi kimi bağrına basıb, öpüşüb-görüşürlər. Çünki Aşıq Hüseyn Saraçlı Bimardan məktub alandan sonra onun şeirlərini məclislərdə həvəslə, yanğıyla oxuyurdu. İndi həmin adam öz ayağıyla gəlib onun evinə çıxmışdı. Bimar Mehralı bir həftə aşığın əziz qonağı olandan sonra gəlişinin mətləbini Aşıq Hüseyn Saraçlıya çatdırır, görək necə çatdırır:

Bir alagözlünün sorağındayam,
Axşam axtarıram, səhər gəzirəm.
Xeyirxah bəndəsən dedilər mənə,
Səndən bir xeyirli xəbər gəzirəm.

Dağı parçalayar, qayanı çapar,
Sevən sevgisini Kəbətək yapar,
Atalar buyurub: “Axtaran tapar”,
Mən də kənd axtarıb, şəhər gəzirəm.

Düşdüm cığırlara, düşdüm izlərə,
Sevginin qüvvəti gəldi dizlərə,
Bimaram, baş vurdum göy dənizlərə,
Dənizin dibində gövhər gəzirəm.

Aşıq Hüseyn Saraçlı Bimarın butasının, sevgisinin kim olduğunu, harda olduğunu bilən kimi, ürəkdən şad oldu, görək Bimara nə cavab verdi:

Ay sevgi xəstəsi, yollar yorğunu,
Sıxmasın qəlbini kədər, darıxma.
Yaradan yar olar haqq aşığına,
Getməz bu zəhmətin hədər, darıxma.

Neçə toy-düyünə olmuşam aşıq,
Neçə ürəklərə salmışam işıq,
Üz tutub yanına gəldiyin aşıq
Sabah elçiliyə gedər, darıxma.

Gəlmisən evimə xoş niyyət ilə,
Qəlbində tükənməz məhəbbət ilə,
Hüseyn Saraçlı el adətiylə,
Özü toyunuzu edər, darıxma.

Bimar oldu Kərəm, Aşıq Hüseyn Saraçlı oldu onun Lələsi. Tavat Süleymanı tapdılar. Bimarın sevgilisi Gülnar xanımın harda yaşadığını öyrəndilər, elçi getdilər. Aşıq dili yüyrək olar. Nişan taxıldı, toy çalındı.

Sevgililər şəhəri qoca Tiflis Qəribi Şahsənəmə necə qovuşdurmuşdusa, Bimarı da Gülnar xanıma eləcə çatdırdı. Tavat Süleyman xərcini çəkib öz doğma balaları kimi sevgililərə üç gün, üç gecə məclis qurdu. Bimarın könlü şad oldu. Gülnar da murazına çatdı. Bimarla Gülnar bir-birinə qovuşandan sonra Aşıq Hüseyn Saraçlının sevinci yerə-göyə sığmadı. Elə bil təzəcə dünyaya gəlmişdi.

Bimar Mehralı sevgilisini də götürüb Qırğızıstana qayıtdı. Aradan iki il keçmişdi. Saraçlıya Bimardan yenə bir məktub gəldi. Aşıq Hüseyn Saraçlını oğlunun sünnət toyuna dəvət edirdi. El şairi məktubunu belə yazmışdı:

Qürbət eldə oğlum olub,
adını Qürbət qoymuşam,
Ay Saraçlı, məndən ötrü
gəl qürbəti Vətən eylə.
Bas bağrına telli sazı,
candan çıxsın ağrım-acım,
Həsrətimi, kədərimi,
ölən eylə, itən eylə.

Yerin qəlbi daşa dönüb,
dağ da susub, daş da susub,
Ağlamaqdan yorulmuşam,
gözümdəki yaş da susub.
Ürəyimi aça bilmir,
yaz da susub, qış da susub,
Lal dilimə bir nəğmə ver,
bülbül kimi ötən eylə.

Ağac kimi bar gətirib,
meyvə kimi dərilərəm,
Qədəmlərin dəyən yerə
palaz olub sərilərəm.
Qəbrim olsa, baş qaldırram,
ölmüş olsam, dirilərəm.
Murazıma çatdır məni,
mətləbimə yetən eylə.

Hər sətrindən həsrət yağan, göz yaşı tökülən belə bir məktubdan sonra getməmək olardımı? Bəlkə də Bimar Mehralı adında adam heç yox idi bu dünyada, Bimar

şəklində onu qədim Türküstana Manasın, Kaşğarlı Mahmudun, Əhməd Yəsəvinin, Balasaqunlu Yusifin, Əmir Teymurun, Yunus Əmrənin, Nəvainin, Abayın, Mətumqulunun, Mollanə əsin ruhları çağırırdı. O ruhlar ki, min illər boyu Altaydan Anadoluya, Doğudan Batıya at minib, qılınc oynadıb, qamçı çəkib türkün ruhunu yaşatmışdı. Ruhu ölməyə, nəğməni susmağa, səsi kəsilməyə, sazı kiriməyə qoymadı. Bu yerdə ozanlar ozanı Hüseyn Saraçlı Qazax türkü, səhralar nəğməkarı Abayın misralarını xatırladı.

Sərvətə dəyişdi çoxu nəğməni,
Hər kəs duya bilməz axı nəğməni.
Alçaq adamlara nəğmə yaraşmaz,
Ruhu olanlarçün oxu nəğməni.

Axı, onu yoldan keçən təsadüfi bir adam yox, ağac kimi kökündən qoparılan, əti dırnaqdan, közü ocaqdan, başı papaqdan, sözü dodaqdan ayrılan, Vətən deyəndə, Azərbaycan deyəndə bağrı köz-köz olub yanan qərib bir şair – eloğlu çağırırdı.

Bəli, Aşıq Hüseyn Saraçlı Türküstana gedirdi. Çiynində saz, sinəsinin altında ozan ürəyi. O, tək getmirdi, sazla gedirdi, sazla. Əlifbadan qabaqkı, yazıdan əvvəlki dünyanın yadigarıyla. O, sazı aparmaqla Azərbaycan türklərinin yaddaşını, Dədə Qorquddan Dədə Şəmşirə, Dədə Əmraha qədər bütün ozanları türkün qədim Vətəninə aparırdı. Sazın yetmiş iki havasını aparırdı. Nədir bu yetmiş iki hava? Bəlkə Türk adlanan nəhəng ağacın yetmiş iki budağını aparırdı? Hər budağın öz meyvəsi, hər meyvənin öz dadı-tamı. Havalarımızın adına baxın: “Dilqəmi”, “Yanıq Kərəmi”, “Hicranı”, “Qürbəti”, “Zarıncı”, “Dol hicranı”. Hansı havaya əl vurursan, ondan dərd tökülür, od-alov yağır, atəş püskürür, göz yaşları süzülür. Qürbətdə doğulan körpələrə verilən adlara baxın: Bimar, Qərib, Qürbət, Hicran, İntizar, Sürgün, Əfqan, Fəqan...

Qatar şütüyürdü, sürünürdü, hayqırırdı, səhraları başına götürmüşdü. Hərdən hirsi tutan atlar kimi yerindən tərpənmir, yerindəcə silkələnirdi, hərdən palçığa batmış camış kimi yerində yırğalanırdı, hərdən də qış yuxusuna getmiş ilan kimi səhrada qıvrılıb yatırdı. Bu qatarda Vətəndən qürbətə qəribləri sevindirməyə gedənlər çox idi. Onlardan biri də Aşıq Hüseyn Saraçlı idi.

Axır ki, qatar mənzilə çatdı. Camaat tökülüşməyə başladı. Ata-bala, ər-arvad, qardaş-bacı hamı bir-birinə qarışmışdı. Ağlayan kim, gülən kim, ürəyi gedən kim, bir-birini duz kimi yalayan kim. Elə bil hamının başına hava gəlmişdi. Hamı havalıydı, hamı sorğulu-suallı idi. Yüzdən artıq adamın gözü həsrətlə bir adamı axtarırdı – Aşıq Hüseyn Saraçlını! Tapdılar, görüşdülər. Ayağını yerə qoymağa macal vermədilər. Xalça saldılar. Xalçadan bir az aralı qurban kəsdilər. Saat yarımlıq yoldan sonra mənzil başına çatdılar. Yaşıl meşələrin içində yerləşən bir kəndə gəldilər. Vətəndən adam gələ, qürbətə Vətən gətirə, gələn də ozan ola. Gəl indi baxdıqca bax bu tamaşaya, bu səhnəyə!

Suallar başladı, nə başladı. Sual verə-verə, cavab ala-ala, heç kəs göz yaşı adlı tilsimdən yaxa qurtara bilmirdi:

Əzizinəm, gülə naz,
Bülbül eylər gülə naz.
Girdim yar bağçasına,
Ağlayan çox, gülən az.

Gecədən xeyli keçmiş camaat yavaş-yavaş dağılışmağa başladı. Hüseyn Saraçlı Bimarı oğlu olmağı münasibətilə təbrik elədi, xeyir-dua verdi. Uşağın adını soruşdu. Bimar dedi: “Ustad, adını qoymamışıq. Gözlədik sən gələsən, adını da qoyasan, məclisini də keçirəsən”. Aşıq bu sözdən çox kövrəldi: “Körpənin adını

Vətən qoyuram" – dedi. Bu söhbət camaata yayıldı. Əlli ildi vətəndən ayrılanların hamısı bu adı sevdi, əzizlədi. Bu ad elə bil bütün körpələrin adı idi.

Hüseyn Saraçlı özü boyda oda-alova, nağıla, dastana, saza-sözə, xatirəyə dönmüşdü. Allahın ona verdiyi nə qədər istedad vardısa, hamısını qürbətin, qəriblərin ayağı altına gül kimi səpələmək istəyirdi. Gün kimi doğmaq, yağış kimi yağmaq istəyirdi.

Ayrılıq çağları gəldi yetişdi. Aşıq Hüseyn Saraçlı gələndə əli-ayağı yerə dəyməyənlərin aşıq gedəndə elə bil hamısının əli-ayağı yerə yapışmışdı. Heç kəs yerindən tərpənmirdi. Hamı dilsiz daşa, qurumuş ağaca, suyu soğulmuş dəyirmana dönmüşdü. Hərəkətdə olan bircə göz yaşlarıydı. Gözlərdən yanaqlara, yanaqlardan əllərə, ovuclara doğru yol gedirdi. Bu yolun sonu görünmürdü. Ayrılıq anında aşıq sazsız-zadsız əlini qulağının dibinə qoyub "Atüstü" havasına dalbadal üç bayatı çəkdi:

Əzizim, qazan ağlar,
Od vurar, qazan ağlar.
Qərib yerdə ölənin
Qəbrini qazan ağlar.

Əzizim, məzə qanlı,
Mey qanlı, məzə qanlı,
Qorxuram qərib öləm,
Yurdumda gəzə qanlı.

Viran qal, dağlar, səni,
Bağçalar, bağlar, səni.
Dostumun yaylağısan,
Dost gələr, ağlar səni.

Aşıq bu bayatıları oxumaqla bir Quranlıq söz demişdi. İnsanın başına gələn müsibətlərin hamısı bu üç

bayatıda var idi. Qatar tərpəndi... Aradan altı ay keçmişdi. Bimar Mehralının bir məktubu da gəldi Aşıq Hüseyn Saraçlıya:

Eşidən eşidib, bilməyən bilsin,
Çox gözlədim baxtı qara dərdimi.
Dərdmənd olmadı halıma yana,
İndi aparıram gora dərdimi.

Azalan görmədim ahı-vayımı,
Qürbət tapdaladı haqqı-sayımı,
Eşidən olmadı hay-harayımı,
Çatdıra bilmədim kara dərdimi.

Bimarın bağrını həsrət əzibdi,
Qürbət ellər ürəyini üzübdü,
Ana torpaq çox dərdimə dözübdü,
Verin çəksin Əskipara dərdimi.

Məktub Aşıq Hüseyn Saraçlıya yetişəndən bir həftə sonra Bimar Mehralı ayrılığa dözə bilməyib Allahın rəhmətinə qovuşmuşdu. Aşıq Hüseyn Saraçlı Bimarın ölüm xəbərini eşidəndən sonra ömrü boyu Bimarın şeirlərini ən yaralı havalar üstə oxuya-oxuya elləri-obaları dolaşdı.

* * *

Aşıq Hüseyn Saraçlı bir gün bütün şəyirdlərini öz evinə dəvət elədi. Yedilər-içdilər, dedilər-güldülər. Qabırğa söhbəti, sabah sazı elədilər.

İnsan bucaqda yox, ocaqda böyüyər. "Külü küllükdən götür" deyiblər. Ocaq oğlu həmişə ocağa sarı gedər. Aşıq Hüseyn Saraçlının toylara, məclislərə çox işlədiyi yerlərdən biri də Ağbaba mahalıydı. Əfsanəyə görə,

qədim zamanlarda bu yerlərdə üç qardaş yaşayırmış: Ağbaba, Sarıbaba, Hacıxalıl baba.

Bu gün hər üç qardaşın adına məşhur dağlar, zirvələr və ocaqlar var ki, onlardan biri də Ağbabadır. Bəlkə də Aşıq Hüseyn Saraçlını bu yerlərə bu üç qardaşın ocağı olan, dağ olan, zirvə olan ruhları çəkib aparırmış.

Dərələyəzdən sonra nədənsə aşığın ürəyi onu Ağbabaya sarı çəkirdi. Dəfələrlə seyrinə çıxdığı Ağbaba mahalından ötrü burnunun ucu göynəyirdi. Arpaçay da, Dəli çay da, Qaraxan çayı da, Atüzən çayı da elə bil aşığın ürəyindən axıb keçirdi. Yenidən bu çayların qıjıltısına qulaq asmaq, Ziyarət dağına, Qartallı dağa qalxıb zirvələr kimi yüksəlmək, Südlü bulaqdan içib durulmaq, cavanlaşmaq istəyirdi. Hər dəfə "Bəhməni" havası üstündə

Uca-uca dağ başında,
Tala-tala qar görünür...

– deyib zilə çəkəndə özü də xəyalən o uca dağların başına qalxırdı.

Nəhayət, 1967-ci ildə yayın sozalan, payızın başlanan vaxtı – avqust ayında Aşıq Hüseyn Saraçlı çox sevdiyi şəyirdlərdən biri olan, adı şəyird olsa da, ustad səviyyəli Aşıq Əhməd Sadaxlını da götürüb Ağbaba mahalına üz tutdu. Borçalıdan Başkeçidə, Başkeçiddən Naltökənə, Naltökəndən Ağbabaya yol gedib, Göllüdə Ələkbəroğlu Qurbanın evinə düşdülər. Mahala xəbər yayıldı ki, məşhur Borçalı aşığı Aşıq Hüseyn Saraçlı Ağbabaya gəlib. Qurban kişi mahalın başbilənlərinə xəbər elədi. Bu xəbərlə bağlı Təpəkənd kəndinin sədri Baxşəli kişini, Göllü kəndinin sədri Mustafa kişini, Güllücənin sovxoz direktoru Qulu kişini raykomun II katibi Ələsgər Həmzəyev mahalın rəhbərliyinə çağırıb məsləhət, məşvərət elədi ki, Aşıq Hüseyn Saraçlı çox

məşhur sənətkardı. Onu adına və adımıza layiq qarşılamalıyıq. Əvvəlcə istədilər məclisi Təpəkənd kəndinin məktəbində, 200 nəfərlik zalda keçirsinlər. Gördülər bu mümkün olmayacaq. Qismətdən havalar yaxşı keçirdi. Qərara aldılar ki, məclis açıq havada keçirilsin. Belə də oldu. Xalı-xalçayla bəzədilmiş, şah taxtına bənzəyən üstüörtülü bir səhnə düzəltdilər. Mahalın elə bir kəndi yox idi ki, bu tədbirə qatılmasın. Məktəbin həyətinə minlərlə adam toplaşmışdı. Bu tarixi məclisin iştirakçıları mahalın sayılmış ağsaqqalları – Güllübulaqdan Məhəmmədəli Məhərrəmov, Qaraçantadan Kərim Əsgərov, Oxçoğludan Nuru İsmayılov, Yusif İsmayılov, Tanrıverdi Quliyev, Bəşir Məmmədov, Yusif Əliyev idi. Ağbabanın özünə yaxın kəndlərindən – Təpəkənddən Qəmbər Bayramov, Salman və Rəsulov qardaşları, Şurabaddan Paşa Əliyev, Quzukənddən Hidayət Nəbiyev, Balıqlıdan Alyoşa Bayramov, Güllücədən Mehralı Xəlilov, Cümşüd İsgəndərov, Düzkənddən Ziyəddin Əhmədov, Göllüdən Osman Ömərov, Qaranamazdan Cavanşir Ramazanov, Ellərkənddən Ağabəy Daşdanov, Hacı bəy Hacıyev və kimlər, kimlər yox idi bu məclisdə? Məclis məclislikdən çıxıb saz-söz bayramına çevrilmişdi.

Aşıq Hüseyn Saraçlı bu 50-60 ildə başının tükü sanı məclislər görmüşdü. Ancaq Ağbabada keçən bu məclis başqa tamaşa, başqa tarix, başqa hadisə idi. Aşıq Hüseyn Saraçlı izdihama baxıb öz-özünə fikirləşirdi: “Bu yerdə deyiblər: “Xəstələn məndən ötrü, ölüm səndən ötrü”. Bu yerdə deyiblər: “Ay məhəbbət, hara gedirsən?”; cavab gəldi ki, məhəbbət gətirməyə”. Bu yerdə deyiblər ki:

Əzizinəm, nə qiyam,
Zülfün eylər nə qiyam.
Sən canından nə qıydın,
Mən canımdan nə qıyam?

Bu yerdə deyiblər: “Sənə canını qıyana sən ömrünü qıymalısan!”

Bəli, aşıq “Ya Allah, məni utandırma”, – deyib, saza bir nizam kök verib, Aşıq Əhməd Sadaxlıya “Möhkəm ol, bu gün bu mahal qarşısında əsl sənət imtahanı verməliyik” dedi. Bığlarını eşib, kəmərini bir az da möhkəm çəkib, güləşə çıxan pəhləvanlar kimi meydana gəldi. Sazını köynəkdən elə sıyırdı ki, elə bil Qoç Koroğlu Misri qılıncı qınından sıyırır. Minlərlə göz sevgi-məhəbbət işığında aşığa zillənmişdi. Göz gözdən, könül könüldən, nəfəs nəfəsdən od almışdı. Aşıq Hüseyn Saraçlını bu mahalın sevgisi o qədər yüksəklərə qaldırmışdı ki, özünü dünyanın ən uca zirvəsində uçan qartallardan da ucada hiss edirdi.

Telli sazlar dilə gəldi. Dünyanın ən şirin havaları, dünyanın ən müqəddəs səsləri, dünyanın ən ağıllı sözləri, boğazın ən şaqraq zəngulələri səhnədən camaatın üstünə yaylağın çiçəkləri kimi yağırdı. İzdihamdan qopan alqışlar sellərə döndükcə deyirdin bu saat dağlar yerindən oynayacaq, qayalar yerindən qopacaq. Aşıq bütün varlığını, Allahın ona bağışladığı ilahi vergilərin hamısını bu xalqa, bu camaata bağışlamaq istəyirdi. Dağların və məclisin ahənginə uyğun olaraq meydanı ən çox Koroğlu havaları almışdı. Çıldırlı Aşıq Şenliyin şəyirdi Ağbabalı Aşıq İsgəndərin türk ağızı, türk boğazı ilə çalıb-oxuduğu havalar da izdihama yeni can, yeni nəfəs verirdi. Bəlkə də Ağbabada olan bu boyda toy-tamaşa bu mahalın bəxtəvərli günlərinin ilk və son tamaşası idi. Saz-söz bayramı başa çatandan sonra Arpagölün qarşısındakı bəndin yanında Aşıq Hüseynin şərəfinə 300 adamlıq ziyafət verildi.

Bu tarixi məclisdən sonra sənətdən və sənətkardan doymayan el ağsaqqalları ayrı-ayrı kəndlərdə axşamlar xudmani məclisləri bir həftə davam etdirdilər. Bu məclislərdən biri də Göllü kəndində Ələkbəroğlu Qurbanın

evində təşkil olunmuşdu. Məclisdə Məmmədcanlılardan Alı kişi, Sofuoğlu Məhəmməd və başqa mötəbər kişilər iştirak edirdilər.

Ağsaqqallar Aşıq Hüseyn Saraçlıdan xahiş elədilər ki, ustad, biz "Mehdi bəyin dastanı"nı çox aşıqlardan eşitmişik. Ancaq deyilənə görə, onu sizdən gözəl danışan yoxdur. Bu gün bu dastanı sizin öz dilinizdən eşitmək istəyirik. Aşıq "baş üstə" deyib, əlini gözünün üstünə qoydu, təklifə ehtiramını bildirdi.

Hüseyn Saraçlı bu dastanı ustadnaməsindən müxəmməsinə qədər yerli-yataqlı məclisə çatdırdı. Axşam nə vaxt düşdü, gecə nə vaxt gəldi, dan yeri nə vaxt söküldü, heç kimin xəbəri olmadı. Məclis iştirakçıları elə bil aşıqlara yox, bülbüllərin cəh-cəhinə qulaq asırdılar. Məclisdə qəm üstündə köklənən Borçalı havaları – "Zarıncı", "Bəhməni", "Sultanı", "Mixəyi", "Dol hicranı", "Kərəmköçdü" insanları həddən çox kövrəltmişdi.

Son xahiş, təklif Aşıq Hüseyn Saraçlının özündən gəldi. Məclisdən xahiş elədi ki, Çıldırlı Aşıq Şenliyin şəyirdi Ağbabalı Aşıq İsgəndər Aşıq Şenliyin zəhərlənmə səhnəsini danışsın, biz də Borçalıya təzə ərməğan aparaq. Xahiş yerinə yetirildi.

Qısaca, hadisə belə baş vermişdi:

– Aşıq Şenliyin anası yuxuda görür ki, Aşıq Şenliyə zəhər veriblər. Ana səhər yerindən qalxan kimi oğluna yalvarır ki, oğul, bu gejə yuxumu, vayğamı qatmışam, bu gün evdən heç yana çıxma. Aşıq Şenlik anasına söz verir ki, ana, narahat olma, heç yana çıxmaram. Elə bu vaxt aşığın canbir dostu Dursun bəyin faytonu qapıda görünür: "Aşıq, hazırlaş, gəlmişəm səni aparmağa. Axılkələkdən Xospiya bəylərindən Mehdixan səni də, məni də oğlunun toyuna çağırır". Aşıq Şenlik qalır çarnaçar.

Bir yandan anasının tapşırığı, bir yandan dostu Dursun bəyin xahişi. Qalır odla suyun arasında. Dostunun üzündən keçə bilmir. Anasına yalvarır ki, məni bağışla,

dostumun sözünü yerə sala bilmərəm. Yazıq anaya agah olur ki, oğlunun başında qaranlıq var.

Nəysə... Gedirlər Mehdixanın toyuna. Doğrudan da, deyilən hadisə baş verir. Hər bir zamanda, hər bir məkanda olduğu kimi, burda da hansısa bir namərdin əli gəlir, aşığın çayına zəhər qatır. Aşıq çayı içən kimi hiss edir ki, artıq taleyi həll olunub. Anasının yuxusu düz çıxır. Aşığı Çıldıra çatdıra bilmirlər, Ağbabada, Quzukənddə qızı Gülxanımın evinə zorla çatdırırlar. Aşığın son sözü, son vəsiyyəti, son şeiri bu yaralı misralar olur:

Mehdixanlar bizi qonaq eylədi,
Bu yerə düşübdü güzarım mənim.
Anam çox yalvardı: "Getmə, amandı",
Qalsam, pozulardı ilqarım mənim.

Anam qalxıb bəd söylədi tuşumu,
Qəza gəldi, mən itirdim huşumu,
Həkk eylədin mənim məzar daşımı,
Çıldırda qazılsın məzarım mənim.

Şenliyəm, geymişəm qəm libasımı,
İçmişəm zəhəri, tutun yasımı,
Ölürəm, yetirin oğlum Qasımı,
Tutubdu yaxamdan azarım mənim.

Məclisin qəmli havasını dəyişmək üçün Çıldır, Ağbaba, Qars, Ərdahan tərəflərdə daha çox oxunan, daha çox Çıldır ağzına yaxın oynaq, şux havalar Aşıq İsgəndərin ifasında ortaya bir şuxluq gətirdi. Aşıq İsgəndər Çıldırda məşhur olan "Xoşdamağı", "Sarı yaylıq", "Konyalı", "Diyarbəkiri", "Summani", "Dərbədəri", "Köşə başı" havaları üstündə çalıb-oxudu. Bu gözəl havaları mən Aşıq İsgəndərin oğlu Aşıq Faxfurdan da eşitmişəm.

Məclisin sonunda Aşıq Hüseyn Saraçlı və Aşıq İsgəndər üz-üzə dayanıb hər biri öz mahalı, eli-obası haqda ürək sözlərini məclisə yetirir. Aşıq İsgəndər görək Ağbabanı necə vəsf edir:

Neçə-neçə nəğməkarın dilində xoş nəğmədi,
Bu gün bizə ilham verib dilləndirən Ağbaba.
Uzaq-uzaq səfərlərə oğul yola salanda,
Ağ dumanı yaylıq kimi yelləndirən Ağbaba.

Darda qoymaz, elin-günün harayına hay verər,
Zirvəsindən qar göndərər, ətəyindən çay verər,
Gedənlərə qurban kəsər, gələnlərə pay verər,
Ağ sürünü göy yaylaqda dölləndirən Ağbaba.

Yerdən çıxan, göydən yağan sərvəti var, zəri var,
Hər çiçəyin duruşunda bir nazlanan pəri var,
Qonşusuna, qonağına göz üstündə yeri var,
Bir cənnətdi ruhumuzu tellləndirən Ağbaba.

Ulu Tanrı bu yerlərdə belə qurub qurğunu,
Ayaq bassa şəfa tapar ayın-ilin yorğunu,
Havaların heyranıdı, aşıqların vurğunu,
Yaxşılara ad-san verib bəlləndirən Ağbaba.

Başımızın ucalığı, sinəmizin səngəri,
Ağsaqqalı, ağbirçəyi yerin-göyün ləngəri,
Aşıq Şenlik laylasında böyütdü İsgəndəri,
Ömrümüzü, günümüzü gülləndirən Ağbaba.

Aşıq Hüseyn Saraçlı:

Qan-qan deməz, can-can deyər, dosta verər canını,
Dodağımda çiçək açıb, dilimdədi Borçalı.
Min illərdi ürəyimdə yaşadıram saz kimi,
Barmağımda, mizrabımda, telimdədi Borçalı.

Tarix yazan mürəkkəbdi, dastan yazan qələmdi,
Sevinci az, kədəri çox, daşıdığı ələmdi,
Bu yollarda mən Kərəməm, o da mənim Lələmdi,
Ocağımda, atəşimdə, külümdədi Borçalı.

Gör nə qədər odu sönmüş odumdan od apardı,
Dəyişdirdi adımızı, adımdan ad apardı,
Mən səpdim, mən becərdim, mən biçdim, yad apardı,
Başı üstə zalımlar var, zülümdədi Borçalı.

Ağrılarda, azarlarda canı sökülüb gedir,
Zamanından tez qocalır, qəddi bükülüb gedir,
Ovcumuzda tutammırıq, qumtək tökülüb gedir,
Ürək edib deyəmmirəm, əlimdədi Borçalı.

Quranın ayəsi kimi müqəddəsdi, müqəddəs,
Hər gün Borçalı deyir içərimdən gələn səs,
Aşıq Hüseyn Saraçlıya həmi candı, həm nəfəs,
Dua kimi axşam-səhər, dilimdədi Borçalı.

Hamı yerbəyerdən bu söz-söhbətə "Əhsən! Afərin!" dedi. Alqış sədaları axan buludlara, əsən küləklərə qarışıb hər yerə bu səsdən, bu sədadan soraq apardı. Məclis onun sözündən, söhbətindən, danışığından doymurdu. Bir cavan oğlanın əli çənəsində, dirsəyi dizində qalmışdı. Heyrətini gizləyə bilməyib Aşıq Hüseyn Saraçlıya müraciətlə dedi:

– Ustad, mən səhərdən heyrətdəyəm. Bu qədər şirinlik, şeiriyyət, xəzinə bir sinəyə necə sığışır, bunlar hardan gəlir?

Sual Aşıq Hüseyni yenidən coşdurdu. Sazı "Osmannı divanisi"nə köklədi. Aldı görək, cavan oğlana nə cavab verdi:

Haqq aşığı olanların qəlbində çıraq yanır,
Sızlamağı telli sazdan, yanmağı neydən gəlir.

Yoxuşlarda yorulmursa sevənlərin ürəyi,
Ürəkdəki od-atəşdən, dizdəki heydən gəlir.

Dürüst, doğru yol göstərər övlada dürüst ata,
Yolu düzgün olanları ömründə tapmaz xata,
Mərdanəlik kökə bağlı, kişilik əsil-zata,
Bəyzadəlik kimdə varsa, bəy oğlu bəydən gəlir.

Bir damlaydım, mən də düşdüm eşq adlanan dəryaya,
Haqqa könül verənlərin zəhməti getməz zaya,
Sinəmdə bağlanan kitab saflıqdan tutub maya,
Öyrəndiyim həyat elmi əlifdən-beydən gəlir.

Ürəyimdə dalğalar var, hər gün verir səs-səsə,
Gahdan coşub zilə qalxır, gahdan da enir pəsə,
Dillər nəyi danışdırsa, tellər nəyi söyləsə,
Quran kimi nazil olur, ayətək göydən gəlir.

Aşıq Hüseyn Saraçlının Ağbaba səfəri yaddaşlara yazıldı, xatirələrə köçdü, dastanlara döndü, dildən-dilə, eldən-elə yayıldı, zaman-zaman yaşadı: ruhumuzu, dilimizi, nəfəsimizi təzə və təravətli saxlamaq üçün.

* * *

Aşıqlarda bir qayda var. Toy evində məclisi başa vurub yatmağa gələndə, yorğan-döşəyə uzanıb, mütəkkəyə, balınca dirsəklənib “qabırğa söhbəti” eliyəllər. Elə ki, səhər açıldı, yerdən durub, səhər yeməyini yeyib hərə bir-iki hava çalar, səsini-boğazını, sazını yoxlayıb, məclisin növbəti mərhələsinə hazırlıq görəllər. Arabir də axşamkı söhbətləri yada salıb gülər, bir-birinə göz vurub məzələnəllər. Axşamkı söhbətə “qabırğa söhbəti”, sabahkına “sabah sazı” deyəllər.

Qulaq asanın bəxtəvər başına. Dünyanın nə ki şirin, gülməli, ağlamalı, atmacalı işləri, meyləri, məzələri var,

aşıqlar öz aralarında əridib-süzər. Gülməkdən qarnını tutan kim, uğunub gedən kim, gözünün yaşını silən kim, bir-birini sürüyən kim. Bu da aşıqlar üçün ayrıca bir mənzərə, ayrıca bir dünyadır.

Aşıq Hüseyn Saraçlı şəyirdlərinə dedi:

– Yeməyiniz, içməyiniz, çalmağınız, oxumağınız halalınız olsun. İndi durun hazırlaşın. Faxralıya gedəcəyik.

Hamı bir-birinə baxdı: "Xeyir ola, bir bu qədər aşıq birdən-birə xəbər-ətərsiz nəyə gedirik?" Baxışlardakı sualı duyan aşıq onları məsələdən hali eləyib dedi:

– Çox sağ olun, mən sizdən çox razıyam. Heç vaxt mənim bir sözümü iki eləməmisiniz. Sizin hamınız Şair Nəbinin xətrini əziz tutursunuz. Bütün məclislərdə adını anıb, sözünü oxuyursunuz, rəhmətlə yada salırsınız. Bilirsiniz ki, mən Quşçu İbrahimə, Sarvan Bayrama, Şair Nəbiyə qulluq eləmişəm. Hamısının qarşısında öz şəyirdlik borcumu ləyaqətlə yerinə yetirmişəm. Çoxdandı belə yığılmırıq. Deyirəm, bu gün gedək Faxralıda Şair Nəbinin qəbrini ziyarət edək.

Hamı bir nəfər kimi bu işə razılıq elədi. İkinci söhbət ola bilməzdi.

Nə başınızı ağrıdım, gəldilər Faxralıya. Kəndin ağsaqqalları işi bildi. Mollanı da götürüb birlikdə Faxralı qəbiristanlığına gəldilər. Allah kəlamı, "Yasin" surəsi oxundu, dua verildi. Rəsmi – dini mərasim tamamlandı. Aşıqların və Faxralı ziyalılarının çıxışları başladı. Şair haqda acılı-şirinli xatirələr dilə gəldi, Aşıq Şenliyin Şair Nəbi ilə görüşündən, Səməd Vurğunun və Osman Sarıvəllinin Faxralıda olarkən Şair Nəbi yaradıcılığına marağından, münasibətindən gözəl söhbətlər oldu. Binnət müəllim, Baləmməddinin Nəbisi, ükənçi Nədir, Güllər İsmayıl, Aşıq Şəmistan, Kərim kişi, Hüseynqulu müəllim, Qulu müəllim, Əsmələr Əli, Ayvazöyünün Uğurlusu, Omar, Teşərələrin Əlisi, Əmirxan kişi, Hacı Həsənov, Oruc Əlizadə və başqaları idi bu söhbətin iştirakçıları.

Çıxışlar hamını kövrəltdi. Növbə aşıqlara çatanda Aşıq Hüseyn Saraçlı dedi:

– A Faxralı camaatı, sizdən çox razıyıq, ona görə ki, böyükdən-kiçiyə hamınız Şair Nəbini çox sevirsiniz. Seviləsi sənətkarı sevərlər. Rəhmətliyin şairliyi ilə şəxsiyyəti bir-birinə xəncərə gümüş yaraşan kimi yaraşırdı. İstəyirəm bu gün onun ruhunu şad eləmək üçün ustadın məzarı başında bir sazlı-sözlü məclis keçirib ruhuna layla çalaq.

Bu təklif hamının ürəyindən oldu. Bütün aşıqlar Şair Nəbiylə başladı, Şair Nəbiylə də sözünü tamamladı.

Axırda Aşıq Hüseyn Saraçlı bu mərasimi tamamlamaq üçün təklif elədi ki, Şair Nəbinin şəninə, şərəfinə bir şeir mən oxuyuram, məndən sonra da hər aşıq qədim Borçalı havaları üstündə bir bənd özündən şairin xatirəsinə şeir oxuyur. Bununla da bu gün bu ziyarətimizi başa vururuq.

Aşıq Hüseyn Saraçlı:

Gorun nurla dolsun, möhtərəm ustad,
Sənsən ustadımız, pirimiz bizim.
Zirvələr yanında uca zirvəmiz,
Sənətdə əbədi dirimiz bizim.

Halal mayasını Haqdan götürən,
Şenliyi Çıldırda eşqə gətirən,
“Otuz min şairə cavab yetirən”,
Meydanda şir oğlu, şirimiz bizim.

Coşan ilhamımız, daşan təbimiz,
Əhli-ürfanımız, elm-ədibimiz,
Faxralı elində Şair Nəbimiz,
Borçalı qəlbində yerimiz bizim.

Mən sənə şəyirdəm, sən mənə usta,
Yaradan yar olsun vəfalı dosta,

Adını çəkəndə bayramda, yasda,
Həmişə şeş verib zərimiz bizim.

Söz adlı nemətdən doymadıq qəti,
Yaşatdıq ürəkdə saf məhəbbəti,
Bildik nə deməkdi ustad zəhməti,
Dabandan çıxanda tərimiz bizim.

İşıqsan, üzündən mayalanmışıq,
Bulaqsan, gözündən mayalanmışıq,
Şairsən, sözündən mayalanmışıq,
Baldan şirin olub şeirimiz bizim.

Hər gün bir havadı, bir yeni bəstə,
İnsan ölməz olur nəğmədə, səsdə,
Aşıqlar səf çəkib qəbrinin üstə,
Tutacaq cahanı nurumuz bizim.

Qəlbimiz açıldı Haqqın nurunda,
Alışdıq odunda, yandıq qorunda,
Bu gün çıra tutduq sənin gorunda,
Sabah da şad olar gorumuz bizim.

Saraçlı haqq yoldan dönəsi deyil,
Avazı göylərdən enəsi deyil,
Min illər keçsə də, sönəsi deyil,
Odumuz, közümüz, qorumuz bizim.

Aşıq Hüseyn Saraçlının öz ustadı haqqında oxuduğu bu şeiri durna qatarı kimi məzarın ətrafında dövrə vuran aşıqlar hərəsi bir bənd oxumaqla davam elədi.

Aşıq Əmir Sarallar:

Ustada qulluqdu, ellərə xidmət,
Ədəb-ərkanımız, yolumuz bizim.

“Aşıqlıq Adəmdən icad olubdu”,
Adəmə uzanır qolumuz bizim.

Aşıq Əhməd Sadaxlı:

Axıtma bu qəbrin üstə göz yaşı,
Şöhrəti zamanla durar yanaşı,
Şair məzarına əyilən başı,
Göylərə ucaldır elimiz bizim.

Aşıq Məhəmməd Sadaxlı:

Göyü Günəşindi, kökü yerindi,
Ustad kəlamında hikmət dərindi,
Dünyanın nəyi var özgələrindi,
Sözdü gövhərimiz, ləlimiz bizim.

Aşıq Nurəddin Qasımlı:

Öyrədən, öyrənən təndi, yarıdı,
Gözə işıq verən qəlbin varıdı.
Ustad çiçəkdirsə, şəyird arıdı,
Ətri ondan çəkir dilimiz bizim.

Aşıq Sədi Ulaçlı:

Qəlbin sevincini döndərir yasa,
Dərd istər adamın başından basa,
Ulu dədələrdən mayalanmasa,
Sınar gərdənimiz, belimiz bizim.

Aşıq Əhəd Dəllər:

Yıxılan palıddı, kəsilən çinar,
Kim düşsə əslindən, soyundan kənar.

Nəsildən-nəsilə bağımız sınar,
Dil deyib ötməsə telimiz bizim.

Aşıq Oruc Quşçu:

İnsandan ötrüdü imtahan, sınaq,
Dünya ev yiyəsi, biz gedən qonaq.
Yansaq da yurd üçün alışaq, yanaq,
Torpağa qarışsın külümüz bizim.

Aşıq Sabir Saraçlı:

Haramdan uzaqdı halal mayamız,
Sönməz işığımız, sönməz ziyamız,
Allaha yetişsin xeyir-duamız,
Qoy bəmə enməsin zilimiz bizim.

Aşıq Murad Dəllər:

Sonbeşik şəyirdəm, rəvan təbim var,
Mənim də öz fikrim, öz mətləbim var,
Nəbilər içində Şair Nəbim var,
Kəsməz salamını əlimiz bizim.

Faxralı ağsaqqalları aşıqları buraxmadı. Şair Nəbi yaradıcılığını gözəl bilən, onu çox sevən Faxralının ağa-yana kişilərindən biri, "Ağa" dediyimiz Oruc Əliza-dənin evində məclis davam elədi. Aşıq Hüseyn Saraçlı aşıqlarla birlikdə "Qasımlı Səməd ağanın dastanı"nı danışdı. Bu da bir tarixi gün oldu. Bugünkü tədbir öz-özlüyündə cavanlar, gənclər üçün bir ibrət dərsiydi. "Əslini, nəslini, kökünü, zatını, yeddi arxa dönənini unutma, köklü-budaqlı, arxalı-dayaqlı olmaq istəyir-sənsə, kökə doğru get". Şair məzarını ziyarətin mənası, məqsədi, məramı buydu. Bununla Aşıq Hüseyn Saraçlı

öz şəyirdlərinə çox şey dedi, kim nə qədər götürdü, onu Allah bilir...

Nə ömür tükənə, nə yol tükənə,
Yeriyib gedəsən dağlara doğru.
Zaman əllərində yumağa dönə,
Keçəsən çağlardan çağlara doğru.

Aşılmaz sədləri bir-bir aşasan,
Bir gün qaynayasan, bir gün daşasan,
Getdikcə özünə yaxınlaşasan,
Yatasan köklərə, tağlara doğru.

Təzə cığır sala, iz tuta insan,
Yolu da yol kimi düz tuta insan,
Allaha, Tanrıya üz tuta insan,
Gedə dirilərə, sağlara doğru.

Borçalı aşıqları bu gedişlə kökə, yaddaşa, tarixə, dədələrə doğru yol gedirdilər...

* * *

Kim idi Aşıq Hüseyn Saraçlı?

O, mənim kövrək körpəliyimin, bığ yeri təzəcə tərləyən yeniyetməliyimin, havalı, dəli-dolu gəncliyimin, püxtələşən cavanlığımın aşığıydı. O, mənim yolumun yoldaşı, könlümün sirdaşı, dilimin duası, ruhumun qanadıydı. O, mənim 37-də sürgünə gedən babam Sərdəroğlu Qurbanın Kəpənəkçidən ayrılanda:

Əziziyəm, qalasız,
Şəhər olmaz qalasız.
Mən gedirəm sürgünə,
Siz sağlıqla qalasız,

– deyib çəkdiyi bayatıların aşığıydı. O, mənim ər itirən, oğul itirən, üç yetim qızla bir damın altında kimsəsiz qalıb, gözü yollara baxan Nabat nənəmin oxuduğu oxşamaların, dediyi bayatıların aşığıydı. O, məni ağladırdı. Çaldığı sazın telinnən, danışdığı dastanın dilinnən, "Ərzurumun gədiyinə varanda" dağların qarınnan, selinnən ağladırdı.

Bu, müqəddəs ağlamağıydı. Hönkürmürdüm, çırpınmırdım, əlimi dizimə çırpmırdım. Ocaqda yanan yaş odun kimi ağlayırdım, öz keçmişimi yada salıb korun-korun yanan, əvvəli nəhəng palıd olub, sonrası külə çevrilmək qorxusu ilə üzləşən bir ağac kimi ağlayırdım. Dünyanın hər üzünü görmüş, "göyə tulladım fındığı, vecimə deyil sındığı" deyən, gözlərinin qabağında oğlunu, qızını, gəlinini, ömür-gün yoldaşını itirsə də, qəddini əyməyən, arabir gözləri dolan 80 yaşlı Kəpənəkçi söz ustası Qara Uğurlu kimi ağlayırdım. Onun çaldığı sazın xalları-gülləri anamın laylaları ilə birlikdə ruhuma axmışdı. Ona görə mən ağladıqca durulurdum, saflaşırdım, gözəlləşirdim, nur parçasına dönürdüm, yüngülləşib mələklərin qanadındakı lələkdən də yüngül olurdum. Hərənin dərdi özünə bir dəvədi, kim nə bilir kim nə çəkir, kimin ürəyində nələr var. Mənim çəkdiyimi o bilirdi, onun çəkdiyini mən. O, məni gözümdən duyurdu, baxışlarımdan oxuyurdu:

"Sən də yardan yaralısan,
Duruşundan qanıram mən".

O oxumurdu ki... Puç olan arzuların, qırılan ümidlərin, bağlanan qapıların, talanan yurdların, tüstüsüz bacaların halına ağlayırdı: "Mansırı"yla, "Sultanı"yla, "Məmmədbağırı"yla, "Kərəmköçdü"ylə, "Sallama Kərəmi"ylə, "Zarıncı"yla.

**Haşiyə.** Günlərin bir günü dostlarımdan biri mənə xəbər göndərdi ki, axşam evdə ol, beş-on dost-tanış sizə

gələcəyik. O günü evdən çıxmadım. Söhbət 70-ci illərdən gedir. Onda mən Yasamalda 6 nəfərlə balaca bir “gecəqondu”da yaşayırdım.

Bəli, deyildiyi kimi, axşam dostlar gəldi. Gələnlərin içində tanımadığım 3-4 nəfər vardı. Bunları da tanış elədilər. Açığını deyim ki, bunların gəlişindən almadım. Çox pərt görünürdülər. Süfrə açıldı. Allah verəndən yedilər-içdilər, bir az kövrək söhbətdən sonra mənə ərki çatan dostlarımdan biri xahiş elədi ki, mümkünsə, o sazı götür, bir “Azaflı dübeyti” çal. Arzularını yerinə yetirdim. Çalğının şirin yerində dostlardan biri bu hava üstündə çox kövrək şəkildə, layla çala-çala oxumağa başladı. Bu havanı mənim yanımda kimlər oxumamışdı? Əmrah, Kamandar, Hüseyn Saraçlı, Əkbər, Mikayıl Azaflı, Aşıq Ədalət, Xanlar. Hər biri də öz naxışı, öz gözəlliyi, öz əlavəlЕriylə. Gördüm bu oxumaq onların heç birinə bənzəmir. Alışdım, yandım. Elə bil bədənimə qor doldurdular. Üçüncü bəndə keçməmiş sazın boğazından yapışıb havanı kəsdim. Dedim:

– Allah evini yıxsın, bu nə oxumaqdı, sən məni öldürdün ki!..

Oxuyan dillənmədi. Yanında dayanan dostumuz axır ki, məsələni açdı. Dedi: “Ay Zəlimxan, qırx gündən çoxdur dostumuzun anası ölüb. Gözünün yaşı kəsmir. Hərə bir yandan danladıq ki, bəsdi, yekə kişisən, ölən bircə sənin anandımı, kimin anası yanında durub? Cavabı bu oldu ki, məni bu gün Zəlimxanın sazına-sözünə yetirin, bəlkə, onda fikrim dağıla”. İndi mənə çatdı ki, yüz dəfələrlə eşitdiyim “Azaflı dübeyti” niyə bizi bu qədər yandırıb-yaxırmış. Demək, dostumuz oxumurmuş, özünü ağlayırmış. Böyük sənət də özünü ağlayan, içinə enən, əslinə, kökünə qayıdan sənətdi. Mənə belə gəlir ki, Aşıq Hüseyn Saraçlı oxumadı, ömrü boyu özünü ağladı. Buna görə yaşadı, uzunömürlü oldu. Bəli, həyat davam edir. Bu gün saz da çoxdu, sazbənd də, aşıq da çoxdu,

aşıqlar da. Ancaq dərin bir boşluq var ki, onu hamı görür və görməzliyə vurur, ya da dərindən bir ah çəkib köksünü ötürür. Bu boşluq Aşıq Hüseyn Saraçlının yoxluğudu. Onu yetirən mühitin yoxluğudu. Onu yetirən şəraitin, zamanın yoxluğudu. Yay vaxtı yaylağa qalxan arançıların, payız vaxtı dağdan enən ellərin, elatların, duru suyun, saf çeşmənin, təmiz havanın, onlardan aldığımız sağlam canın, qüvvətin, işığın, dolu ürəyin, havalı qəlbin, şaqraq zarafatın, mənəvi təmizliyin yoxluğudur. Görəsən, şəhərlərdə cismən təmizlənmək üçün həftədə bir dəfə hamama gedən insanlar həftədə bir dəfə yox, ayda bir dəfə içləri, ürəkləri, beyinləri, başları təmizləmək üçün nə iş görürlər? Mənəvi təmizlənmə üçün hansı ziyarətə, hansı qəbrin üstünə, hansı əzizinin yanına gedir insanlar?

Bu yoxu kim var eləyəcək, bu boşluğu kim dolduracaq? Bu gün qəlbimizdə, məclislərimizdə bir Aşıq Hüseyn Saraçlı yoxluğu var.

**Haşiyə.** Günlərin birində Borçalıya bir yas mərasiminə gedirdim. Ağstafada qatardan düşdüm, dostlardan birinə zəng elədim. Bir maşın göndərdilər. Maşın qəhətdiyi deyildi ki... Bilirdim ki, onlar elə bir sürücü göndərəcək ruhu mənim, qəlbi mənim olacaq. Belə də oldu. Ona görə də elə ilk görüşdən ürəyimə yatan şirin bir Qazaxlı balası olan sürücüdən xahiş elədim ki, maşının sürətini artır.

Dedi: – Artıra bilmərəm.

Dedim: – Niyə?

Dedi: – Ona görə ki, mənə etibar ediblər, mən maşında Azərbaycanın hörmətli bir şairini aparıram, məsuliyyətimi yaxşı başa düşürəm.

Söz məni yaman tutdu. Yola körpü salmaq istədim. Məlum oldu ki, bu sürücü mənim şeirlərimin vurğunudu. Ona görə də əlinə gözəl bir bəhanə keçmişdi, həm məni danışdırır, həm də özü ürəyi atdana-atdana şeirlərimi ox-

uyur, özünün şirin əlavələrini edirdi. Borçalıda Lejvəddinli kəndinin içindən keçəndə bir hündür ağacın yanında maşını saxladı və məndən icazə alıb bir hadisə danışdı:

– Möhtərəm Zəlimxan müəllim! Borçalıdan Qazağa hörmətli adamları aparmaq lazım gələndə adəti üzrə həmişə mənə müraciətlər olur. Mən də bu müraciətləri imkanım daxilində canla-başla yerinə yetirirəm. Bir dəfə də sizin kimi hörmətli bir qonağı Qazaxdan Borçalıya aparırdım. İndi maşını saxladığım yerdə maşınımın təkəri boşaldı. Maşından düşüb fışqırıq çala-çala, zümzümə eləyə-eləyə təkəri dəyişməyə başladım. Yolun qırağında, bax bu ağacın altında bir kişi çənəsini əsasına dirəyib sakitcə mənə qulaq asırdı. Mən maşını qaydaya saldım. Minib sürmək istəyəndə kişi əl elədi ki, a bala, bir dayan! Dayandım, yaxın gəlib birbaşa babamın adını çəkdi: "Ay oğul, sən Qaymaqlıda filankəsinmi nəvəsisən?" Heyrətimdən yerimdəcə donub qaldım. Boğazım qurumuşdu. Salamdan başqa bir kəlmə söz kəsməmişdik. Hardan tanıdı bu kişi mənim babamı ki, birbaşa onun adını çəkdi? Sual verməyə cəsarətim çatmadı ki, ay əmi, bu nə möcüzədi? Kişi təmkinlə dedi: "Oğul, mən sənin babanla otuz il çobanlıqda yoldaşlıq eləmişəm. Sənin qımqımaların, zümzümələrin eyniylə o kişidəydi. Mən səni o qımqımalardan tanıdım. Baban rəhmətlik gəlib duzdu gözlərimin qabağında".

Bəli, sağlam yaddaş təkcə sazda, sözdə, söhbətdə yox, fışqırıqda, zümzümədə də özünü göstərir. Əgər o, sağlam yaddaşdırsa, əslini, nəslini, kökünü, zatını qoruyacaq.

Aşıq Hüseynin şəxsində ulularımızı zaman-zaman yaşatmaq üçün nəvənin fışqırığından da babanın kim olduğunu tanıyan yaddaş sahibi olanlar lazımdı xalqa, millətə, elə, obaya!!!

Bu gün kökündən uzaqlaşanlarda, özünü unudanlarda, itən varlığına key-key baxanlarda, cızığından çıxanlarda ustad şilləsi, ağsaqqal öyüdü, danəndə hazırcavablığı çatışmır:

Yarpaq nədi?
Torpaq nədi?
Odun nədi?
Ocaq nədi?
Hardan bilsin,
Nədən bilsin kökünü unudan adam!?

Yurd hardadı?
Dərd hardadı?
Dərdi yenən
Mərd hardadı?
Hardan bilsin,
Nədən bilsin kökünü unudan adam!?

Ozan kimdi?
Yozan kimdi?
Yazan kimdi?
Pozan kimdi?
Hardan bilsin,
Nədən bilsin kökünü unudan adam!?

Oğuz nədi?
Qopuz nədi?
Toppuz nədi?
Dad-duz nədi?
Hardan bilsin,
Nədən bilsin kökünü unudan adam!?

Ölkə nədi?
Bölgə nədi?
Xaqan kimdi?
Bilgə nədi?
Hardan bilsin,
Nədən bilsin kökünü unudan adam!?

Nə deməkdi qarapapaq?
Nə deməkdi qarqalpaq?
Nə deməkdi qırğız, qıpçaq,
Nə deməkdi igid, qaçaq?
Hardan bilsin, nədən bilsin kökünü unudan adam!?

Geyə bilməz kürkümüzü,
Qoya bilməz örkümüzü.
Oxuyammaz türkümüzü,
Götürəmməz ərkimizi
Kökünü unudan adam!

Nə deməkdi Azərbaycan?
Nə deməkdi ürəklə can?
Nə deməkdi nəğmə, dastan?
Zalım nədi, aciz nədi?
Çəkisini nədən bilsin,
Yükünü unudan adam!?
Özünü itirən adam,
Kökünü unudan adam!!!

**Haşiyə.** Günlərin birində Aşıq Hüseyn Saraçlı çox hörmətli bir kişinin toy məclisini aparırmış. Söhbətin şirin yerində bir özündənrazı cavan, aşığa söz atır:

– Aşıq, o sözü düz oxumadın.

Ustad özünəməxsus təmkinlə deyir:

– Darıxma, oğul, sözün arxasını sənin xətrin üçün düz oxuyaram.

Elə oradaca havanı dəyişib, "Baş divani" üstündə oğlana belə cavab verir:

Mən deyirəm bu məclisdə könül şad olmaq üçün,
Nahaq yerdən hiylə qurub, hay salan əyləşməsin.
Hər sözə yüz məna verən ariflərin yerində
Şər danışıb toy evinə vay salan əyləşməsin.

Hara getsə üz ağardan gəlsin başda otursun,
Gözüm üstə yeri vardı, çıxsın qaşda otursun,
Bədəsilə yer vermərəm, quru daşda otursun,
Qəm yükündən ortalığa tay salan əyləşməsin.

Elim doğma Borçalıdı, Hüseyndi adım mənim,
Doğru sözdü, sədaqətdi qolum-qanadım mənim,
Mehriban atalar olsun fəxri ustadım mənim,
Haramlıqla halal əldən pay salan əyləşməsin.

Doğrudan da, elin kəmərbəstə oğulları aşığın qəlbinə toxunduğu üçün həmin cavanı məclisdən uzaqlaşdırırlar. Bəli, bu gün Aşıq Hüseyn Saraçlı boşluğu var. Aşıq Əmrah, Kamandar, Xındı Məmməd, Şəmşir, Mikayıl Azaflı, İmran, Əkbər, Dərya Məhəmməd, Avdı, Şakir, Pənah boşluğu kimi. Adını çəkdiyimiz hər aşıq əslində bir dastandı. "Dədə Qorqud", "Koroğlu" dastanları kimi. Bu aşıqların varlığı bizim məcnunluğumuz, kərəmliyimiz, qəribliyimiz, şah ismayıllığımız, ərəbzəngiliyimiz, fərhadlığımız deyilmi? Yazan, yaradan, yaşadan oğullar gərək. "Oğuznamə"ləri, "Manas"ları, "Alpamış"ları yaradan xalq bu boyda itkiyə necə dözə bilər?

Min illərin formalaşan sərvətini itirə-itirə, unuda-unuda, quruda-quruda gedirik. Hara gedirik? Boşluğa, mənasızlığa, hay-küyə, yalançı parıltıya, bütün insani dəyərləri öldürən bir cəhənnəmə, manqurtluğa, özgələşməyə, kökümüzü danmağa, dədələrimizin goruna od vurmağa gedirik. Unutduq ki, dünyanın ən məşhur aktyoru belə yüz rola girib, hər rolun, hər obrazın öz paltarını geyinsə də, teatrdan çıxıb evinə gedəndə öz paltarını geyinir, öz yerişini yeriyir. Xalqın yaratdığı, yaşatdığı sənət də aktyorun öz doğma evinə gedəndə geyindiyi paltar, yeridiyi yeriş kimidir.

Biz hara gedirik, dəmirləşməyə, robotlaşmağa, müqəvvalaşmağa?! Bizi bu yoldan nə qurtara bilər? Əxlaqi dəyərlərə, mənəvi sərvətlərə söykənməyimiz!

Adət-ənənələrimizə, mətbəximizə, xörəklərimizin adına, xalçalarımıza, mahnılarımıza, saz havalarımıza, musiqi alətlərimizə, oyun havalarımıza qarşı başlanan səlib yürüşlərinin qarşısını ancaq milli şüurun, milli təfəkkürün, mənəvi səfərbərliyin hesabına ala bilərik. Aşıq Hüseyn Saraçlı bu işi təkbaşına görürdü. Böyük xəzinəsi, böyük sənətkarlığı, böyük şəxsiyyətiylə. "Divani"ylə nadanlara divan tuturdu, "Qaytarma"sıyla haqqın yolundan çıxanları düz yola qaytarırdı, "Zarıncı"sı ilə ölənlərimizi, itənlərimizi yada salırdı, "Misri"siylə ən cəsarətsiz adamı da qeyrətə gətirirdi, "Qürbəti"siylə qəriblərimizi Vətənə döndərirdi, "Sultanı"sıyla, sultan kişiləri bugünkü cavanlarımıza tanıdırdı. Cismani və mənəvi sağlamlığımızı özümüzə qaytarırdı. Bu gün dırnaqarası "müasirləşmə"yin bəd nəfəsi üzümüzə şillə kimi çırpılır. Bu bəd nəfəs, özgələri yamsılama bizi sıxır, əridir, çürüdür, içəridən oyub aparır, məhvə doğru sürükləyir. Ustalaşmaqdan saxtalaşmaya doğru gedirik. Özü saxta, ruhu taxta, qəlbi şaxta bir cındırlığın, cılızlaşmanın əsirinə çevrilirik. İtmək, ərimək, yox olmaq, qeybə çəkilmək zamanımız gəlir deyəsən.

Ulu babalarımızın əmdiyi süd tərtəmiz idi. Ona görə də o kişilər "Anamın südü haqqı!" deyib and içəndə adam ölərdi, ancaq o andı pozmaq olmazdı. Çünki o anaların südü təbiətin bakirə vaxtından mayalanmışdı. Ulularımızın əmdiyi süd, babalarımızın əmdiyi süd, atalarımızın əmdiyi süd, bizim əmdiyimiz süd bakirəliyini, saflığını, dadını-tamını itirə-itirə ildırım sürətiylə nəvələrə doğru gedir. Nəvələrin ana südünə çox da ehtiyacı olmayacaq. Apteklərin, dükanların canı sağ olsun, o qədər təzə "ana südü" çıxıb ki. "Təzə gəldi bazardan, köhnə düşdü nəzərdən". Göylərin palçığı, yağışı, yerin zəhəri, bitkilərin dərmanı dükandan alınan "ana südü"-nün içərisində qəlbimizə, ruhumuza, yaddaşımıza, kişiliyimizə gəlir. Həmin "süd"dən mayalanan adamlar

Allahın varlığına, Peyğəmbərinə, Quranına, anaların südünə and içsə də, heç bir nəticəsi olmur, çünki o süd saxta süddür. Süd o süd deyil, maya o maya deyil, xəmir o xəmir deyil, təndir o təndir, çörək o çörək deyil. İnsan o insan deyil. Bax budur faciəmiz! Bütün bu səbəblərə görə də nə sazımız o sazdı, nə də sözümüz o sözdü.

Allahın yazdığı alın yazısına da, Tanrının qismətinə də, bizi qanadında uçuran yuxulara da, İlahinin vergisinə də, qan yaddaşına da, yeddi arxa dönəndən birində özünü bildirən qüdrətə də inanmışam, inanıram, qəbir evinə köçəndə də bu inamla dünyadan köçəcəyəm.

Qulağa səs gəlir, qəlbə səs düşür,
Sızan duyğuları sızdıran nədi?
Vaxtın şaxtasında, baxtın qarında
Üşüyən ömrümü qızdıran nədi?

Ağlı uçrum çəkir, dağ-dərə çəkir,
Qəlbi məşəqqətlər məhşərə çəkir,
Biz xeyrə çəkirik, o şərə çəkir,
Şeytanı yolundan azdıran nədi?

Göy kimi gurulda, şimşək kimi çax,
Qəlbi haqq yolunda hey yaxdıqca yax,
Daş üstə qazılan yazılara bax,
Qazan əlimizdi, qazdıran nədi?

Min ildi damardan axan qandı bu,
Eşqin atəşində yanan candı bu,
Nə sazdı, nə sözdü, nə dastandı bu?
Mənə bu dastanı yazdıran nədi?

Mənə bu dastanı yazdıran nədi? Mənim inamım, mənim sevgim, mənim eşqim!

İnanıram, “Biz dünyadan gedər olduq, qalanlara salam olsun” deyən Yunusa da, “Fərman padşahındı, dağ-

lar bizimdi" deyən Dadaloğluna da, "Heç yerdə görmədim düz bənövşəni" deyən Qurbaniyə də, "Fələklər yandı ahimdən" deyən Füzuliyə də, "Gövhəri-laməkan mənəm" deyən Nəsimiyə də, "Görmədim" deyən Vaqifə də, "Mən gedərəmsə, məramım yenə dünyada durar" deyən Sabirə də, "Sındı qol-qanadım, yanıma düşdü" deyən Ələsgərə də, "Göz yaşımdan başqa yoxdu dürri-şəhvarım" deyən Şəhriyara da, "Biz gəldi-gedərik, sən yaşa, dünya!" deyən Səməd Vurğuna da, "Günah onun özündədir" deyən Sarıvəlliyə də, "Dünya mənim, dünya sənin, dünya heç kimin" deyən Məmməd Araza da, "Dünya fikir dünyasıdır" deyən Hüseyn Arifə də!

İnanıram!!!

İnanmışam!!!

İnanacağam!!!

Yuxulara inanıram. Mənə nə gəlibsə, yuxularımda gəlib. Bu dastanın yazılması kimi. Adını çəkdiyim insanların heç biri bu gün sağ deyil. Dinmir, danışmır, nəfəs almır. Ancaq onların ruhu, sözü, adı, yaratdıqları hər birimizin gündəlik həyatında yaşayır.

Elə ki qəlbimə şeytan girir, şübhə toxumları o saat işini görür, içimi didir-parçalayır, poladım sınır, arzularım sönür, ümidim-həvəsim ölür. Mənim üçün həyat bütün çalarları ilə bir yerdə əhəmiyyətini itirir. Peşmançılıq hissi keçirib, elə bil ölümqabağı son şeirimi öz-özümə sakitcə pıçıldayıram:

Bir çiçək vermişdi Yaradan mənə,
Nə qoxlaya bildim, nə dərə bildim.
Sevgi xalısını, yar çələngini
Nə toxuya bildim, nə hörə bildim.

Nadan nə qandırdı, şeytan nə qandı,
Atdı mən tərəfə daşı, sapandı,
Qulağım tutuldu, gözüm qapandı,
Nə eşidə bildim, nə görə bildim.

Bir söz pıçıldadı hər saat mənə,
Sirdi, müəmmadı bu həyat mənə,
Bağlı bir süfrədi kainat mənə,
Nə açmaq bacardım, nə sərə bildim.

Şeytan görür ki, mən tamam dünyadan əlimi üzmüşəm, ölüm ayağındayam, istədiyinə nail olur, vəziyyətimə sevinir. Əlüstü məni daha da ruhdan salmaq üçün şair cildinə girir, başlayır mənim dediyim rədif üstündə bir qoşma oxumağa. Guya, bunun vəziyyəti mənimkindən də betərdi:

Mən də sən gündəyəm, ey insan oğlu,
Nə yoğura bildim, nə yapa bildim.
Namərdin gülləsi deşdi sinəmi,
Nə yayına bildim, nə sapa bildim.

Yoxuşu görəndə dizlərim əsdi,
Dedilər özünü çox üzmə, bəsdi,
Quşqonmaz qayalar önümü kəsdi,
Nə dağıda bildim, nə çapa bildim.

İşim bir inada, dözümə qaldı,
Yollara boylanmaq gözümə qaldı,
Çəkdiyim zəhmətlər özümə qaldı,
Haqqı nə tanıya, nə tapa bildim.

Şeytanla çənə vurub, ağız-ağıza verdiyimi Allah bilir, Allah görür, mən bədbəxt nə bilim ki, qarşımda şeiri məndən də gözəl oxuyan şeytandı. Allahı çağırıb, ondan kömək istəyirəm. Birdən qulağıma bir səs gəlir. Bu, artıq bayaqkı səs deyil. O səsdə bir quruluq, cansıxıcılıq vardı, bu səsdə ilahi bir incəlik, zəriflik, ruhani bir gözəllik var. Səs mənə deyir:

İnamın yoxdursa, Haqqı çağırma,
Çağırsan, dadına o Xuda gəlməz.
Gəlsə də ağlada-ağlada gələr,
Ruhunu oxuda-oxuda gəlməz.

Sən ki həqiqətə baxdın uzaqdan,
Qaçdın imtahandan, qaçdın sınaqdan,
Əlini Allaha açma nahaqdan,
Həyatda gəlməyən yuxuda gəlməz.

Birdən-birə yerimdən dik atılıram. Yer üzünün bütün şeytanlarına meydan oxuyub, şeytana qalib gəlirəm. Elə ki, qəlbim Allahın nuruyla dolur, Allah da, Peyğəmbər də, imam da, inam da, saz da, söz də, musiqi də, həyat eşqi də mənim olur. Elə bil birdən-birə bütün çayların gücü qollarıma yığılır, göydə nə ki ulduz var, hamısı gözlərimə köçür, yer üzündə nə ki nəğmə var, hamısı qəlbimə axır. Sevindiyimdən qışqırıram:

– İnamım – Allahım! Allahım – İnamım! Mən sizə güvənirəm, inanıram, arxalanıram. Əllərimi göylərə qaldırıb ürəklə şeir oxuyuram. Elə bilirəm dağlar səngərim, qayalar kürsüm, şimşəklər yumruğumdu. İnam haqda inamla şeir oxuyuram:

Ürəyin sazdısa, sazı gözləmə,
Telsiz, təzənəsiz dil açmaq olar.
Qəlbində yaz varsa, yazı gözləmə,
Qışın ortasında gül açmaq olar.

Ona arxalandın, ər oğlu ərsən,
Əllərin sevinər barını dərsən,
Nə qədər torpağı yaxşı becərsən,
O qədər süfrəni bol açmaq olar.

Anlasan dilini odun-ocağın,
Duysan nəfəsini doğma torpağın,

Elə genişlənər qoynun, qucağın,
Gəl deyib dağlara qol açmaq olar.

Arxalandığım, sevdiyim, məni yaradan, mənim yaşatdıqlarım kim varsa, nə varsa, hamısına şeir oxuyuram. Var səsimlə dəli kimi qışqırmaq istəyirəm. Ey əlimə-ayağıma dolaşanlar, duru suyumu bulandıranlar, yatanda yuxuma gəlməyənləri ayağıma yazanlar! Eşidin, ayılın, bilin, agah olun, mən Allahın dostuyam. Mənim işim bəndəlik deyil, Allahlıqdı! Mən Tanrının əziziyəm! Mən qəlbində Allah nuru, haqq işığı, el sevgisi, xalq məhəbbəti, torpaq yanğısı, Vətən eşqi olan bütün insanları sevirəəəm!!! Mən sizə arxalanıraaamm!!! Üzümü Allahı və insanları sevənlərə tutub şeir oxuyuram:

Qulaq asın Haqdan gələn səslərə,
Qulaq olun, ey Allahı sevənlər!
Qucaq açın Allah deyən kəslərə,
Qucaq olun, ey Allahı sevənlər!

Allah olsun dilinizin duası,
Allah olsun gözünüzün şüası,
Allah olsun qəlbinizin mayası,
Çıraq olun, ey Allahı sevənlər!

Gözəlliyin taxtı-tacı qurulsun,
Vurulanlar dönsün bir də vurulsun,
Sizə baxsın, bulananlar durulsun,
Bulaq olun, ey Allahı sevənlər!

Çeşmə duru, dəniz duru, qum duru,
Gül üstə şeh göz yaşından dumduru,
Hikkənizi içinizdə dondurun,
Uzaq olun, ey Allahı sevənlər!

Dinsizlərin insafından, dinindən,
Nifrətindən, qəzəbindən, kinindən,
İblisindən, şeytanından, cinindən
Uzaq olun, ey Allahı sevənlər!

Göyə baxın, dan ulduzu doğanda,
İşıqlanın, nur zülməti boğanda,
Haqqın nuru yağış kimi yağanda,
Torpaq olun, ey Allahı sevənlər!

Ayaz dəymiş yanaqları qızdırın,
Şaxta vurmuş barmaqları qızdırın,
Buza dönmüş otaqları qızdırın,
Ocaq olun, ey Allahı sevənlər!

Yükünüzü, çəkinizi tanıyın,
Allah adlı təkinizi tanıyın,
Gövdənizi, kökünüzü tanıyın,
Budaq olun, ey Allahı sevənlər!

Könül dostum bir Günəşdi, bir Aydı,
Qəlbimdəki Haqdan gələn haraydı,
Zəlimxanın ürəyi bir saraydı,
Qonaq olun, ey Allahı sevənlər!

Allah və onun yaratdığı Allaha yaxın insanları sevdim. Bax bu inam, bu sevgi məni bu dastanın üstünə gətirib çıxardı. Taleyin işinə baxın ki, adına dastan bağladığım Aşıq Hüseyn Saraçlını ilk dəfə bizim kənddə, Bolus-Kəpənəkçidə, öz ocağımız Yafıllıda (Yaqublu tayfasında) Misir babamın oğlu Məhər əmimin toyunda görmüşəm. Özü də necə görmüşəm... Aradan nə az, nə çox – düz qırx il keçməsinə baxmayaraq tam dəqiq şəkli, mənzərəsiylə gözümün qabağındadı. Toy evinin ikinci

mərtəbəsində, böyük zalda qarapapaq kişilər, ağsaqqallar, cavanlar əyləşib, huş-guşla aşığa qulaq asırlar.

Məclisin başında adı sağlığında əfsanələşən, 20 il Sibir sürgünündə olmuş, 105 yaşında dünyadan köçmüş, elimizin hamı tərəfindən birmənalı şəkildə məşhur el ağsaqqalı kimi qəbul elədiyi Yaqub oğlu Alı kişi əyləşib. Altında balınc, xan duruşlu, bəy oturuşlu bir kişi. Nur içində imən dümağ saqqalı ona baxanların qəlbinə işıq salır. Elə bil ki, o, bu əsrin, bu zamanın adamı deyil. Dədə Qorqud, Koroğlu dövrünün ağsaqqalıdı. Bütün zamanların bərəkəti kimi məclisdə əyləşib, aşığa qulaq asır, toya xeyir-dua verir.

Onun yanında bizim nəslin ən hörmətli ağsaqqalı, İkinci Cahan savaşında, aclıq-kasıblıq illərində Aşıq Hüseyn Saraçlıya çox böyük qayğı göstərən, onun sənətkar kimi yetişməsində heç bir köməyini əsirgəməyən İncoğlu İsmayıl əyləşib. Hər ikisi bir-birinə və bütün məclisə yaraşıq verir.

“Alı kişi məclisdədi, Aşıq Hüseyn Saraçlı da məclis aparır” – kənarda olanlar, bu məclisin sorağını eşidənlər üçün bu bir cümlə kifayət idi ki, bu məclisin çəkisinə, sanbalına bələd olsunlar.

Alı kişi ilə Aşıq Hüseyn Saraçlının arasında olan qısaca söhbət bugünkü gün kimi yadımdadı. Aşıq məclisi açıb bir ustadnamə deyib, “Baş divani” oxuyandan sonra Alı kişinin yanında dayanıb, hörmətlə ona təzim edib dedi:

– Alı əmi, ürəyiniz nə istəyir, hansı sözü, hansı dastanı istəyirsiniz?

Alı kişi əllərini dümağ qar kimi saqqalına çəkib: “Aslan şah və İbrahim”i başla”, – dedi.

Aşıq “baş üstə” deyib söhbəti başladı. Aslan şahın qəbiristana gəlməsi və qəbiristandan qardaşı İbrahimi soruşması məqamına gələndə Alı babam, “Aşıq, burasını “Mansırı” havasına oxu”, – dedi. Aşıq sazı həmin kökə gətirib oxumağa başladı:

Alçaqdan ucaya çəkilsin başın,
Məzarstanlıq, İbrahimi neylədin?
Atılsın kərpicin, qalmasın daşın,
Məzarstanlıq, İbrahimi neylədin?

Qalalar içində möhkəm qalasan,
İgidlər başına yaman balasan,
Qarğıyıram səni, viran qalasan,
Məzarstanlıq, İbrahimi neylədin?

Aslan şaham, zülm evində yatmışdım,
Dərd selində, qəm gölündə batmışdım,
İbrahimi burda qoyub getmişdim,
Məzarstanlıq, İbrahimi neylədin?

Onda mənim on iki yaşım vardı. O sözlər, o səslər hələ də qulağımda, o dastan səhnəsi gözlərimin önündədir. Elə bil bunların hamısı dünən olub. O günləri yadıma salıb dastanda deyildiyi kimi fikirləşirəm. Ey qoca dünya, mən gördüyüm kişiləri neylədin? Kəpənəkçinin qarapapaq kişiləri niyə belə seyrəldi? Alxas ağanı, İsrafil ağanı, Emin ağanı, Sərdaroğlu Məmmədi, Əfəndioğlu Mustafanı, Molla İsanı, Yaqub oğlu Alını neylədin? Kərim ağanı, Sarıoğlu Məhəmmədi, Asdanoğlu

Məhəmmədi, Molla oğlu Osmanı, Tat Qasımı, Göyüşoğlu Mahmudu, Qara Uğurlunu, Sərdərlinin Mikayılını, Güləhməddinin Hacımuradını, Hacallının Rəşidini, Omaroğlu Abbası, Bəkirlinin Kərəmini, Rəşid Vəlioğlunu, Xallı İsmayılı neylədin?

Əgər yüz ildə bir kəndin bu qədər igidi, əri, başbiləni, ağsaqqalı dünyadan gedibsə, gör indi eldən-mahaldan, xalqdan, millətdən nələr gedib. Hər gedənlə bir tarix gedib, hər ölənlə bir yaddaş ölüb. “Aşıq, bu sözü “Mansırı”ya oxu” deyəndə Alı babamın yüz üç yaşı vardı. Yəqin o da öz ömründə ölənləri-itənləri,

köçənləri, dağılanları gözünün qabağına gətirirmiş. Alı kişi heç vaxt sözü elə-belə deməzdi. Onun hər sözü bir batman olub.

Ömür-gün keçirib şanla-şərəflə,
Sözündə qılıncın kəsəri varmış.
Öldürən tərəfi ölən tərəflə
Yara köhnəlməmiş barışdırarmış.

Ağsaqqallıq ağır işdi, çətin peşədi,
Çoxu girişər, azı bacarar bu işi.
Ağsaqqal, hara gedirsən?
Qan yatırmağa!
Ay gəda, hara gedirsən?
Qan salmağa!
Ay sevgi, hara gedirsən?
Dost axtarmağa!
Ay nifrət, hara gedirsən?
Düşmən qazanmağa!
Ay usta, hara gedirsən?
Ev tikməyə, körpü salmağa!
Ay çuğul, hara gedirsən?
Ev yıxmağa, ara vurmağa!
Ay dərd, hara gedirsən?
Dərd verməyə!
Ay sevinc, hara gedirsən?
Könül sevindirməyə!

Bu qoca dünya qan salanla qan yatırdanın, dost axtaranla düşmən qazananın, ev tikənlə ev yıxanın mübarizə, döyüş, savaş meydanıdı. Gərək haqqı nahaqqa verib, tərəzinin gözünü əyməyəsən! Tərəzi düz işlədisə, haqq yerini tapdısa, dünya onda gözəlləşir, insan onda xoşbəxt olur, Tanrı onda öz bəndələrinin səsini eşidir. Mənə belə gəlir ki, 105 il ömür sürən, əsl ağsaqqal ömrü

yaşayan Yaqub oğlu Alı kişinin səsini Allah həmişə eşidib. Allah eşidəni bəndələr eşitməyə bilərmi?

Aşıq Hüseyn Saraçlının dırnağının ucunda kəklik kimi səkən, qamçı kimi nazilən, qatlanıb-açılan çağları idi. "İnanmıram səni analar doğa, ərşdəki qılmansan, a Sarvan qızı" sözlərini "Cəlili" havasına elə bir qaqqıltıyla oxuyurdu ki, deyirdin, İlahi, dünyanın bütün bülbülləri bu məclisdə cəh-cəh vurur. Deməк, bu dastanın toxumunu Tanrı ilk dəfə orda qəlbimə səpib. Qara şuma, münbit torpağa sağlam toxum düşən kimi, mənim körpə qəlbimə bu dastanın toxumu düşüb. O məclisdən sonra ustada başımın tükü sanı qulaq asmışam. Ancaq ilk dəfə öz ocağımızda eşitdiyim o səs hələ də qulaqlarımdan getmir. Mənim qulaqlarımda sehri, cazibəsi, zənguləsi itməyən, unudulmayan o səsin indi qırx yaşı var.

Sonralar onu Kəpənəkçidə tez-tez görürdüm. Böyük məclislərdə və şəxsi dəvətlərdə, qonaq çağırılanda elimizin say-seçmə ağsaqqallarıyla oturub-durub Aşıq Hüseyn Saraçlı. Kəndimizin adlı-sanlı adamlarından biri olan Öməroğlu Abbasla kirvəydilər. Yaxşı, qızğın kirvəlik işlədirdilər. Hər dəfə gələndə yaxın dostu kimi düşəcək yeri Abbas kişinin evi olardı. O da aşığın adına layiq məclislər düzəldər, elin-obanın adına yaraşan kişiləri evinə dəvət edərdi. O məclislərdən birinin canlı şahidi və iştirakçısı olmuşam. Məclisdə kimlər vardı: Başkeçiddən Mansırov Asdan, Aşağı Saraldan Qocayev Əli, kəndimizdən Mollaoğlu Osman, Kərim ağa, Güləhməddinin Hacımuradı, Hacallının Rəşidi, Göyüşdüllünün Novruzu, Mollöynün Bayramı, Bəkirrinin Kərəmi, Zərgəroğlu Ziyəddin, Sərdəroğlu Mikayıl, Yafıllı Xallı İsmayıl, Haallının Ağakişisi,.. atam Usuf müəllim. Ömrüm boyu gördüyüm məclislərin ən şirini, ən gözəli, ən xudmanisi, bəlkə də, o məclis idi.

Bir də görmək qismətimiz olacaqmı, bilmirəm,
Səhərəcən aşıb-daşan, sellənən məclisləri.

Qoşmaların sığalında durulaşan, saflaşan,
Ədəb-ərkan havasına dillənən məclisləri.

Yenə şirin söhbətimiz dağ ola, aran ola,
Eşqin hökmü külüng çala, dağları yaran ola,
Qarapapaq kişiləri geri qaytaran ola,
Bir-bir öpəm, qucaqlayam bəllənən məclisləri.

Gümüş tellər səsə düşə, tərpənəndə təzyana,
Bu səslərin alovunda oğlan yana, qız yana,
Sinə coşa, boğaz qıza, səs yumşala, saz yana,
El köçürə yaddaşlara tellənən məclisləri.

Sevgi hopa yağış kimi sevənlərin canına,
Düymələrin açılmağı çəkə xoruz banına,
Alqışımız gedib çıxa Yaradanın yanına,
Tanrı öpə göyə doğru zillənən məclisləri.

Heyif sənə ötən günlər, nə dağ qaldı, nə aran,
Nə Fərhad var, nə külüng var, nə dağ var, nə dağ yaran,
O kişilər qayıtmasa, kimdi geri qaytaran
Gül dodaqdan gülüş alıb güllənən məclisləri.

Kərim ağaynan Aşıq Hüseynin arasında ərkyana zarafatları olar, bir-birinə atmacalar atardılar. Məclisin lap şirin vaxtı Kərim ağa aşığa dedi:

– Ay Söyün kişi, sən Qurvan kişinin goru, düzünü de, mənim nəvəmdən ağlın nə kəsir?

“Mənim nəvəm” deyəndə o məni nəzərdə tuturdu. Çünki mənim ana nənəm Nabat xanım Hacallı Məhəmməd ağanın qızıdı. Rəşid ağa Hacallının bacısıdı. Aşıq Hüseyn Kərim ağanın sualına elə cavab verdi ki, hamı gülüşdü.

Aşıq dedi: “Mənim kimi özgənin dəyirmanında üyütmür ki, unu da özünnəndi, dəni də”. Kərim ağa özünəməxsus bir ərklə gülə-gülə: “A kişi, sual verdim cavab ver, un nədi, dən nədi, nə danışırsan?”

Aşıq dedi: “Ay Kərim ağa, demək istəyirəm ki, həm şairdi, həm aşıqdı. Özündən deyir, öz sözünü ürəyi istədiyi havaya da oxuyur”. Camaat bir də gülüşdü.

Bir gün Aşıq Hüseyn yenə bizim kənddə ağır və ləngərli bir toy məclisi aparırdı. Kənd çox böyük olduğundan bu kəndin məclisləri də çox sanballı, çəkili olardı. Aşıq sazı köynəyindən çıxarır, başlayır naznan, ağır-ağır kökləməyə. Nəsə inaddaşır, saz kök almır. Saz xəstələrinin səbri tükənir. Özləri dillənə bilmir, kəndin ən zarafatcıl adamlarından olan Cır Hajıya göz vururlar ki, bu bizi qırdı qurtardı, gör neyliyirsən. Cır Hajı deyir: “Ay Aşıq Hüseyn Saraçlı, ayə, a qıvlasız, bilmirdinmi səni toya çağırajaxlar, bu andır sazına öydə bir qurd ağzı vurdurammırdınmı?” Aşıq cavabında: “Sən ağıldadı, qulağını burmasam dillənmir”, – deyir.

Məclisə gülüşmə düşür. Aşıq sazı nizam kökləyir, Koroğlu kimi girir meydana. Ləngiməyinin əvəzini birəbeş çıxır...

Ömrünün 70 ilini arxada qoyub, təzəcə yetmiş birə keçən Aşıq Hüseyn Saraçlı qəfildən xəstələnib yorğandöşəyə düşmüşdü. Bu xəbər məni çaşdırmışdı. Heç vaxt ondan sağlamlığı haqqında şikayət eşitməmişdim. Birdən-birə bu nə xəbər idi? Aşığın vəziyyəti haqqında uçan quşdan, əsən yeldən tez-tez soraq tutur, doğmalarından xəbər alırdım. Ürəkaçan bir xəbər eşitmirdim. Onun ölüm xəbəri başımın üstünü gözlənilmədən aldı. Elə bil birdən-birə sular axarını, qartallar uçuşunu dayandırmışdı. Təbiət lal olub, səsini içinə çəkmişdi.

Ustadlar ustadı, ozanlar ozanı, gözəllər sirdaşı, məclislər bəzəyi, səfərlər vurğunu, yollar aşiqi, haqq aşığı haqqa qovuşmuşdu. Şahsənəm xanımı tək qoymuşdu.

Aladı qaşın, ördək,
Yaşıldı başın, ördək.
Həmişə cüt gəzərdin,
Hanı yoldaşın, ördək?

Qəm yükü ağır olanda bütün canlıların yerişində bir ləngli, ağırlıq yaranır. Ancaq cansız qatarın ləngidiyini də gördüm. Elə bil məni Bakıdan Tiflisə aparan qatar da bu xəbəri duymuşdu. Şütüyə-şütüyə gedəsi olan qatar sürünə-sürünə gedir, qumlu səhralarda yorğun dəvə karvanı kimi gedən bu dəmir varlıq məni xeyli gecikdirmişdi. O yerdə qəbiristanlığa yetişdim ki, Allah kəlamı oxunur. Saraçlı qəbiristanlığında otun-suyun sanı varıydı, adamın yox. Mən hələ qapağı örtülməmiş tabuta sarı əyilib son dəfə aşığın alnından və hələ tam ağarmamış gümüşü saçlarından öpdüm. Elə bil yuxuya getmişdi. Lal bir sükut içində qulağıma ustaddan dönədönə eşitdiyim "Mixəyi" havası üstündə oxuduğu qoşmanın sədaları dəydi:

Dünyada gün görüb, ömür sürməyi,
Hər ürək istəyir, hər can istəyir.
Kimi öz meylini yara bağlayır,
Kimi qızıl gəzir, mərcan istəyir.

Küçədə bir tabut keçsə yanımdan,
Bıçaq vur, damla da çıxmaz qanımdan,
Min dəfə şirindi canı canımdan,
Mən həyat deyirəm, yer can istəyir.

Axtarsa həyatda kim tapacaq, kim?
Yollar ayrıcında bilinməz yerim,
Ey könül, canımı mən kimə verim,
Əzrayıl can alır, yar can istəyir?

Bu dəfə təbiət yardan güclü çıxmışdı. Ulduzu göydən, çiçəyi çəməndən, yarpağı budaqdan, dili dodaqdan ayrı salmışdı. Oğullar evləndirən, qızlar köçürən, gəlinlər gətirən, küsülülər barışdıran, toylar-yaslar yola salan bir kişini son mənzilə yola salmaq üçün ellər-obalar yerimişdi:

Mən aşıq, el yeridi,
El yurdu, el yeridi.
Mərdin karvanı köçdü,
Ardınca el yeridi.

Bu dastanın yazılmasından iyirmi il əvvəl – 1987-ci ilin yazında aşıq dünyadan köçmüşdü. O zaman mən aşığı bu sətirlərlə laylaya tutmuşdum:

İstər alış, istər tutuş, istər yan,
Torpaq altda cahan canlar apardı.
Çox oğullar köç eylədi dünyadan,
Sinəsində çox dastanlar apardı.

Köç günüdü, ay obalar, ay ellər,
Çox sevdiyi bir havanı çaldırın.
Qoy boşalsın dolu gözlər, könüllər,
Onu yerdən "Mansırı"yla qaldırın.

Xəbər verin səs yetişsin hər yana,
Bizi Ləlvər, Lök, Ağlağan dinləsin.
Saraçlını tapşırırıq torpağa,
Qoca dağlar qəmli dastan dinləsin.

Saraçlını tapşırırıq torpağa,
Dərə, ağla, təpə, ağla, düz, ağla.
Qaynar bulaq, dostun köçür dünyadan,
Göz yaşını daşdan-daşa süz, ağla.

Ozan baba, dünya qalan, sən gedən,
Ayrılırıq "Ruhani"dən, "Cəngi"dən,
Yası görüb öz toyunu ləngidən,
Gəlin, ağla, oğul, ağla, qız, ağla.

Bəd xəbərlər biz-biz edər tükümü,
Dağ götürməz dağdan ağır yükümü,

Əcəl yaman baltaladı kökümü,
Könül, ağla, ürək, ağla, göz, ağla.

Teldən ayrı təzənələr nəm çəkər,
Duyan ürək dərd daşıyar, qəm çəkər,
Səndən ötrü min cür nazı kim çəkər?
Pərdə, ağla, sədəf, ağla, saz ağla.

Yüz dəfə çək, yersiz ahdan nə çıxar,
Qəlbi yasda saxlamaqdan nə çıxar,
Ay Zəlimxan, ağlamaqdan nə çıxar?
Az sızılda, az inildə, az ağla,
Saraçlının taleyindən əsər yaz,
Saraçlının dastanını yaz, ağla!

Məzarının başında "Saraçlının dastanını yaz, ağla" demişdim. 20 ildən sonra Allahın yardımı, İlahinin diktəsiylə bu arzum həyata keçdi. Ancaq bilirəm ki, demədiklərim dediklərimdən daha çoxdu. Bu dastan mənimlə ömrümün sonuna qədər yol gedəcək.

Ustadı torpağa tapşırdıq. Böyük bir şairin şahanə misraları yenə qulaqlarımda səsləndi. "Mənim sadiq yarım qara torpaqdı". Sadiq yar öz sevgilisini qoynuna aldı. Əbədi yaşatmaq, torpaq qədər uzunömürlü eləmək üçün. Qəbiristandan ayrıldıq. Arxamızca qəbiristanlıq daşları boylanırdı...

Hara baxsam daşdı, daş,
qəbristanlıq daşları,
Gedənlər bu daş kimi
laxladılar, getdilər.
Ölənlər öldü getdi,
qurtardı öz canını,
Dərdi, qəmi bizlərə
saxladılar, getdilər.

Gülüşdən gülüstanı,
göz yaşından dəryası,
Gördülər, yaşadılar
hər bayramı, hər yası.
Hər insan övladının
bir toyu var, bir yaşı,
Sevindilər, güldülər,
ağladılar, getdilər.

Ölüm varsa nə fərqi,
kim nədən öldü, nədən,
Ruh ucaldı göylərə,
torpaqda yatdı bədən.
Dirilər qara geydi,
ölülərsə ağ kəfən,
Gedəni ağa büküb,
ağladılar, getdilər.

Yerə, göyə sığmadı
işvələri, nazları,
Aşıq olan kəslərin
dil-dil ötdü sazları.
İgid-igid oğullar
gözəl-gözəl qızları
İylədilər, dərdilər,
qoxladılar, getdilər.

Dərman tapan oldumu
dərdinə, azarına?
Ümid varmı dünyanın
behinə, bazarına?
Saraylardan çəkildi
hər kəs öz məzarına,
Əbədi yuxu tapıb
yuxladılar, getdilər.

“Gəlimli-gedimli, son ucu ölümlü” dünyada gələn, ancaq getməyən, ölən, ancaq itməyən insanların hesabına yaşayır bu dünya.

Çiy gəlib, çiy gedənlər, key gəlib, key gedənlər heç nə yarada bilmədilər. Bu dünyanı dünyaya çiy gəlib, dünyadan bişmiş gedənlər yaşatdılar.

Mövlana həzrətləri buyurdu: “Xamdım, yandım, bişdim!”, Yunus həzrətləri buyurdu:

“Tapdığın tapısında, qul olduq qapısında,
Miskin Yunus, çiy idik, bişdik Əlhəmdulillah”.

Miskin Yunus bişmək üçün Tapdıq Əmrə dərgahında qırx il xidmət elədi, hörmət göstərdi. İstədiyinə çatanda Haqqa şükürlər oxudu.

Ömrün-günün odlu-alovlu, imtahanlı-sınaqlı, ölümlü-itimli yollarında çox az adamlar yanmaq və bişmək mərhələsinə qədər gəlib. Nəfsinə çəpər çəkənlər, daş səbrinə, qaya dözümünə sahib olanlar, Tanrı imtahanında qırx gün, qırx gecə ac-susuz qalıb yolunu çaşmayanlar Yunusa, Nəsimiyə, Mənsur Həllaca dönüb, tarixlər boyu bəşər oğluna əqidə, məslək dərsi keçir, insanlığa örnək olurlar.

El olanlar sel oldu, sel olanlar göl oldu, göl olanlar dəniz oldu. Damladan dəryaya, zərrədən külə çevrilənlər Tanrı üçün əziz oldu. Haqqa doğru gedənlərin nəfsi, qəlbi təmiz oldu. Ürəklərdə adı qalan, damaqlarda dadı qalan, könüllərdə odu qalan kimsələr millətindi, dövlətindi, həqiqətindi, məhəbbətindi. Sən də mənim millətimə, dövlətimə, sənətimə, həqiqətimə çevrildiyin üçün səni sevdim, əzizlədim, xətrini əziz, xatirəni uca tutdum.

Ozanlar ozanı, dünən sənin gəzdiyin Göyçə, Kəlbəcər, Dərələyəz, Ağbaba, Qarabağ, Abdal-Gülablı, Əskipara vardı. Bu gün Göyçə yoxdu, Kəlbəcər yoxdu, Dərələyəz yoxdu, Ağbaba yoxdu, Qarabağ yoxdu,

Əskipara yoxdu. Var olacaqmı, qayıdacaqmı, qaytarılacaqmı? Bilmirəm, bilmirəm, bilmirəm!

Təbriz həsrətdədi, Dərbənd qürbətdədi, Naxçıvana yollar bağlıdı, Borçalı yaralıdı, Kərkük ölümlə-qalımın arasındadı, Qarsı ermənilər qarışdırır, İstanbul başının hayına qalıb.

Dünən sənin gəzdiyin yerləri bu gün biz gəzə bilmirik, sən nə qədər xoşbəxt idin, biz nə qədər bədbəxt olduq, ustadlar ustadı?

Bəlkə sümüyünə dammışdı ki, o yerlər əlimizdən gedəcək, ona görə gördüyün nə varsa, hamısını qara sazın yaddaşına köçürmək istəyirdin? Səni el-el, mahal-mahal gəzdirən qüvvənin adı nəydi ki, biz özümüzdə o qüvvəni tapa bilmədik? Səninki gəzmək deyildi, torpağı sevmək, yurda bağlanmaq, millətə tapınmaq, sənətə vurulmaq, ululari, aliləri axtarmaq, ruha güvənmək, kökə qayıtmaq idi, Dədələr yadigarı.

Sən bacaranı biz bacarmadıq, sən biləni biz bilmədik, sən duyanı biz duymadıq, ey qoca Dədə!

Yuxularıma xoş gəldin, Aşıq Hüseyn Saraçlı!

Həyatıma xoş gəldin, ozanlar ozanı!

Qələmimə, dəftərimə, yaddaşıma, kitabıma, sazıma, sözümə xoş gəldin, ustad!

Dədələr sirdaşı, lələlər yoldaşı, igidlər qardaşı!

Sən həmişə dastanı tamamlayıb, məclisi bağlayanda "Müxəmməs" oxuyar, "Duvaqqapma" ilə söhbətini sona yetirərdin. İcazə ver, sənin şərəfinə bağladığım bu dastanı "Müxəmməs"lə yox, sənin ruhuna bağışladığım, bəstələdiyim bir şeir çələngi ilə tamama yetirim, ruhun şad olsun. Amin!!!

Məhlə aşığı deyil,
yurd-mahal aşığıydı,
Bal dilli millətimin
dili bal aşığıydı,

Meydanda Qoç Koroğlu,
Rüstəm-Zal aşığıydı, –
Aşıq Hüseyn Saraçlı.

Allah sözü-söhbəti
tökərdi bacasından,
Almışdı öz dərsini
xocalar xocasından,
Doluydu, müdrik idi
min ilin qocasından, –
Aşıq Hüseyn Saraçlı.

İncə bel, enli kürək,
eşmə bığ, meydan sinə,
Gözündə güllü yaylaq,
xəyalında dağ-binə,
Qartal kimi qonardı
dağların zirvəsinə, –
Aşıq Hüseyn Saraçlı.

Beldə gümüşü kəmər,
başda buxara papaq,
Göz sevgi sultanlığı,
sinə alışan ocaq,
Doğulmuşdu elə bil
min il bizlərdən qabaq, –
Aşıq Hüseyn Saraçlı.

Bir köhlən at varıydı –
ər oğlu ər minərdi,
Hər axşam sığal çəkib,
qalxıb səhər minərdi,
Bədöy atlar seçərdi,
qaşqa kəhər minərdi, –
Aşıq Hüseyn Saraçlı.

Ayaqları öpərdi
gümüşü üzəngini,
Qartal qanad salardı
oxuyanda "Cəngi"ni,
Qatardı söhbətinə
yerin, göyün rəngini, –
Aşıq Hüseyn Saraçlı.

Sazının laylasında
neçə aşıq böyütdü,
Neçə şairi xalqa
yar-yaraşıq böyütdü,
Bizdə bir sənət adlı
sönməz işıq böyütdü, –
Aşıq Hüseyn Saraçlı.

Təbriz, Dərbənd, Borçalı,
Göyçə, Naxçıvan oldu,
Ömrün yetmişində də
oğlantək cavan oldu,
Söz-söhbəti axarlı,
ləhcəsi rəvan oldu, –
Aşıq Hüseyn Saraçlı.

Seçərdi deyimlərin
yaxşısından, eyindən,
Sözü candan gələrdi,
səsi başdan, beyindən,
Od almışdı Tanrının
kamanından, neyindən, –
Aşıq Hüseyn Saraçlı.

Naləsiydi "Mansırı",
fəryadıydı "Bəhmanı",
Bir ozan geyimiydi
səliqəsi, sahmanı,
Ürəklərin dostuydu,
könüllərin mehmanı, –
Aşıq Hüseyn Saraçlı.

Dilinin şah damarı
Şenlik, Şair Nəbiydi,
Onun qoşa qanadı
elmiydi, ədəbiydi,
Çayların axarıydı,
çeşmələrin təbiydi, –
Aşıq Hüseyn Saraçlı.

“Atüstü” havasına
çəkəndə bayatını,
At üstündə görərdi
hər kəs öz həyatını,
Saz ilə tanıdardı
hər kəsə öz zatını, –
Aşıq Hüseyn Saraçlı.

Gözlərini açanda
qan gördü, qada gördü,
Dərdi dərin bir dəniz,
özünü ada gördü,
Bəxtini Tahir kimi
qanlı dəryada gördü, –
Aşıq Hüseyn Saraçlı.

Xalları seçilərdi
şirin xallar içində,
Başdadı daim yeri
əhli-hallar içində,
Gəzdi qəmli fikirlər,
xoş xəyallar içində, –
Aşıq Hüseyn Saraçlı.

Nəfsi halala qondu,
halaldan safa çatdı,
Səsi Ağrıya yetdi,
Ağrıdan Qafa çatdı,
Naxçıvana yetişdi,
Sərraf Qasıma çatdı,
Aşıq Hüseyn Saraçlı.

Çox yerdə qərar tutub,
bilən bilir kimdədi,
Sazdadı, mizrabdadı,
pərdədədi, simdədi,
Dörd ünsürün cəmində,
on iki iqlimdədi, –
Aşıq Hüseyn Saraçlı.

Onu sazdan yaratdı,
sözdən doğdu anası,
Ozan ömrü, saz ömrü
həyatının mənası,
O mənim Şəmsim oldu,
mən onun Mövlanası, –
Aşıq Hüseyn Saraçlı.

Can dedi, can eşitdi,
eşqi bir cahan oldu,
Məclisindən doymadıq,
sübh açıldı, dan oldu,
Bir dastan aşığıydı,
dillərdə dastan oldu, –
Aşıq Hüseyn Saraçlı.

Gözdədi, könüldədi,
nəfəsdədi, candadı,
Düşüncədə, fikirdə,
ilikdədi, qandadı,
Toxumla torpaq kimi
hər gün Zəlimxandadı, –
Aşıq Hüseyn Saraçlı.

***Bakı – Kislovodsk,***
***2006, sentyabr – noyabr***

*Zəlimxan Yaqub*

**HÜSEYN SARAÇLI DASTANI**

Nəşriyyatın direktoru: ***Əlövsət Osmanlı***
Nəşriyyatın baş redaktoru: ***Fikrət Süleymanoğlu***
Bədii redaktor: ***Vüqar Məmmədov***
Texniki redaktor: ***Təyyar Mehdili***
Rəssam: ***Qafar Sarıvəlli***
Korrektor: ***Aqşin Məsimov***

Çapa imzalanıb: 09.08.2007. Formatı: 84×108 1/32.
Ofset çapı. Fiziki ç.v. 16,0. Tirajı: 1000.

**"Pedaqogika"** nəşriyyatı.
AZ 1009. Bakı, S.Rəhimov küç., 108.